**1924-cü ildən çıxır**

# AZƏRBAYCAN MƏKTƏBİ

**TƏSİSÇİ**
**Azərbaycan Respublikası**
**Təhsil Nazirliyi**

**Sentyabr-Oktyabr**
**№ 5 (663)**
**2014**

**Elmi-nəzəri, pedaqoji jurnal**

---

**BU NÖMRƏDƏ**

---

LİSENZİYA № 022589

**Jurnal Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir.**

**Jurnal akademik Mehdi Mehdizadə mükafatı laureatı adına layiq görülmüşdür.**

**Redaksiyanın əlaqə telefonları: 496-74-20; 496-74-19**

**Redaksiyanın ünvanı:** Bakı ş., Afiyəddin Cəlilov küçəsi, 22 (Təhsil Problemləri İnstitutunun binası, 409, 410 və 411-ci otaqlar). İndeks AZ 1025 Kağız formatı 70x108 1/16 Sifariş:

---

Jurnal redaksiyanın kompyuter mərkəzində yığılıb səhifələnmiş, “Ərgünəş” FM-də (nəşriyyat-poliqrafiya müəssisəsində) çap olunmuşdur.

**В этом номере**



**In this number**

# Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturunun təkmilləşdirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli 13 nömrəli Sərəncamı ilə təsdiq edilmiş “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”na əsasən təhsilin nəticələrinə görə cavabdeh, şəffaf və səmərəli idarəetmə sisteminin formalaşdırılması, maliyyə və inzibati resurslarının vahid təhsil siyasətinə uyğun planlaşdırılması və təhsil idarəçiliyinin qarşıda duran vəzifələrə adekvat qurulması ölkənin təhsil sahəsinin qabaqcıl dünya standartları səviyyəsinədək təkmilləşdirilməsi prosesində başlıca vəzifələrdəndir.

Struktur islahatları nəticə etibarilə təhsilin keyfiyyət göstəricilərinin əsaslı yaxşılaşdırılmasına, sağlam təhsil mühitinin yaradılmasına, müəllim peşəkarlığının artırılmasına, təhsilalanların və təhsilverənlərin hüquq və qanuni mənafelərinin təmin edilməsi kimi məqsədlərin reallaşdırılmasına xidmət etməlidir.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturunu təkmilləşdirmək məqsədi ilə, Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq

**QƏRARA ALIRAM:**

1. Azərbaycan Respublikası Təhsil Nazirliyinin aşağıdakı regional idarələri yaradılsın:

1.1. Sumqayıt şəhər, Abşeron, Xızı və Qubadlı rayon təhsil şöbələrinin bazasında Sumqayıt Regional Təhsil İdarəsi;

1.2. Xaçmaz, Quba, Qusar, Şabran və Siyəzən rayon təhsil şöbələrinin bazasında Xaçmaz Regional Təhsil İdarəsi;

1.3. İsmayıllı, Şamaxı, Qobustan və Ağsu rayon təhsil şöbələrinin bazasında İsmayıllı Regional Təhsil İdarəsi;

1.4. Şəki şəhər, Oğuz və Qəbələ rayon təhsil şöbələrinin bazasında Oğuz Regional Təhsil İdarəsi;

1.5. Balakən, Zaqatala və Qax rayon təhsil şöbələrinin bazasında Balakən Regional Təhsil İdarəsi;

1.6. Ağstafa, Qazax və Tovuz rayon təhsil şöbələrinin bazasında Ağstafa Regional Təhsil İdarəsi;

1.7. Şəmkir, Gədəbəy və Daşkəsən rayon təhsil şöbələrinin bazasında Şəmkir Regional Təhsil İdarəsi;

1.8. Gəncə və Naftalan şəhər, Samux, Göygöl, Goranboy, Kəlbəcər və Xocalı rayon təhsil şöbələrinin bazasında Gəncə Regional Təhsil İdarəsi;

1.9. Yevlax və Mingəçevir şəhər, Ağdaş və Bərdə rayon təhsil şöbələrinin bazasında Yevlax Regional Təhsil İdarəsi;

1.10. Tərtər, Ağdam, Ağcabədi, Laçın, Füzuli və Xocavənd rayon təhsil şöbələrinin bazasında Tərtər Regional Təhsil İdarəsi;

1.11. Ucar, Zərdab, Kürdəmir və Göyçay rayon təhsil şöbələrinin bazasında Ucar Regional Təhsil İdarəsi;

1.12. Sabirabad, Saatlı, İmişli və Beyləqan rayon təhsil şöbələrinin bazasında Sabirabad Regional Təhsil İdarəsi;

1.13. Şirvan şəhər, Salyan, Hacıqabul, Neftçala, Biləsuvar və Cəbrayıl rayon təhsil şöbələrinin bazasında Salyan Regional Təhsil İdarəsi;

1.14. Masallı, Yardımlı və Cəlilabad rayon təhsil şöbələrinin bazasında Masallı Regional Təhsil İdarəsi;

1.15. Lənkəran şəhər, Astara və Lerik rayon təhsil şöbələrinin bazasında Astara Regional Təhsil İdarəsi.

2. "Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturu" təsdiq edilsin (əlavə olunur).

3. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

3.1. Azərbaycan Respublikası Prezidentinin aktlarının bu Sərəncama uyğunlaşdırılmasına dair təkliflərini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

3.2. Azərbaycan Respublikası Nazirlər Kabinetinin normativ hüquqi aktlarının bu Sərəncama uyğunlaşdırılmasını üç ay müddətində təmin edib Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

3.3. mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının bu Sərəncama uyğunlaşdırılmasını nəzarətdə saxlasın və bunun icrası barədə beş ay müddətində Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

3.4. Azərbaycan Respublikası Təhsil Nazirliyinin regional idarələrinin fəaliyyətinin təşkili ilə bağlı zəruri maliyyə və maddi-texniki təminat məsələlərini həll etsin;

3.5. bu Sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

4. Azərbaycan Respublikasının Ədliyyə Nazirliyi mərkəzi icra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının və normativ xarakterli aktların bu Sərəncama uyğunlaşdırılmasını təmin edib Azərbaycan Respublikasının Nazirlər Kabinetinə məlumat versin.

5. Azərbaycan Respublikasının Maliyyə Nazirliyi təhsil sahəsinin 2015-ci il yanvarın 1-dən mərkəzləşdirilmiş maliyyələşməyə keçməsini təmin etsin.

6. Bu Sərəncamın 1-ci hissəsi 2015-ci il yanvarın 1-dən qüvvəyə minir.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 24 iyul 2014-cü il*

# AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL NAZİRİ MİKAYIL CABBAROVUN MÜSAHİBƏSİ



## Müəllimlik bir missiyadır

**- Cənab nazir, artıq bir ildən çoxdur ki, təhsil naziri kimi fəaliyyət göstərirsiniz. Bu müddət ərzində hansı işləri görməyi bacardınız?**

- Etiraz etmirsinizsə, cavabı iki hissəyə bölməyi təklif edirəm. Birincisi, bu sahədə görülən və bütün Azərbaycanı əhatə edən tədbirlər geniş anlamda Təhsil Nazirliyi və burada çalışan komanda tərəfindən həyata keçirilmişdir.

Mən başlıca olaraq cənab Prezident tərəfindən 2013-cü ilin oktyabrında təsdiqlənmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"ndan danışmaq istərdim. Mövcud strategiya aşağıdakı istiqamətləri əhatə edir:1. Müəllim. 2. Məzmun. 3. İdarəetmə. 4. İnfrastruktur. 5. Resurslar - mövcudluğu və əlverişliliyi.

Strategiya - Azərbaycan qanunvericiliyində geniş məzmunlu bir sənəddir. Mənim fikrimcə, strategiyada ilk dəfə olaraq Azərbaycan Respublikasında təhsilin vəziyyəti çox ətraflı və dəqiq təsvir olunmuşdur. Təhsil, daha geniş desək, təhsil ictimaiyyəti qarşısında duran məsələlər strategiyada emosional kolorit olmadan, çox peşəkar şəkildə təqdim olunmuşdur. Strategiya əsasında fəaliyyət planı hazırlanaraq, artıq hökumətə

təqdim olunub. Hal-hazırda sənəd baxılma və təsdiqolunma mərhələsindədir. Əgər strategiya "nə etməliyik" sualına cavab axtarırsa, fəaliyyət planı "necə etməliyik" sualına cavabdır.

İkinci daha konkretdir- tələbələr, valideynlər, müəllimlər üçün son 15 ayda hansı tədbirlər görülüb? İlk olaraq, görülən iş məzunlara attestatın verilməsi ilə bağlı məsələnin həll olunmasıdır. Hələ üç il əvvəl 11-ci sinfi bitirən dörd nəfərdən biri attestat ala bilmirdi. Bu da onların təhsilin növbəti pillə və səviyyələrinə inteqrasiyasına, eləcə də işədüzəlmə prosesində çətinliklər yaradırdı. Belə ciddi problem haqqında heç də bütün vətəndaşların məlumatı yox idi.

**- Bildiyimə görə, Siz islahatları Bakı şəhərindən başladınız.**

- Bəli, ona görə ki, ölkə üzrə təhsilalanların, demək olar ki, üçdə biri paytaxtdadır. Rayon təhsil şöbələrindən fərqli olaraq, Bakı Şəhəri üzrə Təhsil İdarəsi birbaşa Təhsil Nazirliyinə tabe olduğundan biz daha çox səlahiyyətliyik. (Müsahibə 24 iyul 2014-cü il tarixli "Azərbaycan Respublikası Təhsil Nazirliyinin strukturunun təkmilləşdirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin Sərəncamının imzalanmasından əvvəl götürülüb).

Ötən müddətdə yeni tədris ilindən təyinat alacaq onlarla məktəb idarəedənləri hazırlanmışdır. Neqativ halların qarşısının alınması məqsədi ilə tədbirlər gücləndirilmişdir. Biz ümumi təhsil müəssisələrində "təmir pulu", "bayram pulu" anlayışları adı altında pul yığımlarının qarşısını aldıq və ya minimuma endirdik. Təsərrüfat ehtiyaclarının ödənilməsi üçün məktəblərə aylıq maliyyə vəsaiti ayırdıq. Onlarla məktəb təmir olundu. Biz müəllimin orta dərs yükünü qaldırdıq ki, bu da müəllimlərin gəlirlərinə, müəllim-şagird nisbətinə təsir etdi. Biz 1:8 müəllim-şagird nisbətindən 1:12 müəllim - şagird nisbətinə doğru gedirik. Bu hal hələ ki beynəlxalq standartdan aşağı olsa belə, eyni zamanda irəli atılmış böyük addımdır. Bununla yanaşı, biz müəllimlərin işə qəbulu ilə bağlı olan, onların bir bölgə məktəbindən digərinə keçirilməsi kimi məsələni həll etdik. Hal-hazırda bu sistem bütünlüklə elektron formada mərkəzləşdirilmişdir. 2014-cü ildə bütün müəllimlər üçün bir məktəbdən digərinə keçmək məqsədi ilə mərkəzləşdirilmiş elektron imkanı reallaşdırdıq. Bu, Azərbaycanın ümumi təhsil sistemində çalışan 150 min müəllimin hər birinin peşəkar inkişafı və iş şəraitində öz əksini tapan real nailiyyətdir.

**- Buna baxmayaraq, bir çoxları islahatların nəticələrinin o qədər hiss olunmadığından danışırlar.**

- Təhsil sistemi qərarın verilməsi və onun həyata keçirilməsi arasında müəyyən zamana ehtiyac olan bir sahədir. Axı bu gün gördüyümüz və kökü Sovet İttifaqının dağılması dövrünə gedib çıxan mənfi stereotiplər, həyat səviyyəsinin aşağı düşməsinə səbəb olan sosial-iqtisadi dəyişikliklərlə əlaqədardır. Bu da öz növbəsində dəyərləndirmə şkalasının dəyişməsində öz əksini tapmalı idi. Müəllim peşəsinin nüfuzu getdikcə aşağı düşdü. Bunun ardınca müəllim peşəsindən digər səmtlərə doğru axın başladı. Bu nəinki ölkədən kənara, eyni zamanda təhsil sistemindən başqa sistemlərə, qısamüddətli də olsa, hissolunan bir axın idi.

**- İyun ayında müəllimlərin ilk sınaq qiymətləndirilməsi keçirildi...**

-Bakı şəhərində müəllimlərin sınaq qiymətləndirilməsi müstəqil ölkə tarixində ilk dəfə keçirilən bir tədbir idi. Biz qəbul etməliyik ki, bu ana qədər müəllim ordusunun keyfiyyət göstəriciləri - ixtisas biliyi, metodika və onun tətbiqi, psixoloji durumunun hansı səviyyədə olması haqqında dəqiq təsəvvürümüz yox idi. Təkmilləşdirmə ilə bağlı müvafiq təlimlərin həyata keçirilməsi, dərs yükünün bölgüsü və s. ilə bağlı verdiyimiz qərarlar bəzi aspekt-

lər nəzərə alınmadan verilirdi. Daha doğrusu, müayinə etmədən bu və ya digər xəstəliyi müalicə etməyə çalışırdıq. Hal-hazırda isə biz müəllimlər haqda daha çox məlumatlıyıq.

**- KİV-də müəllimlərin sınaq qiymətləndirməsinə əsasən onlardan 14,4 faizinin aşağı, 67,4 faizinin qənaətbəxş və 18,2 faizinin isə yüksək nəticə göstərməsi barədə informasiya verildi. Bəs Sizin bu qiymətləndirmə ilə bağlı şəxsi təəssüratınız necədir? Bundan sonra hansı tədbirlər görüləcək?**

- Sınaq qiymətləndirməsinə qədər müəllimlər haqda bildiklərimiz yalnız anket məlumatları idi. Onların nə zaman anadan olduqlarını, hansı ali təhsil müəssisəsini bitirdiklərini və nə qədər stajlarının olması barədə məlumatları bilirdik. Eyni zamanda biz müəllimlərin harada işləməsi, nə qədər dərs yükünün ayrılması, təkmilləşdirilmə təlimlərinə göndərilib-göndərilməməsi və hansı keyfiyyətlərin təkmilləşdirilməsi ilə bağlı qərar qəbul etməli idik. Sonra nə olacaq? Bundan sonra pedaqoqların peşəkar inkişafı ilə əlaqədar onlarda bütün keyfiyyətlərin təkmilləşməsinə xidmət edəcək lazımi qərarlar veriləcək.

**- "Qeyri-qənaətbəxş nəticələr" nə deməkdir?**

- Bu, o deməkdir ki, bu müəllimlər məktəbdə işləmək üçün uyğun deyillər. Heç də çətin olmayan bir qiymətləndirmədə onlar 40 maksimum baldan 50 faizini belə toplaya bilməyiblər. Bəs onlar diaqnostik qiymətləndirmənin nəticələrinə əsasən işdən azad olunacaqlar? Xeyr. Biz bu haqda əvvəl də bildirmişdik. Bəs müəllimlərin peşəkarlığının təkmilləşdirilməsi üçün imkan yaradılması məqsədi ilə sınaq qiymətləndirməsinin nəticələri nəzərə alınacaq? Sözsüz, bu belə olacaq.

**- Test üç bölmədən ibarət idi: ixtisas biliyi, müasir təlim metodikası ilə bağlı biliklər və müəllimin psixoloji durumu. Psixoloji durum hansı vəziyyətdədir?**

- Mən deyərdim ki, müxtəlif. Biz yenə də nəyəsə əsaslanmalı idik. Valideynlərin hər hansı bir müəllimin bu peşəyə uyğun olmaması ilə bağlı şikayət etməsi halları çox idi. Əgər bacarırsansa, get aydınlaşdır! İndi isə bizdə ayrı-ayrı vəziyyətlərdə həqiqəti üzə çıxarmağa imkan verməsə də, hər hansı bir müəllimin sinfə daxil olmasına psixoloji durumunun imkan verib-verməməsi haqqında ilkin ümumi fikir yaradan obyektiv ölçü mexanizmimiz var. Bu amil qərar qəbuletmədə çox vacibdir və təhsilalanların psixoloji durumuna və təhsilin keyfiyyətinə birbaşa olaraq təsir edir.

**- Siz elektron işə qəbul barədə qeyd etdiniz. Bu necə həyata keçirilir?**

- Yetərincə sadə şəkildə. Siz nə vaxtsa viza almaq üçün elektron formada anket doldurmusunuz?

- Bəli.

- Eyni forma tətbiq edilir. Təhsil Nazirliyinin saytında ölkə üzrə 3000 vakant yer barədə məlumat yerləşdirilir. Minimum tələblərə cavab verən, yəni müəllim işləməyə imkan verən diploma sahib olan və müəllim işləmək istəyən hər bir şəxs anket doldurur. İmtahanlar ayrı-ayrı fənlər üzrə eyni gündə keçirilir. Cari ildə imtahanlar Azərbaycan Dövlət İqtisad Universitetinin iki korpusunda eyni zamanda keçirildi. İmtahan elektron formadadır. Test imtahanı üç bölmədən ibarətdir: ixtisas biliyini, məntiqi düşüncə qabiliyyətini və metodika üzrə bilikləri yoxlayan test sualları. Nəticələr imtahan bitən kimi məlum olur. Namizəd nə qədər bal toplaması və nə qədər toplamalı olduğu barədə məlumat alır. Biz əvvəlcədən maksimum 35 baldan şəhər məktəblərində işləmək üçün keçid balının 28, kənd məktəblərində işləmək üçün isə keçid balının 21 olmasını bildiririk. İkinci turda - müsahibədə namizədlərin kommunikativ bacarıqları qiymətləndirilir. Lazımi bal toplamış namizədlər şəffaflığın qorunması məqsədi ilə Təhsil

Nazirliyindən, dövlət orqanlarından və məktəblərdən olan üzvlərdən təşkil olunmuş komissiyalar ilə müsahibədə iştirak edirlər.

**- Çox adam təhsil sistemində işləməyə çalışır?**

- Keçən il 3000 vakant yer üçün 18000 iddiaçı müraciət etmişdi. İmtahan nəticələrinə əsasən biz 1281 nəfəri işə qəbul etdik. Qeyd edək ki, biz keçid balını aşağı salmadıq və tələblərimizi sadələşdirmədik. Öz ixtisasını heç "dörd" səviyyəsində bilməyəni işə qəbul etməyin nə mənası var?!

**- İşə qəbulda mərkəzləşdirilmiş sistem korrupsiyanın qarşısını aldı. Amma hər halda bizim şübhələnmədiyimiz problemlər də var?**

- Məsələn, saxta diplomlar faktı. Ola bilər ki, bu problem bilavasitə təhsil sisteminə aid deyil, amma bizim göstəricilərimizə təsir edən indikator rolunu oynayır. Bu sistem pedaqoji təhsili olmayan şəxslərin məktəbə işə düzəlməsinə, şagirdlərimizə "dərs keçməsinə" şərait yaradırdı. Buradan ritorik bir sual meydana çıxır: öz peşəkar fəaliyyətini cinayət ilə - saxta diplomla başlayanlar təhsilalanlara, gənclərimizə nə öyrədə bilərlər?!

**- Nə qədər saxta diplom satılmışdır?**

- Dəqiq rəqəm deyə bilməyəcəm, təxminən bir neçə min. Hal-hazırda bu məsələ ilə bağlı istintaq davam edir və ola bilsin ki, hüquq-mühafizə orqanları dəqiq rəqəmi müəyyənləşdirdilər. Amma bilirik ki, əsasən respublikanın rayonlarında 2000 belə saxta diplomlu şəxs ümumi təhsil sistemində çalışır. Biz həmin adamları adbaad tanıyırıq. Əldə olan bütün məlumatları, o cümlədən saxta diplom satan şəxslər barədə məlumatı da Baş Prokurorluğa təqdim etmişik. Bu şəxslər arasında təhsilin idarəetməsində olanlar da var idi. Səhv etmirəmsə, bu barədə Baş Prokurorluq artıq ictimaiyyəti məlumatlandırmışdır. Hansı səbəbdən bu bizim üçün vacibdir? Biz hələ də belə "müəllimlərin" qəbulunun qarşısını kəsə bilməmişiksə, nədən danışa bilərik? Çirklənmə mənbəyini aradan qaldırmasaq, suyu necə təmizləmək olar ki? Bu gün müəllimlərin işə qəbulu üçün mərkəzləşmiş sistemin, diplomları yoxlayan bazanın, çoxpilləli və şəffaf seçimin olması bu sistemdə olan dəyişikliklərin dönməz olacağına təminat verir.

**- Müəyyən olunan "saxta müəllimlər" işlərinə davam edəcəklər?**

- Yaxşı terminə görə təşəkkür edirəm! Bəli, onlar hələ də işlərinə davam edirlər. Birincisi, qanunu pozmuş olsalar da, 2000 "saxta müəllim"in işdən qovulması eyni sayda işçinin birdən işdən azad edilməsidir. İkincisi, 2000 müəllimin təhsil prosesindən çıxarılmasıdır ki, bu vəziyyətdə onları dərhal əvəz etmək mümkün deyil. Mürəkkəb bir dilemma qarşısındayıq: belə müəllimlə işləyək, yoxsa, yox? Onların çoxu kənd məktəblərində çalışır. Nəhayət, onların arasında yalanın qurbanı olan, tələbə olduqlarına ürəkdən inanaraq dərslərdə, imtahan sessiyalarında iştirak edən, adlarına xüsusi olaraq jurnal açılan, qeydlər olan şəxslər də var. Bununla yanaşı, onların bəziləri vakant yerlər üçün imtahanlarda iştirak edərək öz peşəkarlıqlarını göstərmişlər. Və ancaq sənədlərin yoxlanması nəticəsində məlum olmuşdur ki, bu diplomlar Təhsil Nazirliyi tərəfindən verilməmişdir... Dərhal olmasa da, təhsil sistemini belə hallardan təmizləmə prosesi olacaq. Demək olar ki, artıq bu proses başlamışdır.

**- Biz hələ də orta məktəbdən danışırıq.**

- Bəli, mən təhsilalanların böyük hissəsini əhatə etdiyi üçün daha çox ümumi təhsil sistemindən danışdım. Lakin digər sahələrdə, məsələn, ilk peşə-ixtisas təhsili səviyyəsində müəyyən dəyişikliklər mövcuddur. Azərbaycanın insan resurslarının perspektivli gələcəyinə inanıram. Lakin hal-hazırda biz daha çox digər ölkələrdən olan mütəxəssislərin xidmətindən istifadə

edirik. Bu niyə baş verir? Əvvəla, ona görə ki, bazarın tələblərinə uyğun olan ixtisaslara qəbul planı yox idi. Daha doğrusu, biz sovet sisteminə sadiq qalaraq, son 25 ildə iqtisadiyyatda olan dəyişiklikləri, yeni sahələrin yaradılmasını və digərlərinin aktuallığını itirməsi faktını özümüzdən uzaqlaşdırmışdıq. İlk dəfə olaraq, 2014-cü ildə Təhsil Nazirliyi ilk peşə-ixtisas təhsili müəssisələri üçün bazarın tələblərinə uyğun qəbul planı hazırladı.

İkinci səbəb: tədrisin keyfiyyəti. Bu halda peşəkar standartın nə olması anlamı meydana çıxır. Məsələn, avtomobil mexaniki ixtisası üzrə təhsil alan çoxdan istehsalatdan çıxmış avtomobilləri təmir etməyi bacarmalı idi. Müasir avtomobillər haqqında heç bir məlumat isə yoxdur. Proqramlar ciddi şəkildə köhnəlmişdi. O səbəbdən biz, qeyd edim ki, heç vaxt görülməmiş böyük bir tədbir həyata keçirdik. Bu istiqamətdə Əmək və Əhalinin Sosial Müdafiəsi Nazirliyi ilə sıx əməkdaşlıq çərçivəsində 200 yeni standart hazırlanmışdır. Hələ də 2000 standarta ehtiyac vardır. Eyni zamanda, başa düşürük ki, işəgötürənlərin fikrini öyrənmədən yeni standartların hazırlanması düzgün deyil. Buna görə də bütün dövlət idarələrinə və özəl şirkətlərə sorğular göndərmişik... Hal-hazırda təkcə ilk peşə-ixtisas təhsilində deyil, bütün sahələr üzrə peşəkar standartlara yenidən baxılır.

Qaranlıq qalan bir məsələni də qeyd edim.15 ay ərzində belə demək mümkünsə, "zəbt olunmuşlar"ı geri qaytarmaq üçün böyük işlər görüldü. Onlarla təhsil müəssisəsinin ərazisi zəbt olunmuşdu. Hal-hazırda həmin obyekt və ərazilər yenidən təhsil müəssisələrinin tabeliyinə qaytarılmışdır. Eləcə də külli miqdarda oğurlanmış tədris vəsaitləri yerinə bərpa edilmişdir. Belə desək, 10 kompyüter olmalı olduğu halda, yerində heç biri yox idi. Bu gün isə hər şey öz yerinə qaytarılmışdır.

İnternat müəssisələrinin, idman məktəblərinin, kollec və ilk peşə-ixtisas təhsili müəssisələrinin direktorlarının işdən azad olunması aysberqin yalnız görünən tərəfi idi. Lakin mən daha çox təhsil sistemində: idarəedənlər, müəllimlər və təhsilalanlar arasında əhvali-ruhiyyəni dəyişə bildiyimiz üçün fəxr edirəm. Bəli, insanlar istəyir ki, hər şey burada, indi və tezliklə baş versin. Biz də bunu etmək istəyirik. Harada mümkün deyilsə, biz səbəblərini aydınlaşdırmağa çalışırıq.

Bu gün biz işə yalnız müasir peşəkar standartlara cavab verən müəllimləri qəbul edirik. Bəs qəbuldan sonra tez bir zamanda nəticəni görə bilərik?! Əlbəttə ki, xeyr. Müəllim əvvəlcə sinfə daxil olmalıdır, şərti olaraq onun şagirdi məzun olmalıdır...

**- Müəllimlərin aşağı əməkhaqqı alması da cəmiyyətdə müzakirələrə səbəb olur. Məktəbdəki pul yığımları, korrupsiya halları və təhsilin keyfiyyətinin aşağı olması da onunla əlaqələndirilir. Müəllimlərin əməkhaqlarının artırılması, onların sosial vəziyyətlərinin yaxşılaşdırılması müzakirə obyektidirmi?**

- Bu məsələnin bir neçə aspekti var. Birincisi, müəllimlərin hal-hazırkı əməkhaqqı aşağıdırmı? Əgər nəzərə alsaq ki, ölkədə orta aylıq əməkhaqqı 400 manatdan artıqdır, o zaman müəllimin orta aylıq əməkhaqqısı onun orta dərs yükü baxımından, çox aşağıdır. İkincisi, müəllim nə qədər işləyir? Bu tez-tez müzakirədən kənarda qalan sualdır. Başqa ixtisas sahibləri və xarici ölkə müəllimləri ilə müqayisədə Azərbaycanda müəllimlərin orta dərs yükü çox aşağıdır. Bizdə müəllimin orta dərs yükü həftədə 18 saata bərabərdir. Amma nə siz, nə də mən həftədə 18 saat işləmirik. Hətta elə müəllimlər var ki, onların dərs yükü 6 və ya 4 saatdır. Biz çıxış yolunu nədə görürük, hansı tədbirlər həyata keçiririk? Dərs yükünün optimallaşdırılması yolu ilə biz minimal tələblərə cavab verməyən müəllimləri sistemdən kənarlaşdırırıq. Razılaşın ki, kobud desək, öz ixtisasını belə bilməyən müəllimin

əməkhaqqını artırmaq məntiqsizdir. Bu zaman müəllimlərin bilik və bacarıqlarını qiymətləndirmək üçün sertifikatlaşdırma imtahanlarının keçirilməsi ilə bağlı sual meydana çıxır. Nəzəri olaraq, dövlətin müəllimlər üçün şəffaf imtahan keçirməsi çox asan olardı: "Sabah gəl imtahana, əgər keçə bilsən, əməkhaqqın artacaq, keçə bilməsən, əvvəlki əməkhaqqın qalacaq". Bu tədbiri bir neçə ölkədə həyata keçiriblər. Eləcə də bizi həmişə müqayisə etməyə sevdikləri Gürcüstanda. Mən əvvəlcə hazırlaşmağa imkan vermədən müəllimləri yeni proqram üzrə qiymətləndirməyi o qədər də ədalətli saymıram. Biz əvvəlcə onları təkmilləşdirmə kurslarına dəvət edəcəyik. Təlimlərin sonunda isə sertifikatlaşdırma imtahanları keçirəcəyik. Sertifikat almış müəllimlərin əməkhaqları, əlbəttə ki, artacaqdır. Başqa bir məsələ. Təhsil sahəsində əməkhaqqı artırılmasa, düşünürəm ki, bu sahəyə gənc, istedadlı kadrların axınını təmin edə bilməyəcəyik. Halhazırda təhsil sistemində çalışan yaxşı kadrları da burada saxlamaq mümkün olmayacaq. Biz çoxlu istedadlı müəllimlərin məktəbə gəlməsində və davamlı olaraq işləməsində maraqlıyıq. Lakin səbəb-nəticə əlaqəsi baxımından illüziyaya qapılmaq lazım deyil: müəllimlərin əməkhaqlarının artırılması akademik göstəricilərin yaxşılaşmasında sıçrayış yaratmayacaq. Ümumiyyətlə, təhsil sistemində irəliləyiş sıçrayışla deyil, tədricən, yavaş-yavaş olur. Bakı şəhəri üzrə müəllimlərin vəziyyətini tədqiq etdikdən sonra bu günün reallıqlarına uyğun olaraq, müəllimin əməkhaqqının nə qədər artırılması və nə qədər vəsaitə ehtiyac olması ilə bağlı hesablama apararaq nəticələri Maliyyə Nazirliyinə təqdim etmişik.

**- Belə çıxır ki, bir tərəfdən dərs yükü yenidən paylanacaq, digər tərəfdən isə müəllimlərin əməkhaqları artırılacaq?**

- Doğrudur. Bu iki faktorun kombinasiyası olacaq: Dərs yükünün optimallaşdırılması və saathesabı əməkhaqqının artırılması yolu ilə. Sadəcə, bu gün məktəbdə iş saatla deyil, dərs yükü ilə hesablanır. Dərs yükü - həftədə 12 saatdır.

**- Akademik saatlar - dərslər nəzərdə tutulur?**

- Bəli.

**- Mənə həmişə maraqlı olub: Əgər mən dərs zamanı şagirdlərdən nəsə soruşuramsa, deməli, mən işləyirəm. Əgər mən müəllimlər otağında əyləşib yoxlama yazı işlərini yoxlayıramsa, deməli, işləmirəm?**

- Əla sualdır! İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı ölkələrinin böyük bir qismində müəllimin iş saatları dərs və dərsdənkənar hissələrə ayrılır. Dərsdənkənar saatlara dəftərlərin yoxlanılması, valideynlərlə görüş və s. daxildir. Bizim qanunvericilikdə bu nəzərdə tutulmur. Belə hesab edək ki, akademik saat tam saat deyil. Hər saatdan qalan 15 dəqiqə toplananda 12 saatdan 3 saat edir ki, bu da dərsdənkənar işlərə sərf oluna bilər. Amma istənilən halda heç bir ölkədə 12 saatdan ibarət belə az dərs yükü yoxdur..

Onu da deyim ki, hər kəs müəllimin səviyyəsi ilə təhsilin səviyyəsi arasında əlaqə axtarır. Müəllimin səviyyəsindən o qədər çox asılı olmayan sosial mühitlə təhsil səviyyəsi arasında səbəb-nəticə əlaqəsi mövcuddur.

Gəlin sosial-iqtisadi vəziyyəti ölkə üzrə orta göstəricidən fərqli bir yaşayış məntəqəsinin məktəbinə ən yaxşı müəllimləri göndərək. Bu o anlama gəlirmi ki, iki ildən sonra bu məktəbdə akademik göstəricilər dəyişiləcək? Beynəlxalq təcrübə göstərir ki, xeyr. Təcrübə göstərir ki, akademik göstəricilərin artmasına daha çox sosial mühit təsir edir. Çünki hər şey dəyərləndirmə şkalasından, şagirdin ailəsinin, qohumlarının, onun əhatəsinin təhsilə olan münasibətindən başlayır. Sosial kontekstin dəstəyi olmadan güclü müəllim faktoru kifayət etmir. Bu səbəbdən də bizim işimiz təkcə təhsil sisteminin optimallaşdırılmasından deyil, müəyyən mənada dəyərlər sisteminin yaxşılaşdırılmasından ibarətdir.

**- Əlbəttə ki, şagirdin valideynləri və özü anlamalıdır ki, təhsil almaq vacibdir. Reallıqda bu necədir?**

- Hər il də aparacağımızı planlaşdırdığımız bir sosial sorğu keçirmişik. Biz soruşuruq: "Sizin fikrinizcə, həyatda uğur əldə etmək təhsil ilə bağlıdır?" Rəqəmləri indi deməyəcəyəm, amma cavablar bizi çox narahat etdi.

Başqa bir statistika. ABŞ-da valideynlərin 87 faizi məktəbəqədər yaşlı övladına kitab oxuyur. 37 faizi isə bunu gündəlik edir. Bizim statistikamıza baxın: 34 faiz ailələrdə uşaqlar üçün kitab yoxdur!

Avropa İttifaqı ölkələrində uşaqların 90 faizdən çoxu məktəbəqədər təhsil müəssisələrinə cəlb edilib. Amma bizdə sadəcə 16,5 faiz təşkil edir. Bu baxımdan, Azərbaycanın birinci xanımı Mehriban Əliyevanın məktəbəqədər təhsilin kütləvi olaraq genişləndirilməsi istiqamətində gördüyü tədbirləri böyük əhəmiyyətə malik addım hesab edirəm.

**- Daha çox uşaq bağçaları?**

- Bəli, kommunikativ və sosial vərdişlər uşaqlara ilkin olaraq orada öyrədilir. Bizim uşaq məktəbə gedərkən o, məsələn, hollandiyalı uşaqdan geri qalır. Məktəbə uşaq bağçasından gedən hollandiyalı uşağın inkişaf və cəmiyyətlə bağlı məlumatı olur. Bizim məktəblinin 2-3 ayı onun məktəbə, kollektivə öyrəşməyə, intizama sərf olunur. Bizim üçün kiçik görünən faktlar sonradan akademik göstəricilərdə öz əksini tapır.

Təcrübədə məktəbəqədər və ibtidai sinif müəllimlərinin əsasən aşağı balla universitetlərə qəbul olması məlumdur. Baxmayaraq ki, bir valideyn kimi deyərdim ki, məktəbəqədər uşağın təlimi yüksək peşəkarlıq tələb edən çətin bir prosesdir. Təhsil sistemində olan bütün problemlərlə yanaşı, valideynlərin və ictimaiyyətin uşaqların təhsildə uğur qazanmaları üçün məsuliyyət daşımasını kənara qoymaq heç də düzgün deyil. Vətəndaşlar təhsil sisteminin effektiv işləməsini tələb etmək hüququna malikdirlər və tələb də etməlidirlər. Eyni zamanda biz də öz məsuliyyətimizi qəbul etməliyik.

**- Bu ilin yazında müəllimlərin etik davranış qaydaları qəbul edildi. Bu nəyə görə lazım idi?**

- Müəllim mənə təkcə, məsələn, riyaziyyatı öyrədən bir şəxs deyil. Müəllimlik mənə görə bir missiyadır. O, bizim uşaqlarımıza həyatı tanış edən bir insandır. Müəllimlər üçün etik davranış qaydalarının olması deyil, olmaması suallar yaratmalı idi. Bu məsələyə idealizm, romantizm adı verilsə də, müəllimin cəmiyyətdəki rolunu yadına salmaqda yanlış bir məqam yoxdur.

**- Bəli, bu doğrudan maraqlı məsələdir. Lakin belə məsələlər daha çoxdur...**

- Biz "fast-food" konsepsiyasının üstünlük təşkil etdiyi, hamının "burada və indi" şüarı ilə yaşadığı yüksək templi informasiya əsrində yaşayırıq. Bir məsələni vurğulayaraq onun nəticəsini gözləyirlər. Amma bizim islahat proqramımız birtərəfli deyil. Bu sadəcə, müəllimin etik davranış qaydalarını yaratmaq, dərs ilinin müddətini uzatmaq, 12 illik dərs sisteminə keçmək, müəllimlərin dərs yükünü və əməkhaqlarını artırmaq, "gəlin bu fənn üzrə dərslik yaxşı olsun" demək deyil. Bütün xəstəliklərin çarəsi olan eliksir kimi bir qərar verməyə çalışmaq səhv addımdır. Problem tək ola bilər, amma onun həlli üçün 10 müxtəlif sferada 10 addım atmaq lazımdır.

Gəlin təhsilin keyfiyyəti məsələsini götürək. Son illərdə Azərbaycanda 2700 məktəb binası tikilib və əsaslı təmir olunub. Bunu etmədən XXI əsrin standartlarına cavab verən təhsil prosesini yoluna qoymaq mümkün deyil. Bəs bu təhsilin keyfiyyətinin artmasına kifayət edirmi? Xeyr, təmir olunmuş məktəbə gedən müəllim elə həmin müəllimdir. Deməli, eyni zamanda müəllimin də səviyyəsini qaldırmaq lazımdır. Bəs təkmilləşdirmə kursunu

bitirmiş və yüksək əməkhaqqı alan müəllim vəsaitlərlə yaxşı təchiz olunmuş sinifdə yeni dərsliklər olmadan keyfiyyətli dərs keçə bilərmi? Əlbəttə ki, xeyr.

**- Gəlin, tədris sisteminin vaxtının uzadılması mövzusuna toxunaq.**

- Baxın, məni məntiqi əlaqəsizlik təəccübləndirir. Bir tərəfdən insanlara maraqlıdır ki, 12 illik ümumi təhsil sistemi nəyə lazımdır, o biri tərəfdən isə məktəbi bitirdikdən sonra öz təhsillərini ali təhsil müəssisələrində, kolleclərdə, ilk peşə-ixtisas təhsili məktəblərində davam etdirməyə çalışırlar. Çox hallarda öz zəhmətləri ilə qazandıqları pul hesabına...

**- Mən şəxsən əleyhinə deyiləm, bu beynəlxalq təcrübəyə əsaslanır.**

- Bəli. Biz qlobal iqtisadiyyat sistemində yaşayırıq. Şirkətlər kimi ölkələr də rəqabət aparır. Ölkələr insan resursları sahəsində rəqabət aparırlar. 11 illik təhsil sistemində oxumuş gənc azərbaycanlı universitetə qədər 14 il təhsil almış gənc hollandiyalı ilə necə rəqabət aparacaq?! Digər tərəfdən, bizim tədris ili də Hollandiya ilə müqayisədə qısadır.

**- Dərs ili də uzadılacaq?**

- Bizdə dərs ilinin müddəti 32 həftədir. Bu çox az müddətdir. İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatı ölkələrində orta standart 38 həftədir, bəzi digər ölkələrdə isə 41 həftədir. Aydın məsələdir ki, dərs ilini qısaltmaqla deyil, uzatmaqla uşağa lazımi materialı öyrətmək daha asan olar. Dərs ilinin 34 həftə olması gündəlik dərslərin sayında və məktəbli çantasının çəkisində də özünü göstərəcək. Eyni zamanda istənilən müəllim təsdiq edə bilər ki, 3 ay yarım davam edən tətildən qayıdan uşağın iki-üç həftəsi onun may ayında qazandığı biliyi bərpa etməyə sərf olunur.

Təmayülləşmə haqqında da danışmaq lazımdır. Dünya getdikcə daha da mürəkkəbləşir, daha çox məlumat toplanır. Məsələn, məzun Azərbaycanın və ya Böyük Britaniyanın istənilən ali məktəbində humanitar ixtisas üzrə qəbul olur. Əgər o, son 3 ilini texniki və humanitar fənlərin öyrənilməsinə sərf edibsə, bu zaman onun qəbulolma şansı bu illər ərzində yalnız humanitar elmlər üzrə təmayülləşən şəxslə müqayisədə azdır. Beləliklə, 12 illik ümumi təhsil sisteminə keçid təmayülləşməyə geniş imkan yaradacaq. Mən bir daha qeyd edirəm ki, təhsil sistemində sıçrayışlar baş vermir...

**- Akademik göstəricilərlə olan vəziyyət necədir? Çoxları səviyyənin aşağı düşməsindən şikayətlənir.**

- Problemlərlə tanış olan və rəqəmləri bilən bir insan olmasaydım, mən də belə şübhə ilə yanaşardım. Son 3 il ərzində ana dili və riyaziyyat üzrə keçirilmiş və Təhsil Nazirliyinin təsiretmə imkanı olmayan buraxılış imtahanının nəticələrini əks etdirən cədvələ baxın. Markerlə işarələnmiş hissələr

| | 2012-ci il | | 2013-cü il | | 2014-cü il | |
|---|---|---|---|---|---|---|
| | 9-cu siniflər üzrə | 11-ci siniflər üzrə | 9-cu siniflər üzrə | 11-ci siniflər üzrə | 9-cu siniflər üzrə | 11-ci siniflər üzrə |
| İmtahanda iştirak edənlərin sayı | 117,363 | 78,539 | 117,275 | 86,632 | 111,868 | 83,093 |
| **Hər iki fənn üzrə müvəffəq qiymət alanların sayı (faizi)** | **59,000 (50.27%)** | **54,114 (68.90%)** | **68,497 (58.41%)** | **62,494 (72.14%)** | **69,400 (62.04%)** | **61,579 (74.11%)** |
| Ana dili fənni üzrə müvəffəq qiymət alanların sayı (faizi) | 84,217 (71.76%) | 64,891 (82.62%) | 79,583 (67.96%) | 69,230 (80.10%) | 84,007 (75.22%) | 69,016 (83.33%) |
| Riyaziyyat fənni üzrəmüvəffəq qiymət alanların sayı (faizi) | 68,461 (58.33%) | 58,350 (74.29%) | 81,970 (69.90%) | 69,315 (80.01%) | 78,324 (70.01%) | 66,681 (81.25%) |

müvəffəq qiymət alanların sayını əks etdirir. Aydın görünür ki, keyfiyyət getdikcə artır...

Təəssüf ki, təhsili ictimai müzakirələrin mövsuzuna çeviriblər və hər kəsin bir resepti var...

**- Əlbəttə ki, hamının siyasətdən, futboldan və uşaqların tərbiyəsindən başı çıxır.**

- Lakin bir çox hallarda faktlara əsaslanmayanların səsi daha çox eşidilir. Mən isə fakt və rəqəmlər əsasında danışmağa üstünlük verirəm. Bəli, bizim problemlərimiz yetərincədir, biz onları cəmiyyətdən gizlətməyə deyil, həll etməyə çalışırıq. Sözün həqiqi mənasında bu problemləri qabardırıq. Bu islahatların əsas şərtlərindəndir. Çünki məsələni düzgün müəyyənləşdirməsək, onu həll edə bilmərik. Biz tez-tez təhsilin bizdə pis olması və heç yerdə belə vəziyyət olmaması kimi ittihamlarla qarşılaşırıq. Şagirdləri orta məktəbi bitirə bilməyən ölkələrin siyahısına baxın:




İƏİT - İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının saytından götürülmüş bu məlumatlara biz təsir edə bilmirik.

Tez-tez problemlərdən danışmağı sevənlər iki fənn üzrə əla qiymət alanların sayının qeyri-kafi qiymət alanlardan çox olmasını qeyd etmirlər. Bu obyektiv statistikadır. Yaxşı xəbər o qədər maraqlı olmadığından, bu barədə heç kim yazmağa tələsmir. Baxın, artıq qəbul imtahanları bitib. Əvvəl ötən illərdə tələbə ola bilməyən abituriyentlər üçün qəbul imtahanları keçirildi. Və dərhal KİV-də əvvəlki illərin məzunlarının pis nəticə göstərmələri barədə "xəbər" verildi. Mən sual verirəm: onlar məgər yüksək nəticə göstərməli idilər? Əgər yüksək nəticə göstərə bilsəydilər, onlar çoxdan tələbə adını qazanmış olardılar. Məncə, onların ikinci və ya üçüncü dəfədən olsa belə, qəbul ola bilməsinə təəccüblənmək lazım idi. Axı illər ötdükcə məktəb proqramı üzrə baza biliyimiz zəifləyir. Demək istəyirəm ki, cəmiyyətdən kənarda problemləri həll etmək mümkün deyil. Deyə bilmərik ki: "Bizə vaxt verin, 5 ildən sonra biz sizə yaxşı nəticə göstərəcəyik".

**- Tənqid sizə kömək edir?**

- Problemin həllinə yönəlmiş sağlam tənqid, sözsüz ki, kömək edir. Faktlara, təhlillərə əsaslanan tənqid dəyərli bir işdir. Qərəzli tənqid isə başqa bir məsələdir. Amma bunu da anlamaq olar. Gizlətmədiyimiz və həll etməyə çalışdığımız problemlərlə yanaşı, demək istəyirəm ki, təhsilalanlarımız beynəlxalq müsabiqələrdə qalib gəlirlər, Yel, Berkli və Oksford kimi ali təhsil ocaqlarına qəbul olunurlar.

**- Proqram məsələsinə gəldikdə isə mənə görə, birinci sinfə gələn uşağa eyni zamanda 3 dil, məsələn, Azərbaycan, rus və ingilis dillərini öyrətmək çox çətin məsələdir. O vaxt biz oxuyanda Azərbaycan dilini (təhsil rus dilində olan məktəblərdə) ikinci sinifdən, ingilis dilini isə dördüncü sinifdən keçməyə başlayırdıq. Amma indi hamısı eyni zamanda olur. Bu nə qədər məqsədəuyğundur?**

- Çox yaxşı sualdır. Burada söhbət təhsilin standartlarından gedir. Biz dilemma qarşısındayıq: bir tərəfdən, biz hər şeyi bilən, bilməli olan fövqəlinsan yetişdirmək istəyirik. Lakin burada təhsil sisteminin vəziyyəti və sosial-iqtisadi şərait qətiyyən nəzərə alınmır. Standart minimum, yoxsa

maksimum biliyi ifadə edir? Mən sizinlə getdikcə təcrübədə özünü təsdiq edən intuitiv nəticəmi bölüşəcəyəm. Və hələ heç kim bunu təkzib edə bilməyib. Son 20 ildə standartın minimal deyil, ideal bilik səviyyəsi sayılması böyük səhv olmuşdur. Sözsüz ki, iki və ya beş dil öyrətmək mümkün olan uşaqlar var, lakin digərləri üçün bu elə də asan deyildir.

Biz də bu barədə düşünmüşük. Bilirsiz, nədən başladıq? O suala cavab axtarmağa başladıq ki, nəyə görə bəzi məktəblərə uşaqlar həvəslə, digər məktəblərə isə güclə gedirlər? İş orasındadır ki, harada bilik maraqlı və anlaşıqlı öyrədilir, orada uşaqlar həvəsli olurlar. Digər halda isə uşaq nəsə başa düşməyən kimi özünə qapanır...

Təlim materiallarının qavranılmasının əlçatan olması və müəllimin peşəkar hazırlığının artırılması ilə yanaşı, tətbiq etdiyimiz yerdən asılı olaraq biz məktəb proqramını da nəzərdən keçirməliyik. Mənə görə, kənd məktəbləri üçün fənlərin seçimi şəhər məktəbləri üçün fənlərin seçimindən fərqlənməlidir. Çünki məktəb bizə müstəqil yaşamaq üçün bacarıqlar aşılayır. Və insanın seçdiyi sahədən asılı olaraq bu bacarıqlar fərqlənməlidir. Əgər insan zehni əməklə məşğul olmaq istəyirsə, onun üçün bir, kənd təsərrüfatı ilə məşğul olmaq istəyirsə, başqa bacarığı olmalıdır. Məzmundan asılı olmadan orta bilik səviyyəli insan yetişdirməyə çalışmaq düzgün deyil.

Proqrama gəldikdə isə, o cümlədən 3 xarici dil ilə bağlı burada dəyişikliklərin aparılacağı mexanizminə baxmaq lazımdır. Birdən-birə proqramdan bir fənni kənarlaşdırmaq da asan məsələ deyil. Nəzərə almaq lazımdır ki, kimsə üç dil öyrənmək istəyir... Mənə görə, bir insanın bir dili əla bilməsi, üç dili yarımçıq bilməsindən yaxşıdır. Kurikulum misalında biz görürük ki, yeni metodikanın və yanaşmaların tətbiqi heç də problemsiz ötüşmür.

**- Gəlin, keçmiş və müasir sistemləri müqayisə edək... Mənə görə, müasir sistem, hətta hamının öyrəşdiyi testlər belə yenilikdir.**

- İstəməzdim indi deyəcəyim yalnız Azərbaycan reallığı üçün qəbul edilsin, amma test üsulu ilə biliklərin yoxlanılması birtərəfli təsir göstərmir. Keçən il biz xaricdə təhsil üzrə Dövlət Proqramı, bu il isə SABAH qrupları üçün seçdiyimiz tələbələr test üsulu ilə imtahanlarda yüksək bal toplayaraq "Beynəlxalq münasibətlər", "Hüquq" kimi ixtisaslara qəbul olublar. Amma nə olsun?! Onların bir çoxu Kissinceri fransız, Lenini isə Rusiyanın prezidenti kimi tanıyır və belə hesab edirlər ki, vəkil müttəhimin maraqlarını müdafiə etmək naminə yalan danışmalıdır... Belə nümunələri çox gətirə bilərəm...

Ümumi dünyagörüşü ilə bağlı problemlər var. Bu, o deməkdir ki, qiymətləndirmə vasitəsi kimi test üsulundan əl çəkməliyik? Xeyr. Çünki bu üsul bizə bərabər şərtlərdə bilikləri ölçməyə imkan verir. Bəs bu vasitə yeganə ölçmə üsulu olmalıdır? Mənə görə, belə olmalı deyil. Test üsulu, sadəcə, ən yüksək nisbi çəkiyə malik qiymətləndirmə vasitələrindən biri olmalıdır.

Beynəlxalq təcrübə bu barədə nə deyir?! Dünyada heç bir ən yaxşı ali təhsil müəssisəsi fikir formalaşdırma və esse yaza bilmək qabiliyyətinizi yoxlamadan, müsahibə aparmadan, təkcə IELTS və GMAT kimi standart imtahanlar əsasında sizi istədiyiniz ixtisasa qəbul etməyəcək. Bəs, bu, o demək deyil ki, qəbul imtahanlarında mərkəzləşmiş sistemin ləğvini təklif edirəm? Xeyr, hesab edirəm ki, mənfi hallarla mübarizədə bu sistem böyük rol oynamışdır. Hesab edirəmmi ki, bu sistemə yuxarıda qeyd etdiklərim də əlavə olunmalıdır?! Sözsüz. Ali təhsil müəssisələrinin tələbələrini seçmək imkanı olmasa, onların beynəlxalq standartlara cavab verəcəklərindən danışa bilmərik.

Bəs ali təhsil müəssisələri bu sistemə hazırdırlarmı? Baxmayaraq ki, bəziləri buna hamıdan çox hazırdır, amma ümumilikdə,

xeyr! Mən bunu ona görə deyirəm ki, təhsil sistemində verilən istənilən qərara dəyişən sosial-iqtisadi şərtlərə uyğun şəkildə mütəmadi olaraq yenidən baxılmalıdır. Hər uşağın şəxsi bacarıqlarını nəzərə almaq və ömür boyu bilik əldə etmək vərdişləri formalaşdırmaq müasir təhsilə yanaşmanın əsas prinsipləridir.

**- Təhsil sistemində ənənəvi metodika və prinsiplərdən yeni sistemə keçid prosesi mümkün oldumu? Mən yeni kurikulumu, onunla əlaqədar başqa tədbirləri nəzərdə tuturam.**

- Bizim istədiyimiz səviyyədə olmadı. Səbəblər çoxdur: müəllimlər lazımi səviyyədə hazırlanmadı, yeni müəllimlərin hazırlığında və dərsliklərin məzmununda müvafiq dəyişikliklər edilmədi və s. Bəs, buna görə prinsiplər günahkar sayılmalıdır?! Əsla belə deyil. Prinsiplərdə heç bir problem yoxdur. Müasir təhsil sistemi artıq "informasiyanı öyrəndin, soruşdular, qiymətləndirdilər" üsulundan çoxdan uzaqlaşmışdır. İnformasiya əldə etmək üçün "Google", "Wikipedia" var. Bu, o deməkdir ki, uşaqlarda "yadda saxlamaq" bacarığı inkişaf etdirilməsin? Sözsüz, bu belə deyil.

**- Proqramın dəyişilməsi üçün tədbirlər görülürmü?**

- Bəli, biz artıq bu istiqamətdə çalışırıq.

**- Yeni proqrama təkamül yolu ilə keçid uzun çəkəcək?**

- Qarşıdan gələn dərs ilində biz artıq müəyyən məsələlərlə bağlı fikirimizi bildirəcəyik. Növbəti ildən isə yeniliklərin tətbiqinə başlayacağıq.

**- Və dərsliklərlə bağlı... dərsliklərin yenilənmə prosesi nə qədər vaxt aparacaq?**

- İcazə verin, dərsliklərin hazırlanma texnologiyasından danışım. Keçən ilin aprelində nazir vəzifəsini icra etməyə başlayanda aydınlaşdırdım ki, 15 sentyabrda 6-cı sinfə gedəcək şagirdlər üçün heç bir dərslik yoxdur. Onlar nəinki çap olunmayıb, heç yazılmayıb da. Kitablar yoxdur!!!

**- Sözünüzü kəsdiyim üçün bağışlayın... Bəs onlardan əvvəlki 6-cı siniflər nəyin əsasında dərs keçdilər?**

- Əgər yadınızdadırsa, 7 il əvvəl yeni kurikuluma keçid başladı. Onu 1-ci sinifdən tətbiq etməyə başladılar. Bu zaman yuxarı siniflərə hələ də köhnə sistemlə təlim keçilirdi. Kurikulum - təhsilə yeni yanaşma, yeni forma, məsələlərin yenidən qoyulması, təhsilin yeni məzmunudur. Köhnə dərsliklərlə şagirdlərə yeni məzmunu öyrətmək mümkün deyil!

**- Deməli, 6 il ərzində mərhələ-mərhələ dərsliklərin yenilənməsi baş verib?**

- Bəli, Təhsil Nazirliyi hər il yalnız bir sinif üçün dərslik hazırlayırdı. Birinci il 1-ci, ikinci il 2-ci sinif üçün və s. Yeni kitablar kurikulum əsaslı idilər. Dərslik - məzmun və metodikanın vəhdətidir. Yeni məzmunda və metodikada kitab hazırlamaq üçün onları bilmək lazımdır. Yeni sistem tətbiq edəndə sənin lazımi sayda yeni məzmunlu dərsliyi yazmağı bacaran mütəxəssisin olmayacaq. Ən böyük səhv odur ki, 7 il bundan qabaq birdən-birə yeni kurikulumu tətbiq etdilər. Adətən, ilk olaraq kurikulumu pilot kimi xüsusi hazırlanmış müəllimlərin olduğu məhdud sayda məktəblərdə tətbiq edirlər. Bu bir il ərzində müəllimlərin fikirləri nəzərə alınır. Nəticələr təhlil olunduqdan, proqramda düzəlişlər edildikdən sonra yeni kurikulum bütün ölkə ərazisində tətbiq olunur. Eyni vaxtda 1-ci, 5-ci və 8-ci sinifdə. Bu yolla yeni kurikuluma keçid 4 ilə baş verir. Bizdə isə bu proses uzadılıb. Pilot dövrünün olmaması isə çox ciddi səhvdir. İkinci səhv odur ki, yeni dərslikləri yazmaq əvvəlki, yeni məzmun və metodikanı bilməyən müəlliflərə tapşırıldı: "Bu da yeni standartlar, gedin yeni dərslik yazın". Onlar bacardıqları kimi də yazıblar. Və bu uzun müddət belə davam edib.

Hər il yayda qanunvericiliyə uyğun olaraq tender keçirilib. Tenderin nə qədər obyektiv keçirilməsi başqa mövzunun söhbətidir. Tenderdə hər arzu edən iştirak edə

bilirdi. Təsəvvür edin, bizdə hər birinə dərslik lazım olan 27 fənn var. Beləliklə, bir fənn üçün bir neçə, digər fənn üçün 1-2 dərslik təklif olunurdu, bəzi fənlər üçün isə heç bir dərslik təklif olunmurdu. Daha doğrusu, proqramda həmin fənn var, sadəcə, heç kim dərslik yazmaq istəmir. Aydın məsələdir ki, tenderdə kitablar arasında yüksək bal toplayan dərslik nəşr olunurdu. Sual olunur, bir fənn üzrə keyfiyyəti bizi qane etməyən iki və ya daha artıq dərslik təklif olunanda nə etməliyik?!

**- Yəqin ki, aşağı keyfiyyətlilər arasından nisbətən yaxşısı seçilirdi...**

- İkinci sual: bəlkə, fənn üzrə heç bir dərslik təklifi yoxdur? Belə olan halda tenderdə başqa dərslik üzrə qalib gələn şəxsə: "Uşaqlar məktəbə gedəcək, amma fransız dili üzrə kitabları yoxdur. Gəl, o kitabı yaz" deyilirdi. Prosesi təsəvvür edin: yayda tender keçirilir, ekspertlər ən yaxşını seçir və nəhayət, dərslik çap olunaraq sentyabrda məktəbə gəlir. Deməli, müəllim və şagird kitabı ancaq yeni dərs ilinin birinci günü görə bilir!

Bu il hansı inqilabi dəyişikliklər edə bildik? Biz 7-ci, 8-ci siniflər üçün dərslikləri bir ildə hazırlamışıq. 8-ci siniflər üçün dərslikləri pilot kimi az tirajla nəşr etdirdik. Bunları müəllimlərə paylayaraq, onların bu kitablar barədə fikirlərini öyrənəcəyik. Biz bu kitabları saytda yerləşdirərək, valideynlərə göstərəcəyik: "Sizin qeyd və şərhləriniz üçün bir iliniz var". Bundan sonra müvafiq dəyişikliklər edərək, monitorinq üçün TQDK-ya göndərəcəyik.

**- Dərsliklərin müəllifləri kimlərdir?**

- Hal-hazırkı qanunvericiliyə əsasən müəllifləri mən təyin etmirəm. Heç kimi dərslik yazmağa da məcbur edə bilmirəm. SSRİ-nin Təhsil Nazirliyindən fərqli olaraq, Azərbaycan Respublikasının Təhsil Nazirliyi özü kitab hazırlamır. Mən hətta Təhsil Nazirliyində işləyənləri DQMK (Azərbaycan Respublikası Prezidenti yanında Dövlət Qulluğu Məsələləri üzrə Komissiya) vasitəsilə işə qəbul edirəm. Çünki Təhsil Nazirliyində fizika, kimya, rəsmxət üzrə mütəxəssislər deyil, dövlət qulluqçuları - məmurlar çalışır. Bu, tamam başqa peşədir. Bizdə dərslik hazırlanması könüllüdür. Bəli, mən ali təhsil müəssisələrini bu işə cəlb etməyə çalışıram, rektorları tənqid edirəm ki, "Sizdə yaxşı baza varsa, niyə ali təhsil müəssisəsi dərslik hazırlamaqda bizə yardım etmir?". Amma fakt budur ki, biz heç kimi dərslik yazmağa məcbur edə bilmərik. Düzgün seçimin aparılmasını təmin etmək, təklif olunmuşların arasından ən yaxşısının seçilməsinə nail olmaq bu il edə bildiyimiz işdir. Ekspert qrupu öz seçimini etdikdən sonra biz üç qrupda: TQDK-ya, ali təhsil müəssisələrinin nümayəndələrinə və ən yaxşı məktəb müəllimlərinə yolladıq. Müxtəlif mütəxəssislərdən müstəqil şəkildə qiymətləri aldıqdan sonra mənzərə aydın oldu: bütün qruplardan yüksək bal almış dərsliklər şübhə yaratmır, müxtəliflik olduğu halda xüsusi işçi qrupu ekspertlərin nə qədər düzgün qiymətləndirmə apardıqlarını aydınlaşdırdı. Bu yolla dərsliklərin seçimi çox diqqətlə aparılmışdır. Heç bir halda demək olmaz ki, Təhsil Nazirliyi dərsliklərin üzərində işləmir. Təklif olunanlar arasından ən yaxşı dərsliyi seçdikdən sonra biz yenə öz metodiki məsləhətlərimizi veririk, dərsliyin daha da təkmilləşməsi üçün qısa müddətdə əlimizdən gələni edirik. Hər halda, sentyabrın 15-nə çatdırmaq lazımdır...

Dediyim kimi, pilot kimi 8-ci siniflər üçün dərslikləri artıq hazırlamışıq.

**- Bu sistemi dəyişdirməyi planlaşdırmısınız?**

- Bəli, dərsliklərin hazırlanması ilə bağlı dəyişikliklər edilməsi üçün hökumətə müraciət etmişik. Gənc ölkə üçün yeni dərslik hazırlamaq heç də hər zaman asan məsələ deyil. Əlbəttə, mən tez bir zamanda

dəyişikliyi görmək istərdim, amma bu mümkün deyil. Bu illər ərzində müsbət təcrübə toplanıb, hansısa mərkəzlər yaradılıb, müəlliflər yetişib. Bir dərsliyi dördüncü dəfə yazan müəllif həmin dərsliyi birinci dəfədən fərqli olaraq daha yaxşı yazır... Biz bütün bunları dağıtmaq istəmirik. Əldə olanların ən yaxşılarını saxlamaq və gücləndirmək lazımdır.

**- Necə gücləndirmək?**

- Biz "ehtiyat dərsliyin" hazırlanması üçün xüsusi mərkəz yaradırıq. "Ehtiyat dərslik" nə deməkdir? Bu dərslik dövlətin sifarişi ilə mütəxəssislər qrupu tərəfindən və əgər tenderdə müvafiq fənn üzrə heç bir dərslik kriteriyalara cavab verməsə, tətbiq olunacaq. Bu mexanizmdən bir sıra ölkələrdə istifadə olunur.

**- Yəni, bundan yaxşısını edə bilirsinizsə, buyurun.**

- Bəli. Eyni zamanda, istənilən halda, minimal standart da tərəfimizdən təmin olunacaqdır.

**- Müəlliflərlə niyə bu qədər problem var? İnana bilmirəm ki, bizdə fənlər üzrə savadlı peşəkar müəlliflər yoxdur.**

- Çünki müəlliflər üçün həvəsləndirmə sistemi yaradılmamışdı. Müəllif üçün kitab yazmaq maraqlı deyildi. Ağır işin müqabilində, demək olar ki, qəpik-quruş alırdılar. Mən hələ reputasiya məsələsini demirəm: az miqdarda pulun müqabilində tənqid olunma riski. Ona görə də biz bu sistemi dəyişdik. İndi müəllif dərsliyin istifadə olunduğu dövr ərzində rəğbətləndiriləcək, dərslik hər dəfə çap olunduqda qonorar alacaq.

Əvvəllər dərsliklər, bilirsiniz, necə qiymətləndirilirdi? Məzmununa görə deyil, bütövlükdə. Tenderdə nəşriyyatlar iştirak edirdi. Hər dərslik komplektinin konkret qiyməti var idi. Mən ayrıca olaraq məzmunu, bədii tərtibatı və çapın keyfiyyətini seçə bilməzdim. Hamısını bir yerdə qəbul etməli idim. Fil, üstündə bülbül. Biz indi müstəqil olaraq, məzmuna görə seçim aparır, daha sonra kimin və necə çap edəcəyini seçirik. Mənə bir müəlliflər qrupu göstərin ki, 15 aya, lap qoy olsun 3 ilə, on bir sinif üçün 15-20 fənn üzrə bütün dərslikləri yeniləyə bilsin.

**- Ümumilikdə nə qədər dərsliyə ehtiyac vardır?**

- Azərbaycan və rus bölməsini nəzərə almaqla, 200 dərslik. Əlbəttə, yeni dərsliklərdə də problem ola bilər. Amma mümkün səhvləri dərsliyin sınaq dövründə aşkar eləmək şansı, dərs ilinin başlamasına iki həftə qalmış aşkar eləmək şansından daha çoxdur. Bu günə qədər bu belə idi. Bir sözlə, iş çətin də olsa, davam edir. Bütün çətinliklərə baxmayaraq, yaxın zamanlarda müsbət nəticəni görəcəyimizə inanıram. Biz insanlara deyə bilmərik ki, gələn aydan ölkədə bütün dərsliklər yenidən hazırlanacaq. Müxtəlif yanaşmalar vardır. Bir yanaşma dərsliklərin Oksford və Kembricdə hazırlanmış dərsliklərə uyğunlaşdırılmasıdır. Bu istiqamətin müsbət, eyni zamanda mənfi tərəfləri var. Müsbət tərəfi odur ki, bu kitablar ən yaxşı müəlliflər tərəfindən sınanılmış metodika əsasında hazırlanıb. Amma bizdə milli dəyərlərimizə söykənən və şəxsiyyətin formalaşmasına təsir edən fənlərimiz var ki, bu da məsələnin mənfi tərəfini səciyyələndirir. Biz azərbaycanlı uşaqlara Oksford dərslikləri əsasında tarixi, ədəbiyyatı və hətta coğrafiyanı tədris edə bilmərik.

**- Azərbaycanda inklüziv təhsilin perspektivləri necədir?**

- Bu, çox vacib məsələdir. İnklüziv təhsil Təhsil Nazirliyinin fəaliyyətində prioritet məsələlərdən biridir. İnklüziv təhsillə bağlı bir neçə məsələ mövcuddur: müəllimlərin hazırlığı, maddi-texniki bazanın yaradılması və təkmilləşdirilməsi. Bizim strategiyamıza əsasən mərhələ-mərhələ bu məsələlərin həllinə çalışacağıq. İlk olaraq, pilot mək-

təblər seçiləcək. Belə şagirdləri sosial həyata inteqrasiya etmək məqsədi ilə lazımi maddi-texniki baza ilə təmin olunmuş pilot siniflərdən başlayacağıq.

Pilot siniflərdən danışarkən əsas məqsədi uşaqların sağlamlığının müdafiəsinə yönəlmiş "Sağlam təhsil" layihəsinin adını çəkməyə bilmərəm. Çünki bir neçə müasir tendensiyalar bizi narahat edir: yüklənmiş dərs proqramları, məktəbli çantasının ağırlığı, uşaqların uzun müddət parta arxasında hərəkətsiz əyləşməsi və s. Sentyabrın 15-dən başlayaraq Bakı şəhərinin 6 məktəbində ibtidai siniflərin şagirdləri "Sağlam təhsil" layihəsi üzrə təhsil alacaqlar.

**- Söhbət Vladimir Bazarnıyın metodikasından gedir?**

- O, məsləhətçilərdən biridir. Biz bu layihədə təkcə Vladimir Bazarnıyın deyil, ABŞ, Kanada və Avropa ölkələrinin təcrübəsindən də istifadə edirik. Uşaqların sağlam təhsil alması layihənin əsas məqsədidir. Sağlamlığın müdafiəsi və təhsilin keyfiyyəti birlikdə olmalıdır.

**- Siz müəllimlik missiyasından danışdınız. Təəssüf, amma qəbul etməliyik ki, son illərdə bu peşənin nüfuzu ciddi şəkildə aşağı düşüb. Qürurlu "müəllim" adını necə qaytarmaq olar? Nə etmək lazımdır? Biz nə etməliyik?**

- Gəlin, sualı iki hissəyə ayıraq: cəmiyyət nə edə bilər? Və Təhsil Nazirliyi nə etməlidir? Cəmiyyət çoxlu mütaliə etməli, uşaqlara oxumağı öyrətməlidir. Təhsilə, tərbiyəyə, böyüklərə və müəllimlərə hörmətə xüsusi yer verilən milli dəyərlərimizi qorumalıyıq. "Müəllim" adını çəkərkən həmişə fikirləşməliyik. Bəs, Təhsil Nazirliyi nə etməlidir? Biz gənclərdə bu peşəyə maraq yaratmağa çalışırıq. Bu istiqamətdə dövlət başçısının xeyir-duası ilə və şəxsi nəzarəti altında pedaqoji universitetin kampusunun layihəsi hazırlanır. Orada gələcək müəllimlərin dünyagörüşünün formalaşdırılması və keyfiyyətli təhsil almaları üçün mühit yaradılacaq. Paralel olaraq, bu ildən müəllimlik ixtisasları üzrə qəbul imtahanlarında yüksək nəticə göstərən tələbələrin həvəsləndirmə proqramına başlamışıq. Qarşıdan gələn dərs ilindən qəbul imtahanlarında yüksək nəticə göstərən 300 tələbəyə, əlavə olaraq, 100 manat xüsusi təqaüd veriləcək. Biz hesab edirik ki, bu tədbir gənc müəllimlər üçün əlavə stimul rolunu oynayacaq.

Biz müəllimlərin karyera inkişafı üçün də real addımlar atmışıq. Yaxın vaxtlarda biz bunu elan edəcəyik. Azərbaycan Respublikası Baş nazirinin göstərişi ilə bölgələrdə - kənd məktəblərində işləyən müəllimlərin iş şəratinin yaxşılaşdırılması üçün təkliflər paketi hazırlayırıq...

...Bilirsiniz, məni nə narahat edir? Hər şeyin maddi dəyərlərlə ölçüldüyü bir zamandayıq. Yəni hər kəs pulun axdığı kranı açmaq istəyir. Məni düz anlayın, demirəm ki, bu vacib deyil. Amma maddiyyat bütün dəyərləri əvəz edə bilməz axı. Uşaqlar, hər halda, bilavasitə pul qazanmaqla bağlı olmayan kosmonavt, səyyah, memar və ya digər ixtisaslara yiyələnməyi də arzulamalıdırlar. Baxın, bunu reallaşdıra bilməsək, şüurda dönüş edə bilməyəcəyik... Aydındır, kapitalizmdir... Amma cəmiyyət təkcə maddi tələbatdan irəli gələn qərarların verildiyi mühitdə yaşamamalıdır. Mənəvi dəyərlər də mövcud olmalıdır. Bəli, bu qeyri-populyar səslənir. Amma bu sahədə çalışmaq lazımdır. Bu məsələ ilə bağlı fikirlərim var, amma bu barədə növbəti müsahibədə danışaram.

**Vyaçeslav Sapunov**
**blogger**
**“Azərbaycan müəllimi ” qəzeti,**
**15, 22 avqust 2014-cü il**

*Təhsilin inkişafı üzrə Dövlət Strategiyası*

# TƏHSİLİMİZ YENİ MƏRHƏLƏDƏ

**Qulu Novruzov**
***Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru***

Azərbaycan təhsili özünün yeni mərhələsinə qədəm qoymuşdur. Ölkədə həyata keçirilən əsaslı dəyişikliklər nəticəsində indi təhsilimiz tamamilə yeni məna kəsb edir.

Ötən əsrin sonuncu illərindən başlayan təhsil islahatları indi ölkəmizdə uğurla davam etməkdədir. Ulu öndər Heydər Əliyevin fikirləri ilə demiş olsaq, "indi bizdə təhsil sistemində islahatların məqsədi ondan ibarətdir ki, Azərbaycan təhsil sistemi dünya təhsil sisteminin standartlarına uyğunlaşsın". Bu uyğunlaşma mahiyyət etibarı ilə Azərbaycan təhsilinin dünya təhsil sisteminə inteqrasiya olunması deməkdir.

İndi pedaqoji ictimaiyyət arasında dünya təhsil sistemi üçün çox geniş, qlobal xarakter daşıyan məsələlər ətrafında müzakirələrin aparılması ənənəyə çevrilmişdir. Azərbaycanda aparılan təhsil siyasətinin mahiyyəti və məzmunu, başlıca mündəricəsi barədə fikirlərə aydınlıq gətirilir, bu baxımdan müəllimlərin fəaliyyəti düzgün istiqamətləndirilir. Ölkədə islahatın gedişi, qazanılmış nailiyyətlər, eləcə də çətinliklər barədə müzakirələrdə dövlət səviyyəsində formalaşmış fikirlərə istinad olunur, normativ-hüquqi bazalardan istifadə edilərək müvafiq mülahizələr söylənilir.

2012-ci il dekabrın 29-da qəbul olunmuş "Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyası gələcəyə doğru istiqamətlənmiş mühüm sənəd kimi ölkənin bütün sahələrindəki perspektivləri əhatə edir. Orada müasir təhsil sisteminin formalaşması strateji vəzifə kimi müəyyənləşdirilir və təhsilin ən əhəmiyyətli hesab edilən konturları vurğulanır. Xüsusən ümumi təhsilin "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktəbi"nə keçməsi, onun infrastrukturunun, idarə olunan sisteminin yeniləşdirilməsi məqsədi ilə tədbirlərin həyata keçiriləcəyi qeyd olunur.

2013-cü il oktyabrın 24-də təsdiq olunmuş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (bundan sonra Dövlət Strategiyası) özündən əvvəl konseptual sənəd kimi qəbul olunmuş İnkişaf Konsepsiyasını yeni istiqamətlərdə daha da konkretləşdirmişdir. Orada aydın şəkildə qeyd olunmuşdur ki, "Azərbaycan Respublikasının İnkişaf Konsepsiyasına uyğun olaraq şəxsə hərtərəfli bilik və bacarıqların verilməsi məqsədi ilə təhsil sisteminin institusional əsasları, infrastrukturu və insan resursları inkişaf etdirilməlidir".

Təhsil cəmiyyətin inkişafını təmin edən həlledici sahədir. İnsanlar təhsil mərhələsindən keçməklə formalaşır. Onlar özünün rifah halını, maddi durumunu təhsildə qazandığı bacarıqlarla yaxşılaşdırırlar. Eyni zamanda yüksək mənəvi keyfiyyətlərə malik bir insan kimi məhz təhsildə formalaşırlar. Başqa sözlə, özünə məxsus idraki, hissi-emosional dəyərlərini təhsil vasitəsilə əldə edirlər. Dövlət Strategiyasında qeyd olunduğu kimi, "Son 30-40 il ərzindəki elmi-texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktik bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan, təhsilin məzmununun

formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Səriştə əldə olunmuş bilik və bacarıqları praktik fəaliyyətdə effektiv və səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətinin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha effektli xidmət göstərir". Odur ki, müasir təhsilin məzmununun, eləcə də təşkilinin səriştə əsaslı qurulması cəmiyyətimizin hazırkı tələbləri baxımından əhəmiyyətli hesab edilir.

Ümumi təhsilin inkişafında yüksəkkeyfiyyətli kadr potensialının formalaşdırılması, yeni iqtisadi mexanizmlərə keçilməsi, səmərə və keyfiyyət baxımından infrastruktur dəyişikliklərinin aparılması gələcək strateji yanaşmaların gündəmində dayanır.

Son vaxtlar ölkə miqyasında həyata keçirilən islahatyönümlü tədbirlər geniş miqyas almaqdadır. Sinif mühitindən başlayaraq valideyn-məktəb münasibətlərinə qədər genişlənməkdə olan bu tədbirlərin mahiyyətində təhsil mühitinin, təhsil sisteminin dəyişdirilməsi, sağlamlaşdırılması dayanır ki, bu da öz növbəsində bütün təhsil pillələri kimi ümumi təhsilin də birmənalı şəkildə yeniləşdirilməsini tələb edir. Azərbaycan Respublikası Təhsil Nazirliyində "2013-2014-cü tədris ilinin nəticələri" müzakirə olunarkən ümumi təhsil sahəsində həyata keçiriləcək islahatların əsas prioritetlərində bu məsələyə diqqət yetirilmiş, sağlam və səmərəli təhsil mühitinin yaradılması, təhsilin keyfiyyətinin yüksəldilməsi, məktəblərin idarə olunmasının müasir tələblər səviyyəsinə çatdırılması kimi istiqamətlər xüsusi olaraq qeyd edilmişdir.

Artıq bir ildən çoxdur ki, Azərbaycan təhsil sistemində xeyli islahatyönümlü tədbirlər həyata keçirilir. Onlardan biri ümumtəhsil məktəbini bitirən bütün şagirdlərə attestatın verilməsidir. Azərbaycan hökumətinin qərarı ilə həyata keçirilən bu tədbir demokratik xarakter daşıyır. Eyni zamanda şagird şəxsiyyətinə, onun formalaşmasına humanist mövqe nümayiş etdirilir.

Yaxud ölkədə pedaqoji kadrların seçilib yerləşdirilməsi sahəsində görülən işlər demokratik xarakteri və keyfiyyətin yüksəldilməsi baxımından əhəmiyyətliliyinə görə mütərəqqi və müasir tələblərə uyğun hesab edilir.

Məlum olduğu kimi, pedaqoji kadr hazırlığı, xüsusən müəllimlərin və təhsil menecerlərinin seçilib yerləşdirilməsi, onların peşəkarlığının yüksəldilməsi istiqamətində də innovativ tədbirlər həyata keçirilir. Artıq ümumi təhsil müəssisələri və peşə liseyləri müəllimlərinin seçilib yerləşdirilməsi məqsədi ilə müsabiqələr başa çatdırılmış və bilikli, səriştəli müəllim kadrlarının müəyyən olunması üçün potensial imkanlar aşkara çıxarılmışdır. Bu tələblər əsasında keçirilən müsabiqənin nəticəsi kimi 2014-2015-ci dərs ilində məktəblərimizdə dərs demək arzusunda olan 13544 nəfər müəllimdən 1837-si müsabiqənin üçüncü mərhələsinə buraxılmış, 1304 nəfər vakant vəzifələri tutmaq hüququ qazanmışdır.

İlk dəfə olaraq Bakı şəhəri üzrə müəllimlərin sınaq qiymətləndirilməsi keçirilmişdir. 357 məktəbdən olan 28825 müəllim bu qiymətləndirmədə iştirak etmişdir ki, onlardan 85,6%-i qənaətbəxş, 18,2%-i yüksək nəticə göstərmişdir. 14,4%-nin nəticəsi isə zəif olmuşdur. İlkin nəticələr onu göstərir ki, bu sınaq qiymətləndirmə texnologiyası müəllimlərin peşəkarlığının yüksəldilməsi, onların məsuliyyətliliyinin artırılması baxımından əhəmiyyətlidir. Belə bir təcrübənin sistemli olaraq ölkə miqyasında keçirilməsi müəllimlərin səriştəliliyinin inkişaf etdirilməsi vasitəsi kimi daha da genişləndirilməlidir.

Görülmüş tədbirlər içərisində "Müəllimlərin etik davranış qaydaları"nın təsdiq olunması da xüsusi yer tutur. Azərbaycan təhsili tarixində ilk dəfə hazırlanaraq qəbul edilmiş

bu qaydalar özündə etik davranış prinsiplərini, müəllim şəxsiyyətinə və onun müxtəlif situasiyalarda münasibətlərinə aid tələbləri, müəllimin andını və sair məsələləri əhatə edir.

Pilot layihəsi çərçivəsində məktəb direktorları və gələcəkdə bu arzuda olan pedaqoji kadrlar üçün Bakı şəhərində 5 aylıq hazırlıq kurslarının təşkil olunması da keyfiyyətli müəllim kadrlarının hazırlanması sahəsində atılmış ilk innovativ addımlardandır. Mərhələlərlə həyata keçirilən bu kurslarda 547 nəfər iştirak etmiş, onlardan 164 nəfər növbəti mərhələyə keçmişdir. Onlardan 42 nəfəri bu təlimləri müvəffəqiyyətlə başa vuraraq "uğur sertifikatı" almışdır. Yaxud Azərbaycan təhsil şəbəkəsinə qoşulmuş təhsil müəssisələrinin sayı 1765-ə (39%) çatmışdır və s. Bütün bunlar Azərbaycanda təhsil sahəsində dəyişikliklərin sürətli və daha geniş xarakter almasını göstərir.

Azərbaycanda təhsil islahatlarının həyata keçirilməsi istiqamətində görülmüş tədbirlərin sayını çoxaltmaq olar. Lakin ən başlıcası ondan ibarətdir ki, təhsil ölkə rəhbərliyinin diqqət mərkəzində dayanan ən önəmli sahədir. Ona daim qayğı göstərilir. 2013-cü il oktyabrın 24-də Dövlət Strategiyasının islahatın növbəti mərhələsi kimi qəbul olunması da həmin qayğının nəticəsidir. 5 istiqamətdə quruculuq fəaliyyəti tələb edən bu sənəd özünün mahiyyəti və məzmununa görə ölkəmizin tarixində ən proqressiv sənədlərdən hesab edilir. Orada Azərbaycanın gələcək həyatının əsasını təşkil edən demokratik və humanist təhsil quruculuğuna dair strategiya təqdim edilir. Təhsilin məzmunu, kadr, infrastruktur, idarəetmə və maliyyə məsələləri ilə bağlı müasir yanaşmalardan ibarət olan bu sənədin reallaşması üçün, ilk növbədə, onun müzakirə edilməsi, müxtəlif istiqamətlərinin təhlil olunaraq öyrənilməsi bir vəzifə kimi tələb olunur. Birmənalı şəkildə nəzərə alınmalıdır ki, bu sənəd təhsil sahəsində çalışan və özünün gələcək uğurlarını bu sahə ilə bağlayan hər kəsin fəaliyyətinin əsasını təşkil edir.

2014-2015-ci dərs ili bir sıra xüsusiyyətləri ilə əlamətdar hesab olunur. Onlardan biri yeni fənlər üzrə təhsil proqramlarının (kurikulumların), ümumiyyətlə, yeni təhsil yanaşmalarının ümumtəhsil məktəblərində, xüsusən ilk dəfə VII sinifdə tətbiq olunmasıdır. Bu sahədə ümumtəhsil məktəblərinin I-VI siniflərində müəyyən təcrübə olsa da, onun VII sinifdə gündəmə gəlməsi mühüm pedaqoji innovasiya kimi maraq doğurur. Xüsusilə bu sinifdə kimya fənninin yeni pedaqoji müstəvidə təqdim olunması həm kimya müəllimlərinin, həm də məktəb rəhbərlərinin diqqətinə çatdırılması, onlarda yeni bacarıqların formalaşması tələb olunur. Əgər biz son illərdə yeni təhsil proqramlarına (kurikulumlara) keçidlə bağlı təlim kurslarının təşkili sahəsində əldə olunmuş təcrübələri nəzərə almış olsaq, o zaman VII sinifdə bu işin qurulması ilə bağlı o qədər narahatlığın olmayacağını deyə bilərik. Lakin ongünlük təlim kurslarının bu ehtiyacı tamamilə ödəyə bilməməsi il ərzində səmərəli təlim fəaliyyətinin qurulması üçün tədbirlərin müəyyənləşdirilməsini tələb edir.

Dərs müasir innovasiyaların mərkəzində dayanan, daim yaradıcılıq tələb edən təlim texnologiyalarından biridir. Onun keyfiyyəti şagird marağı ilə bağlı olduğundan bu məsələ müəllimləri həmişə düşündürür. Bu gün təhsilalanların xeyli hissəsi də məhz bir çox hallarda dərsin maraqlı olmadığını əsas gətirir. Dərsin maraq effektlərinin yaradılması barədə müzakirələrdə çox vaxt müəllimlər hazır texnologiyalara, strateji yanaşmalara ehtiyacın olmasını qeyd edirlər. Bu, nə dərəcədə məqsədəuyğundur? Şagirdlərin səviyyələrindəki müxtəlifliyi və tələbatlarının eyni olmadığını nəzərə almış olsaq, o zaman maraq effektinin yaranması, eləcə də müxtəlif texnologiyalarla bağlı standart yanaşmaların yaradılması nə dərəcədə məqbul hesab edilə bilər? Amerika təhsilşünası Heydi Heyez Ceykbsın təbirincə demiş olsaq, "Bir pedaqoq

kimi bizim mübarizəmiz təlimalanların tələbatlarını sürətlə dəyişən dünya ilə uzlaşdırmaqdan ibarətdir. Odur ki, bu sahədə olan fəaliyyətimizdə biz öz perspektivimizi, yanaşma tərzimizi daha da genişləndirməliyik" (Heydi Heyez Ceykbs. Kurikulum 21. Dəyişən dünya üçün əsas təhsil. Aleksandriya Virginiya, ABŞ, ASCD, 2010). Təhsilin bütün parametrlərində şagirdlərin maraq dünyasını qabaqlamalı, onların təlimə təşviq olunmasına təminat yaratmalıyıq. Təbii ki, bu sahədə təcrübəli müəllimlərin məruzə və çıxışlarının dinlənilməsi ən etibarlı üsullardan biri ola bilər.

Müasir müəllimin yeni təhsil proqramları, xüsusilə təhsil standartları üzrə işləməsi də diqqət mərkəzində saxlanmalıdır. Bu zaman təcrübəli müəllimlərin hazırlamış olduğu "Standartdan dərsə" modeli üzrə çıxışları ətrafında müzakirələr, nümunələrin hazırlanması ilə bağlı fəaliyyətlər təşkil olunmalıdır.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, nəinki Azərbaycanda, hətta dünya ölkələrində təhsil standartlarının yaşı çox deyildir. Araşdırmalar göstərir ki, ötən əsrin 70-ci illərindən başlayaraq təhsil standartları barədə müxtəlif yanaşmalar formalaşmaqdadır. Bu yanaşmalarda təhsil standartı adı ilə məqsədin, məzmunun, gözlənilən nəticələrin, bəzən texnologiyaların və qiymətləndirmə mexanizmlərinin əhatə olunmasına rast gəlmək mümkündür. Lakin Azərbaycanda 2006-cı ildən istifadə olunan kurikulumlarda standartlar onun tərkib hissəsi kimi təqdim olunur. Bu isə kurikulum anlayışı ilə müqayisədə standart anlayışının qismən kölgədə qaldığını göstərir. Bəzi hallarda standartın kurikulum anlayışı kimi başa düşülməsi də müşahidə olunur. Yeni qəbul olunmuş Dövlət Strategiyasında standart və kurikulumların hazırlanması vəzifəsinin qarşıya qoyulması və onların səriştələrə söykənən nəticəyönümlü məzmun kimi yaradılması təhsil standartları anlayışına yeni yanaşma tərzinin formalaşdığını göstərir. Artıq müəllimlər fəaliyyətlərini planlaşdırmaq, qurmaq üçün bu yeni yanaşma tərzindən xəbərdar olmalı, özlərinin təcrübəsində onlardan istifadə etməlidirlər.

Müasir dövrdə təhsilin məzmun komponenti kimi dərslik tarixi funksional rolunu bu gün də daşıyır. Xüsusilə təlim prosesinin səmərəlilik faktoru kimi çıxış edir. Müəllim tədris fəaliyyətində dərslik amilinə daha çox istinad etməklə, demək olar ki, bütün imkanlarını onunla bağlayır. Ona görə də az qala özünün əvəzolunmaz müəllimlik fəaliyyətindəki uğursuzluqlarını onunla əlaqələndirir. Bu zaman o, məntiqi olaraq özünün müstəqil yaradıcı fəaliyyətini inkar etmiş olur. Əslində bu günün müəllimi özünün innavatorluğu, qabaqcıllığı, xüsusilə yaradıcı fəaliyyəti ilə daha çox fərqlənir. Çünki müasir zamanda inkişafyönümlü təhsil sistemində olmaq, fəaliyyət göstərmək üçün müəllimdən hər addımda pedaqoji fakt və hadisələrə, şagirdlərinə yaradıcı yanaşmaq missiyasını daşımaq bir nəfər kimi tələb olunur. Bu isə müəllimin qarşısında dərsliklərlə bağlı daha geniş yaradıcılıq imkanlarının olduğunu göstərir.

Ölkəmizdə intellekt dərsliklərinin yaradılması istiqamətində işlər aparılır. Artıq 2014-2015-ci dərs ili üçün 271 adda 7,7 milyon nüsxədə dərslik və müəllim üçün metodik vəsait hazırlanmışdır.

Məlum olduğu kimi, dərsliklərin yaradılması sahəsində xeyli təcrübə vardır. Etiraf etmək lazımdır ki, uzun illərin sınağından çıxmış bu təcrübə prosesində müxtəlif təhsil sahələrini, fənləri təmsil edən dərsliklər yaradılmışdır. Buna baxmayaraq, həmişə dərsliklərin hazırlanması müzakirə obyektinə çevrilmiş, daha yaxşı dərsliyin meydana çıxarılması mütəxəssislərin uğuru kimi dəyərləndirilmişdir. Zaman dəyişmiş, müstəqil Azərbaycanın müstəqil təhsil sisteminin qurulması prosesində bu missiya bu

gün də aktual olaraq qalmaqdadır. Alimlər düşünür və belə qənaətə gəlirlər ki, "Dərslik necə olmalıdır? Yeni pedaqoji təfəkkür baxımından bu sual son dərəcə aktualdır. Müasir dərsliklərdə şagirdlərdə inkişaf və tərbiyə ediləcək keyfiyyətlər layihələşdirilməlidir" (Əlizadə Ə.Ə. Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Pedaqogika, 2004). Deməli, dərsliklər inkişafetdirici və tərbiyəedici funksiyası ilə fərqlənməli və xüsusi missiya daşımalıdır. Onların məzmun və strukturunda şagirdi təşviq edən, istiqamətləndirən və müəyyən qənaətə gəlməkdə ona dəstək verən bir metodik sistem olmalıdır. Hər bir dərsliyin özünə məxsus belə bir sistemə malik olması onun ümumi xarakter daşıması ilə yanaşı, həm də fərdi xüsusiyyətə malik olmasını göstərir. Eyni zamanda onun pedaqoji araşdırmaların nəticəsi kimi meydana gələn modelinin ilkin olaraq müxtəlif mərhələlərdə müzakirə olunmasını və təcrübi-eksperimental qaydada sınaqdan keçirilərək istifadəyə verilməsini ciddi vəzifə kimi qarşıya qoyur. Ölkəmizdə aparılan təhsil islahatı çərçivəsində dərsliklərin hazırlanması işinin təkmilləşdirilməsi, onun ən etibarlı təlim vasitəsi kimi məktəbə təqdim olunması da əhəmiyyətli hesab edilir. Şagird nailiyyətlərinin qiymətləndirilməsi mühüm pedaqoji texnologiyalardan biri kimi müasir məktəbin idarə edilməsində daha geniş istifadə olunur. Bu, çox hallarda idarəetmə texnologiyalarının mühüm komponenti kimi izah edilir.

Bu gün ölkəmizdə həyata keçirilən şagird nailiyyətlərinin qiymətləndirilməsi sahəsində siyasət ciddi normativ-hüquqi əsasa söykənən və humanist məqsədlərə xidmət edən bir fəaliyyət kimi formalaşmaqdadır. Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi dövründə bu sahədə xeyli təcrübə toplansa da müəllim və şagirdlərin fəaliyyətinin nizamlanması baxımından xeyli dəqiqləşdirilməli və konkretləşdirilməli məsələlər də vardır ki, xüsusilə "Ümumi təhsil məktəblərində məktəbdaxili qiymətləndirmənin aparılmasına dair Müvəqqəti Təlimat" və Azərbaycan Respublikası təhsil nazirinin 07 iyul 2014-cü il tarixli, 782 nömrəli əmrilə onda aparılan dəyişikliklər barədə məsələlərə ardıcıl diqqət yetirilməlidir.

Təhsil quruculuğunda məktəbin funksiyası da dəyişir. 12 illik məktəbin yaradılması ümumi təhsilin "yaddaş məktəbi"ndən "təfəkkür və düşüncə məktəbi"nə keçidlə müşayiət olunur. Belə bir funksiyanın yaranması məktəbin mahiyyət dəyişikliyi kimi başa düşülür. İstər-istəməz bu dəyişiklik, öz növbəsində, yeni məzmun və strukturun yaradılmasını tələb edir. Təfəkkürün inkişaf etdirilməsi, intellektual bir səviyyənin formalaşdırılması məktəbin aparıcı missiyasına çevrilir. Bu işdə məktəbin bütün struktur vahidləri kompleks qaydada birləşərək fəaliyyət göstərməli olur. Adi dəhlizdən tutmuş kitabxanaya, sinif otaqlarına qədər hər yerdə son dərəcə böyük maraq yaradan öyrədici mühitin formalaşdırılması məktəbin müasir didaktik imkanları kimi dəyərləndirilir. Yalnız belə olduğu təqdirdə şagirdlərin öyrənmək, yaratmaq həvəsini inkişaf etdirmək mümkündür. Heç şübhəsiz, hər bir bölgədə belə təhsil müəssisələri olmamış deyildir. Onların təcrübələrinin öyrənilib ümumiləşdirilməsi və yayılması istiqamətində fəaliyyətimizi genişləndirməliyik.

Unutmaq olmaz ki, təhsil sosial fenomen olduğu kimi, məktəb də ictimai ab-havada dəyişən, formalaşan bir qurumdur. Onun uğurlarında cəmiyyətin dəstəyi son dərəcə vacibdir. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarovun "Müəllimlik bir missiyadır" adlı son müsahibəsində xüsusi olaraq qeyd etdiyi məsələlərdən biri də elə bu problemlə bağlıdır: "Təcrübə göstərir ki, akademik göstəricilərin artmasına daha çox sosial mühit təsir edir. Çünki hər şey dəyərləndirmə şkalasından, şagirdin ailəsinin, qohumla-

rının, onun əhatəsinin təhsilə olan münasibətindən başlayır. Sosial kontekstin dəstəyi olmadan güclü müəllim faktoru kömək etmir. Bu səbəbdən də bizim işimiz təkcə təhsil sisteminin optimallaşdırılmasından deyil, müəyyən mənada dəyərlər sisteminin yaxşılaşdırılmasından ibarətdir".

Odur ki, müasir zamanda cəmiyyətin təhsil mədəniyyətini yüksəltmək üçün fəallığımızı artırmalıyıq. Məktəblərin, təhsil qurumlarının cəmiyyətlə qarşılıqlı fəaliyyətinin güclənməsinə, onların məktəblə əlaqə imkanlarını artırmaq məqsədi ilə sistemli maarifləndirmə işlərinin aparılmasına diqqət yetirməliyik.

Bu gün islahatçılıq fəaliyyətimizin başlıca istiqamətlərindən biri infrastruktur dəyişikliklərinin aparılmasıdır. Artıq Azərbaycan Respublikası Prezidentinin 2014-cü il tarixli sərəncamı ilə Azərbaycan Respublikası Təhsil Nazirliyinin yeni strukturu təsdiq olunmuşdur. Dövlət Strategiyasına uyğun olaraq qəbul olunmuş bu struktur respublikada təhsil sistemini təkmilləşdirmək və səmərəliliyini artırmaq məqsədi daşıyır. Eləcə də 12 illik sistemə keçidlə əlaqədar olaraq ümumi təhsilin infrastrukturunda dəyişikliklər aparmaqla onu daha da müasirləşdirmək gələcək fəaliyyətimizin prioritet istiqamətlərindən biri kimi qarşıda dayanır. Təbii ki, bütün bu infrastruktur dəyişiklikləri gələcəyin perspektivləri kimi ciddi hazırlıq aparmağı, eyni zamanda səfərbər olmağı tələb edir.

İstedadlılarla iş Azərbaycanda həyata keçirilən təhsil siyasətinin başlıca istiqamətlərindən biridir. Bu işin yüksək səviyyədə təşkil olunması xalqımızın intellektual səviyyəsinin yüksəldilməsi, gələcək inkişafı baxımından əhəmiyyət daşıyır. İstedadların seçilməsi, inkişaf etdirilməsi sahəsində təhsil müəssisələrinin üzərinə daha böyük məsuliyyət düşür. Odur ki, ümumtəhsil məktəblərinin istedadlılarla apardığı işə dair müzakirə açılarkən, ilk növbədə, məktəbin bu sahədə konkret fəaliyyət istiqamətini müəyyənləşdirmək, istedadlıların müəyyən olunması üçün şəraitə uyğun vasitə və üsulları seçmək, eyni zamanda istedadlıların inkişaf etdirilməsi ilə bağlı strategiyalar hazırlamaq ətrafında fikir mübadilələri aparılması tövsiyə edilir.

Bu gün Azərbaycan Respublikasının Təhsil Problemləri İnstitutunun strukturunun köklü şəkildə dəyişilməsi, onun fəaliyyətinin Dövlət Strategiyasının tələbləri baxımından səmərəli və keyfiyyətli qurulmasına yönəldilmişdir. Aparılan araşdırmaların tematikası Azərbaycan təhsilinin müasir problemlərinə yönəldilmişdir. Artıq son bir ildə "Azərbaycan Respublikasında məktəbəqədər təhsil proqramı (kurikulumu)", 2014), "Məktəbəqədər təhsil müəssisələri üçün təlim materiallarının təxmini planlaşdırılması (metodik tövsiyə)", 2014), "Məktəbəqədər təhsilin yeni məzmununun xüsusiyyətləri (metodik tövsiyə)", 2014), "Yeni təhsil proqramlarının (kurikulumların) tətbiqi məsələləri" 2014) adda kitablar hazırlanaraq çap edilmişdir. Müəllimlər "Təhsil işçilərinin 2014-cü il sentyabr konfransları üçün tövsiyələr" kitabından il ərzində faydalanmalıdırlar. Bundan əlavə, ikinci xarici dil fənni üzrə dörd adda tövsiyə hazırlanaraq müzakirəyə təqdim edilmişdir. Bu il fənlər üzrə standart və kurikulumların çap edilməsi də planlaşdırılmışdır.

Ölkə miqyasında həyata keçirilən təhsil islahatlarını uğurla davam etdirmək, onu vahid tələblər əsasında istiqamətləndirmək üçün müvafiq elmi, metodiki və təşkilati tədbirlərin həyata keçirilməsi məqsədəuyğun sayılır.

**İstifadə edilmiş ədəbiyyat**

1. www.president.az/files/future_az.pdf
2. www.president.az/articles/9779
3. Heydi Heyez Ceykbs. Kurikulum 21. Dəyişən dünya üçün əsas təhsil. Aleksandriya Virginiya , ABŞ, ASCD, 2010
4.http://www.edu.gov.az/view.php?lang=az &menu=9&id=8975

# MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ ONUN PERSPEKTİVLƏRİ

**Laləzər Cəfərova**
***Təhsil Problemləri İnstitutunun şöbə müdiri, pedaqogika üzrə fəlsəfə doktoru, dosent***

***Açar sözlər:*** *məktəbəqədər təhsil, pedaqoji proses, təhsilin modernləşdirilməsi, idarəetmə, normativ-hüquqi sənədlər.*
***Ключевые слова:*** *дошкольное воспитание, педагогический процесс, модернизация образования, управления, нормативно-правовые документы.*
***Key words:*** *early childhood education, pedagogical process, the modernization of education, management, legal and regulatory documents.*

Respublikamızın müasir inkişaf mərhələsində dərin sosial-iqtisadi dəyişikliklər gedir. Azərbaycan Respublikasında təhsilin digər pillələri ilə yanaşı, məktəbəqədər təhsil sistemində baş verən müasir proseslər müxtəlifdir və mühüm vəzifələrin həllinə yönəldilmişdir. Bunlar da məktəbəqədər təhsil sistemində yeni yanaşmaların tətbiqini və təlim prosesinin təşkili üçün yeni səmərəli formaların axtarılmasını tələb edir. Məktəbəqədər təhsil bütün təhsil sisteminin bünövrəsidir, çünki məhz bu mərhələdə uşağın gələcək inkişafını xarakterizə edən şəxsiyyətin təməli qoyulur. Məktəbəqədər təhsil uşaqların potensial imkanlarının üzə çıxarılmasında, məktəbə hazırlanmasında, onlarda mədəni keyfiyyətlərin, müstəqillik, yaradıcılıq, təşəbbüskarlıq və həyati bacarıqların formalaşmasında mühüm rol oynayır. Məktəbəqədər təhsilin məqsədi uşağın fərdi yaş potensialının maksimal açılması üçün şəraitin yaradılmasından ibarətdir. Təhsil haqqında Azərbaycan Respublikasının Qanununda deyildiyi kimi, məktəbəqədər təhsil məktəbəqədər yaşlı uşaqların erkən yaş dövründən intellektual, fiziki və psixi inkişafını, sadə əmək vərdişlərinə yiyələnməsini, istedad və qabiliyyətinin üzə çıxarılmasını, sağlamlığının qorunmasını, estetik tərbiyəsini, təbiətə və insanlara həssas münasibətinin formalaşmasını təmin edir (2).

Respublikamızda məktəbəqədər təhsilin müasir sistemi dinamizm prinsipləri üzərində qurulur, müxtəlif iş formaları, cəmiyyətin və şəxsiyyətin tələblərinin nəzərə alınması, uşaqlar üçün təlim-tərbiyə müəssisələrinin yeni növlərinin yaranması, pedaqoji xidmətlərin müxtəlifliyi ilə səciyyələnir. Məktəbəqədər təhsil sisteminin inkişafı Azərbaycan Respublikasının dövlət təhsil siyasətinin strateji istiqamətlərindən biridir. Dövlət səviyyəsində məktəbəqədər təhsil məsələlərinə əhəmiyyətli dərəcədə diqqət yetirilir.

Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında deyilir: "Məktəbəqədər təhsilə cəlb olunma səviyyəsi də aşağıdır. Belə ki, məktəbəqədər təhsillə əhatə səviyyəsi şəhərlərdə 23,4, kəndlərdə 8,7, ölkə üzrə isə 16,5 faiz təşkil edir. Son illərdə Bakı şəhərində yeni məktəbəqədər təhsil müəssisələrinin inşası və ya əsaslı təmiri istiqamətində atılan addımlar nəticəsində məktəbəqədər təhsillə əhatə səviyyəsi artaraq 27 faizə çatsa da bu sahədə həllini gözləyən problemlər qalmaqdadır. Ölkənin yaşayış məntəqələrinin 75 faizində məktəbəqədər təhsil müəssisəsi yoxdur."

Hərtərəfli inkişaf etmiş gələcək vətəndaşı yetişdirməkdən ötrü ömür boyu əldə edilən bilik, bacarıq və vərdişlərdən istifadə edə bilmək bacarığının inkişafı üçün müvafiq şəraitin təşkili zəruridir. Uşaq şəxsi həyat fəaliyyətinin subyekti olmağı, öz potensialını görməyi, öz gücünə inanmağı, fəaliyyətində müvəffəqiyyət qazanmağı öyrənməlidir. Bu, uşaqları sosiallaşdırmaqla bərabər, onların məktəbəqədər müəssisədən məktəbə keçidini əhəmiyyətli dərəcədə yüngülləşdirir, məktəb təliminə maraq yaradır və inkişaf etdirir.

Hazırda respublikamızda məktəbəqədər təhsil müəssisələrində keçirilən məşğələlərin adı, məzmunun bilikyönümlü və müəllimyönümlü olması, erkən yaş qruplarında təlimin təşkili müasir dövrün tələbləri baxımından tələbatı ödəmir. Uzun müddət məktəbəqədər təhsil sistemində uşağa bilik, bacarıq və vərdişlərin daşıyıcısı, tərbiyəçilərə isə bilik ötürən kimi baxılmışdır. Lakin burada ənənəvi proqram üzrə pedaqoji prosesin müxtəlif bilik sahələrində məzmunun həcminin genişlənməsi həddindən artıq yüklənməyə gətirib çıxarır ki, bu da, ilk növbədə, öz təsirini uşaqda göstərir. Bu zaman bir növ "uşağa daha çox bilik vermək" arzusu və məktəbəqədər yaşlı uşağın psixi və fiziki imkanları arasındakı ziddiyyət aydın hiss olunur.

Belə problemlərin həll olunması, yeni dövlət standartları əsasında işə başlanılması üçün, ilk növbədə, inteqrasiyadan istifadə etmək zərurəti yaranır. Bir çox mütəxəssislər inteqrasiyanı məktəbəqədər təhsilin yeniləşdirilməsi və uşaq şəxsiyyətinin inkişafının səmərəliliyi, uşaq sağlamlığının qorunması, onu keyfiyyətli təhsilə nail olmanın yollarından biri kimi müəyyən edir.

Pedaqoji prosesin humanistləşdirilməsi gündəlik həyatda və uşaq həyatının ənənəvi fəaliyyət növlərində tərbiyəçi-uşaq münasibətlərinin, ünsiyyətin dəyişdirilməsi, tərbiyənin şəxsiyyətyönümlü modelinin qurulmasını ehtiva edir.

Tərbiyəçi ilə uşağın gündəlik sərbəst ünsiyyəti prosesində inkişafetdirici vəzifələrin realizəsi xüsusi məşğələlərlə uyğunlaşdırılmalıdır. Odur ki, məşğələlərin təşkili müxtəlif formalarda olmalıdır. Çünki məşğələlərin fəal təlim əsasında keçirilməsi hər bir uşağın idrak fəallığını yaxşılaşdırır, əks əlaqəni qurmağa və uşaqların irəliləyişini nəzərə almağa kömək edir.

Həmçinin uşaq bağçası ilə ailənin qarşılıqlı əlaqəsinin də daha əlverişli qaydada qurulması diqqətdən kənarda qalmamalıdır. Uşaq problemlərinin həlli zamanı valideynləri aktiv müzakirəyə cəlb etmək, onları uşaqlarla birgə yaradıcılıq işinə cəlb etmək məqsədəuyğundur.

Əşya mühitinin və qrup otağının təşkilində də ciddi dəyişikliklər aparılmalıdır.

Sahənin təchizatı, əşya və oyun mühiti pedaqoji stereotip yaradaraq, avtoritar sistemin çatışmazlıqlarını və xüsusiyyətlərini əks etdirir. Bununla da, qeyd edildiyi kimi, formal intizam, uşaqların fəaliyyətinin, xüsusilə də oyunun reqlamenti pedaqoji prosesin mərkəzində dururdu.

Məktəbəqədər təhsilin yeniləşdirilməsi uzunmüddətli, məsuliyyətli və mürəkkəb bir prosesdir. Əlbəttə ki, qısa müddətə bu problem həll edilə bilməz. Ancaq onun perspektivlərinin proqnozlaşdırılması, elmi və tətbiqi aspektlərin öyrənilməsi məsələləri tədqiqatçıların daim diqqət mərkəzində olmalıdır və bu böyük əhəmiyyətə malikdir.

Artıq dövrün məzmunu, müasir uşaqların inkişaf səviyyəsi əhəmiyyətli dərəcədə dəyişdiyi üçün belə yanaşma müasir tələblərə cavab vermir. Tərbiyəçilərin fəaliyyəti yeni müstəvidə qurulmalıdır. Artıq birmənalı şəkildə başa düşülməlidir ki, məktəbəqədər təhsil-uşağın dünyanı dərk etməsinə müşayiət edilməsi, inkişafında kömək və dayaqdır. Respublikamızda belə situasiyanı inkişaf etmiş ölkələrin təcrübəsini (məs., Finlandiya, İsveç və s.) öyrənməklə, milli xüsusiyyətlərimizi əsas götürməklə dəyişmək olar. Bu ölkələrin məktəbəqədər təhsilinin əsasında şəxsiy-

yətyönümlü sosial-pedaqoji yanaşma durur.

Bizim ölkəmizin ictimai həyatında baş verən sosial-iqtisadi dəyişikliklər Azərbaycan məktəbəqədər təhsil sisteminə də öz çoxfunksiyalı təyinatı üzrə dəyişikliklər gətirdi. Bu dəyişikliklər isə qəbul edilmiş normativ-hüquqi sənədlərdə öz əksini tapır.

Son illər ərzində təhsilin, o cümlədən məktəbəqədər təhsilin inkişafının yeni prioritetlərini müəyyən edən əhəmiyyətli normativ-hüquqi sənədlər (Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu; Məktəbəqədər təhsilin dövlət standartı və proqramı; Məktəbəqədər təhsilin proqramı (kurikulumu); Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası) qəbul edilmişdir.

Təqdim edilən dövlət sənədlərində Azərbaycan Respublikasında məktəbəqədər təhsil sisteminin modernləşdirilməsinin konseptual əsasları qoyulmuşdur. Dövlət sənədlərinin müasir tələblərinə uyğun olaraq təlimedici-tərbiyəedici sistem uşaqların hərtərəfli inkişafına, onlarda əxlaqi normaların formalaşmasına, onların yaş və fərdi imkanlarına, qabiliyyət və ehtiyaclarına uyğun olaraq sosial təcrübə əldə etmələrinə istiqamətləndirilmişdir.

Azərbaycanda məktəbəqədər təhsilin sürətlə inkişaf etdirilməsi və onun beynəlxalq standartlara tam uyğunlaşdırılması məqsədi ilə Azərbaycan Respublikası Prezidenti cənab İlham Əliyevin 12 aprel 2007-ci il tarixli, 2089 nömrəli sərəncamı ilə “Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı” (2007-2010-cu illər) təsdiq edilmiş və ona əsasən əməli tədbirlər həyata keçirilmişdir. Təhsil sahəsində əsaslı dəyişikliklərə, uğurlu nəticələrə təkan verən bu sərəncam bir daha məktəbəqədər təhsilə göstərilən diqqətin təzahürü kimi meydana çıxmışdır.

Məktəbəqədər təhsil sisteminin müasir tələblərə cavab verən bir səviyyəyə çatdırılması məqsədi ilə Azərbaycan Respublikası Nazirlər Kabineti 2010-cu il 16 iyul tarixli, 137 nömrəli qərarı ilə “Məktəbəqədər təhsilin dövlət standartı və proqramı”nı təsdiq etmişdir. “Məktəbəqədər təhsilin dövlət standartı və proqramı” (kurikulumu) “Təhsil haqqında” Azərbaycan Respublikası Qanununun 6.3-cü maddəsinə uyğun hazırlanmışdır və tabeliyindən, mülkiyyət formasından asılı olmayaraq, respublikada fəaliyyət göstərən bütün məktəbəqədər təhsil müəssisələrinə şamil olunur və bu tipli təhsil müəssisələrində məktəbəqədər təhsilin vəzifələrinin yerinə yetirilməsinə, tədris-metodik rəhbərliyin tələblərinə əməl olunmasına dövlət nəzarətinin həyata keçirilməsini təmin edir.

Məktəbəqədər təhsilin məzmunu yuxarıda adları çəkilən konseptual sənədlərdə müvafiq standartlara uyğun öz əksini tapmışdır. Aydındır ki, uşaqlarda mənəvi keyfiyyətlərin inkişaf etdirilməsi məktəbəqədər təhsilin qarşısında qoyulan vəzifələrdən biridir. Bu məqsədlə valideynlərlə də intellektual, sosial-iqtisadi istiqamətlərdə qarşılıqlı əlaqələr yaradılmalıdır. Çünki uşaqlar bir şəxsiyyət, cəmiyyətin vətəndaşı, yüksək əmək və davranış mədəniyyəti olan fəal qurucu kimi ilk mərhələ kimi məktəbəqədər müəssisələrdə tərbiyə olunmalıdır.

Təhsildə əsas dəyər uşaqdır. Məktəbəqədər yaş dövrü isə təkcə məktəb həyatına hazırlıq mərhələsi deyil, eyni zamanda insan həyatının ən məsuliyyətli, ən mühüm yaş dövrüdür ki, bu dövrdə insanda bütün mənəvi dəyərlərin təməli qoyulur. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında deyildiyi kimi, “...Təməl bacarıqlar uşaqlıq dövrünün ilk illərindən əldə edildiyinə görə uşaqların zehninin erkən yaş dövründən inkişaf etdirilməsi vacibdir. Bu səbəbdən məktəbəqədər təhsilin inkişafı dövlət siyasətində əhəmiyyətli yer tutur”(3).

Məktəbəqədər təhsilin keyfiyyəti uşaqların təlim və tərbiyə prosesinin vəziyyəti və nəticəliliyi ilə müəyyən edilir. Məktəbəqədər təhsildə yeni keyfiyyət göstəricilərinə nail olmanın başlıca strategiyası uşaq inkişafının diaqnostikasıdır. Məktəbəqədər təhsil üzrə dövlət standartlarının reallaşdırılmasının

keyfiyyəti bilik, bacarıq və vərdişlər sisteminin deyil, hər bir uşağın inkişaf və nailiyyətlərinin yekun diaqnostikası əsasında səriştəliliyin inkişaf səviyyəsi ilə qiymətləndirilir.

Məktəbəqədər yaşlı uşağın inkişafının gözlənilən nəticələri kimi, əsas bacarıqları da sosial mühitin, uşağın fərdi xüsusiyyətlərinin, bütovlükdə, onun qabiliyyət, təşəbbüskarlıq, ünsiyyətdə fəallıq, fəaliyyətində müxtəlif məsələlərin optimal həllini tapmaq bacarıqları nəzərdə tutulur və xarakterizə edilir.

Bu halda məktəbəqədər təhsilin keyfiyyətinin nəticəliliyinin mühüm göstəriciləri kimi indikatorlar uşağın səriştəli inkişafına, daha doğrusu, məktəbəqədər yaşlı uşağın hərtərəfli inkişafının izlənilməsi səviyyəsini müəyyən edən alət kimi xidmət edir. Belə yanaşma məktəbəqədər təhsil müəssisələrində çalışan tərbiyəçilərə valideynlərlə uşağın fərdi təhsilləndirici trayektoriyasının qurulması üçün əsas olan diaqnostik iş aparmağa imkan verir.

"Məktəbəqədər təhsilin dövlət standartı və proqramı" əsasında ilk dəfə respublikamızda nəticəyönümlü və uşaqyönümlü təlimə keçildi. Bu sənəd əsasında hazırlanmış "Məktəbəqədər təhsil proqramında (kurikulumunda)" yeni dövlət standartlarına əsasən məktəbəqədər təhsil müəssisələrində təlimin məzmunu uşaqların meyil, maraq, arzu və bacarıqlarına istiqamətlənib. Biz uşaqlara nə gəldi öyrədə, onları lüzumsuz informasiya ilə yükləyə bilmərik. Uşaqlarda ətraf aləmin dərk edilməsinə marağın yaradılması təlimin rolunu dəyişir. Bu, hər şeydən əvvəl, müstəqil dərketməyə hazırlığı inkişaf etdirir. Uşağa düşünməyi və müstəqil bilik əldə etməyi öyrətmək müasir təhsilin pedaqoji məqsədidir.

Məktəbəqədər dövlət standartları məktəbəqədər təhsilin proqramının (kurikulumunun) strukturunu, o cümlədən məzmunun həcmi və inkişaf sahələrinin uyğunluğunu müəyyənləşdirir. Məktəbəqədər təhsil proqramında (kurikulumunda) məktəbəqədər təhsilin məzmunu özündə aşağıdakı 4 inkişaf sahəsini ehtiva edir:

- Fiziki inkişaf, sağlamlıq və təhlükəsizlik;
- İdrakın inkişafı;
- Estetik və yaradıcı inkişaf;
- Sosial-emosional inkişaf.

Bu inkişaf sahələri üzrə məzmun müasir məktəbəqədər təhsil sisteminin konseptual və normativ-hüquqi sənədlərinə uyğun müəyyənləşdirilmişdir (4).

Bu sənəd proqramın struktur vahidi olmaqla aşağıdakıları özündə ehtiva etdirir:

- Uşaqların əsas inkişaf sahələrinin tam əhatə olunmasını konkretləşdirir;
- Məktəbəqədər təhsilin məzmununda inteqrativlik prinsipi nəzərə alınır;
- Fəaliyyət dar çərçivədə nəzərdə tutulmur.

Ənənəvi təhsil sistemində məktəbəqədər təhsilə təlim bloku (məşğələ cədvəli) nəzərə alınmaqla fənyönümlülük prinsipi əsasında baxılırdı. Bu forma məktəbəqədər təhsil müəssisələrində çalışan tərbiyəçilərə daha yaxın və aydındır. Məhz məktəbəqədər dövrdə uşaq şəxsiyyətinin əsası, onun psixi və şəxsiyyətyönümlü inkişafını xarakterizə edən dəyərlər böyüklərlə birgə fəaliyyət və ünsiyyət zamanı yaranır. Ənənəvidən fərqli olaraq yeni məzmuna görə şəxsiyyətyönümlü təhsil prosesində böyüklərlə qarşılıqlı fəaliyyət prosesində şəxsiyyətin əsas nüvəsini uşağın kommunikativ tələbatı, onun aparıcı motivləri təşkil edir. Odur ki, məktəbəqədər təhsil müəssisələrində çalışan hər bir tərbiyəçi uşaqlarla böyüklərin birgə fəaliyyətinin təşkili və uşaq fəaliyyət növlərinin təşkili prosesində təlimedici fəaliyyətin qurulmasının xüsusiyyətlərini bilməlidir.

Dövlət Strategiyasında məktəbəqədər yaşlı uşaqların fiziki və əqli inkişafını, sosiallaşmasını təmin edən, yaradıcılıq qabiliyyətlərini üzə çıxaran, onlarda həyati bilik və bacarıqları, davranış qaydalarını aşılayan məktəbəqədər yaş dövründə uşaq inkişafının səmərəli təhsil modelinə əsaslanan standart və kurikulumların hazırlanması strateji hədəflər sırasında yer almışdır.

Məktəbəqədər təhsilin proqramı (kurikulumu) Təhsil Problemləri İnstitutunda 21 nəfər mütəxəssisdən ibarət işçi qrupu tərəfindən hazırlanmış və ictimai rəyə təqdim olunduqdan sonra 10 iyul 2012-ci il tarixdə təhsil naziri tərəfindən təsdiq edilmişdir. Məktəbəqədər təhsilin kurikulumunun tətbiqi üçün 15 pilot rayon və şəhəri müəyyənləşdirilmişdir. Artıq bütün respublikada tətbiqin vaxtı çatmışdır.

Həyatın digər sahələrində olduğu kimi, təhsil sistemimiz də daim inkişaf edir, təkmilləşir. Dünyanın qabaqcıl ölkələrinin təhsil sisteminə istinad edilməsi, Avropa təhsil sisteminə inteqrasiya bu gün məktəbəqədər təhsil sistemində də əsaslı dəyişikliklərin aparılmasını tələb edir. Məktəbəqədər təhsilin inkişafı ilə bağlı dövlət proqramı çərçivəsində uşaq bağçalarının maddi-texniki bazası gücləndirilsə də, məktəbəqədər təhsilin məzmununda dəyişiklik etmək bu gün zərurətə çevrilib. Bu isə məktəbəqədər təhsilin kurikulumunun tətbiqinin sürətləndirilməsini zəruri edir. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında da məktəbəqədər təhsil üzrə yeni kurikulumun tətbiqinin sürətləndirilməsinin zəruriliyi qeyd edilir. Həmçinin xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün inkişaf və inklüziv təlim proqramlarının hazırlanması da nəzərdə tutulub. Sənəddə məktəbəqədər təhsilin təhsil pillələrinin çox vacib həlqəsi kimi nəzərə alınması onun inkişaf perspektivini çox aydın göstərir.

“Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”nda respublikanın ən mühüm problemlərindən nəinki sosial və iqtisadi cəhətdən dəyişən şəraitdə yaşamağa hazır, həm də mövcud vəziyyətə fəal təsir edib, dəyişmək bacarığına malik rəqabətə davamlı şəxsiyyətin formalaşmasına diqqət yetirilmişdir. Azərbaycanda aparılan islahatın ümumi məqsədi təhsil sisteminin, o cümlədən məktəbəqədər təhsilin sosial-iqtisadi mühitə uyğunlaşmasıdır. Azərbaycan təhsili üçün daha çox əhəmiyyət kəsb edən, ilk növbədə, keyfiyyətli məktəbəqədər təhsilə keçidin, xüsusilə bu şəbəkənin genişləndirilməsi probleminin həll edilməsidir. Təhsil sisteminin dünya təhsil məkanına daxil olması isə onun keyfiyyətindən asılıdır.

Biz elə bir dövrdə yaşayırıq ki, daim inkişaf etməli, yenilikləri öz işimizə gətirməliyik. Müasir valideynlər öz uşaqlarının daha keyfiyyətli təhsil almalarını, xoşbəxt yaşamalarını istəyirlər. Onlar öz uşaqlarını təlim-tərbiyənin yüksək səviyyədə təşkil edildiyi məktəbəqədər müəssisələrə qoymaq, daha peşəkar tərbiyəçilərə etibar etmək istəyirlər. Bu sosial sifarişdir. İşimizi də bu sifariş əsasında qurmalıyıq. Məktəbəqədər müəssisələrdə çalışan, ümumiyyətlə, uşaqla işləyən hər bir pedaqoq öz işini müvafiq pedaqoji sistemə uyğun qurmalıdır. Uşaq fəaliyyətinin belə motivləşdirilməsi nəticəli olmaqla, hər bir uşağın bu və ya digər bacarığının inkişafına imkan verir.

Son 30–40 il ərzindəki elmi-texnoloji tərəqqi, innovasiyalar və modernləşmə nəticəsində praktiki bilik və vərdişlərlə zənginləşməyən, sırf nəzəri xarakter daşıyan təhsil öz fundamental əhəmiyyətini itirməkdədir. Bu baxımdan təhsilin məzmununun formalaşmasında akademik biliklərlə yanaşı, praktik bilik və bacarıqların, səriştənin vacibliyi önə çəkilir. Dövlət Strategiyasında deyildiyi kimi, səriştə-əldə olunmuş bilik və bacarıqları praktiki fəaliyyətdə səmərəli tətbiq etmək qabiliyyətidir. O, şəxsin qazandığı bilik və bacarıqların konkret fəaliyyətin nəticəsinə çevrilməsini təmin edir. Səriştəyə əsaslanan təhsil sosial-iqtisadi inkişafa daha effektli xidmət göstərir.

Təhsil sisteminin yenidən qurulması zamanı həmişə müəyyən çətinliklər qarşıya çıxır. Bu çətinliklərin dəf edilməsi zamanı tərbiyəçilərin öz sosial missiyasının əhəmiyyətini anlamaları çox mühümdür ki, onlar öz səylərini dəyərlərin formalaşdırılmasına, uşaqların inkişafına və təhsilinə, onların psixoloji müdafiəsinə yönəltsinlər.

Müasir təhsildə uşağın fərdi inkişafını qəbul edən ən təbii yanaşma şəxsiyyətyönümlü yanaşma hesab olunur. Şəxsiyyətyönümlü model uşaqların emosional, sosial və idraki inkişafına eyni dərəcədə əhəmiyyət verir. Belə yanaşma uşağın nəinki ibtidai təlimində, eyni zamanda uzunmüddətli perspektivində daha yaxşı nəticələr verir. Belə ki, uşaqlar təşəbbüskar, yaradıcı, müstəqil, özünəinamlı böyüyürlər. Şəxsiyyətyönümlü təhsil sistemində pedaqoji prosesin mərkəzində dayanan tərbiyəçi və uşaqların funksiyaları dəyişir. Onların fəaliyyəti əvvəlcədən müəyyən olunmuş nəticələrə əsasən qurulur. Tərbiyəçi təlim prosesində yeni texnologiyaların içərisindən ən münasibini seçir. Bu texnologiyaların müəyyən olunmasında tərbiyəçi və uşaq şəxsiyyəti təlimin aparıcı subyekti kimi çıxış edir. "Məktəbəqədər təhsil proqramına (kurikulumuna)" əsasən məktəbəqədər təhsil müəssisələrində tərbiyəçi-uşaq münasibətləri "subyekt – subyekt" formuluna uyğun qurulur (4). Bu zaman uşaqlar öz təfəkkürünün, düşüncəsinin, tərbiyəçilər isə uşağın inkişafı üçün şəraitin təşkilatçısı olur. O daha çox qrup şəraitində təlim fəaliyyətini əlaqələndirən, istiqamətləndirən məsləhətçi kimi uşaqların müstəqil idraki fəaliyyətini, yaradıcılığını təşkil edən subyektə çevrilir, uşaqlar isə müstəqil axtarışlar aparmağa, yaradıcı fəaliyyət göstərməyə sövq edilir.

Uşaq cəmiyyətdə yaşamaq, oyunda fərdi iş və qrupla qarşılıqlı fəaliyyət vərdişlərinə, öyrənməyi öyrənmək bacarığına sahib olmalıdır. Məhz məktəbəqədər yaş dövründə şəxsiyyətin əsas keyfiyyətləri, əsas sosial bacarıqlar formalaşır.

Bu gün birinci sinfə gedən uşağın bioloji inkişaf səviyyəsi psixoloji inkişafı qədər əhəmiyyətli deyil. Əsas onu anlamaq lazımdır ki, hər bir gələcək birinci sinif şagirdində müvafiq daxili mövqe formalaşdırılmış olsun. Valideynlər uşağı məktəbə nə qədər "hazırlamağa" çalışmaqlarından asılı olmayaraq, nəticə həmişə gözlənildiyi kimi olmur, çünki onlar məktəblinin daxili mövqeyinin formalaşması haqqında deyil, daha çox təlimini düşünürlər. Hər bir birinci sinif şagirdi üçün məktəbdə özünü psixoloji cəhətdən rahat hiss etməsi çox mühümdür.

Bu gün məktəbəqədər yaşlı uşaqlara, hər şeydən əvvəl, yazı və oxunun öyrədilməsi valideynlər tərəfindən obyektiv və subyektiv səbəblərə görə çox təkidlə həyata keçirilir. Mən bir mütəxəssis kimi məktəbəqədər müəssisələrdə yazı və oxu təliminin aparılmasının əleyhinəyəm. Uşaq bağçalarında yazı və oxu təliminə hazırlıq aparılmalıdır ki, məktəbə gedərkən uşaq təlim yükünü daşımağa hazır olsun.

Uşaq yazının kolliqrafik qaydalarını məktəbdə müəllimdən öyrənməlidir. Çünki məktəbə müxtəlif səviyyəli ailələrdən, müxtəlif məktəbəqədər təhsil müəssisələrindən, həmçinin uşaq yaradıcılıq mərkəzlərində subyektiv qaydada hazırlıq keçmiş uşaqlar gəlirlər. Belə uşaqlarla işləmək, onlara yazı texnikasını öyrətmək ibtidai sinif müəllimi üçün çətin olur. Onlar məktəbə gedənədək hərflərin yalnız çap formasını tanımalıdırlar. Əlbəttə, məktəbəqədər biliksiz də keçinmək olmaz, amma daha vacib cəhətlər də vardır ki, bu da uşağın məktəb təliminə fiziki, psixoloji, sosial və intellektual cəhətdən hazırlanmasıdır.

Məktəbəqədər müəssisələrdə pedaqoji fəaliyyətin istiqaməti proqram-metodik təminatla bağlıdır. Strategiyaların müxtəlifliyi isə təlimi rəngarəng edir.

"Məktəbəqədər təhsil proqramı (kurikulumu)"nun hazırlanmasından sonra müxtəlif təhsil model və texnologiyalarından istifadə üçün geniş imkanlar açılır.

Bu pedaqoqların təşəbbüs və yaradıcılığının inkişafı üçün, həmçinin yeni proqramın tətbiqi üzrə yeni impuls verir. Məzmunun yeniləşməsinə və texnologiyaların tətbiqinə cəhd köhnə iş formalarından uzaqlaşmaq kimi izah olunur.

Ancaq praktik işçilər tərəfindən yeni proqramla işin çətinliyi, onların keyfiyyəti üçün yüksək məsuliyyət kifayət qədər tez

hiss edilir. Keçid dövrünün çətinliklərinə, təhsil sahəsində baş verən dəyişikliklərə baxmayaraq, Azərbaycan təhsil sisteminin ən yaxşı ənənələri və şübhəsiz, müsbət xüsusiyyətlər saxlanılmalıdır.

Məktəbəqədər təhsilin əsas prioritetləri: sağlamlığın qorunması və möhkəmləndirilməsi, bütün uşaqların inkişafı üçün əlverişli şəraitin təminatı, təlimin və tərbiyənin bazis məzmununun realizəsi zamanı öz fərdiliyinin saxlanılmasına və uşağın hüquqlarına hörmətin təmin edilməsidir. Rejimin qurulması və məktəbəqədər müəssisələrdə oyunun yeri, məşğələlərin, uşaq həyatının və fəaliyyətinin bütün növlərinin təşkilinin gigiyenik şərtləri ona uyğun olan istənilən proqram və pedaqoji prosesin əhəmiyyətli komponentidir.

Yeni məktəbəqədər təhsil proqramının (kurikulumunun) tətbiqi zamanı tədqiqatçıların nəzəri işlərinin elementlərindən istifadəyə və uşağın inkişafında pozitiv irəliləyişləri təmin etmiş ənənəvi texnologiyaların elementlərindən bəhrələnməyə istinad olunması zəruridir. İnnovativ yanaşmaların və ənənələrin uyğunluğu yeni proqramların üstünlüklərini azaltmır, əksinə, pedaqoji fikrin sonrakı inkişafını göstərir.

Məktəbəqədər təhsilin müasir məzmunu problemlərin həllinə sistemli yanaşma tələb edir. Məktəbəqədər təhsilin yeni keyfiyyətinə cəhd, səmərəli iş sisteminin formalaşdırılması üçün şəraitin yaradılması və onun əlçatanlığının təmin edilməsi məktəbəqədər təhsil sistemində kurikulumun geniş miqyaslı tətbiqi olmadan mümkün deyil.

*Rəyçi: prof. Y.Kərimov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, №5, 2013.

2. Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu. http://edu.gov.az 5 sentyabr 2009-cu il.

3. Azərbaycan Respublikasında məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı (2007-2010 -cu illər). Bakı, 12 aprel 2007-ci il.

4. Azərbaycan Respublikasında məktəbəqədər təhsil proqramı (kurikulumu), Bakı, 2014.

5. Kərimov Y. Seçilmiş əsərləri, I-IV cildlər. Bakı: Kövsər, 2007.

**Л.Джафарова**

**Состояние и перспективы дошкольного образования**

**Резюме**

Дошкольное образование - основа всей системы образования. Именно в этот период закладывается основа будущих знаний ученика. Также формируются социальные навыки, которые позволяет ребенку адаптироваться в ученическом коллективе.

**L.Jafarova**

**Pre-school education state and prospects of**

**Summary**

Pre-school education is the foundation of all education system, because it is at this stage that characterize the development of the foundations of personality laid the foundation of the future child. The main qualities, the main social skills during the preschool age personality is formed.

# ETİK MƏDƏNİYYƏT HƏR KƏSİN ƏSAS MƏNƏVİ KEYFİYYƏTİDİR

**VİDADİ XƏLİLOV**

***pedaqogika üzrə elmlər doktoru, professor,***
***Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü,***
***əməkdar müəllim***

***Açar sözlər:*** *etika, etik mədəniyyət, əxlaq, əxlaqın mahiyyəti, etik kateqoriyalar, xeyir-şər, borc, vicdan, şərəf, ləyaqət, fəzilət, qəbahət, ünsiyyət, davranış gözəlliyi, etiket, peşə etikası, müəllimin etikası.*

***Ключевые слова:*** *этика, этическая культура, мораль, значение морали, этические категории, добро и зло, долг, честь, достоинство, добродетель, предосудительный поступок, общение, обхождение, этикет, профессиональная этика, этика педагога.*

***Key words:*** *ethics, ethical culture, morality, essence of morality, ethical categories, the good, the bad, debt, honour, dignity, virture, blame, communication, behavior, ethics, professional ethics, teacher's ethics.*

İnsanın mənəvi dünyası onun formalaşmasında mühüm rola malikdir. Bu kontekstdə dövlət də mənəvi dünyası inkişaf etmiş vətəndaş yetişdirilməsini əsas məqsəd hesab edir. Bu prosesdə sivilizasiyanın dəyər göstəricilərindən sayılan, ictimai şüurun əsas formalarından olan əxlaqın mahiyyəti, qanunauyğunluqları, şəxsi və ictimai həyatdakı rolu zaman keçdikcə daha parlaq şəkildə nəzərə çarpır. Təsadüfi deyildir ki, dünyanın bir sıra ölkələrində bu sahədən bəhs edən etik fikirlər sistemi yaranmağa başlamışdır.

Xeyir-şər, fəzilət-qəbahət, borc, vicdan, şərəf, ləyaqət və digər əxlaqi etik kateqoriyalar insanın şəxsi və ictimai həyatının əsas keyfiyyət göstəriciləri kimi şəxsiyyətin mənəvi zənginliyində, ictimai məninin formalaşmasında mühüm rol oynadı. Beləliklə də etik görüşlər sistemi yarandı.

İctimai həyatın, mühitin, fəaliyyət sahələrinin əxlaqi dəyərləri tədricən etikanın mühüm bir sahəsini təşkil edən etiket və peşə etikası qaydalarının inkişafına zəmin yaratdı. Məlum oldu ki, hər bir peşənin özünəməxsus etikası, etik qaydaları var. Həmin məsələlərin mahiyyətini, bir-biri ilə əlaqədə olmasını şərh etməzdən qabaq bir qədər əvvələ, tarixin qədim dövrlərində görkəmli şəxsiyyətlərin həmin məsələlərə münasibətini diqqət mərkəzinə gətirmək lazım gəlir. Elə buradaca qeyd edək ki, insanlıq-qruplar, irqlər, tayfalar, millətlər yaranandan müxtəlif nəsillərdən olan insanlar ətraf aləmi - ayrı-ayrı əşya və obyektləri görməyi, onların əsas əlamətlərini, yaxşını-pisdən, xeyiri-şərdən fərqləndirməyi bacardıqları anlardan baxışlar, mövqelər də müxtəlif olmuşdur. Hələ bizim eranın birinci minilliyində yer üzündə əxlaqi-mənəvi münasibətlərin daha geniş yer almasının təminatçısı rolunu oynayan Zərdüştlüyün müqəddəs kitabı sayılan, Orta Asiyada, İranda və Azərbaycanda geniş yayılan Avestada əxlaqi meyillər,

insan adını uca tutan fikirlər, nəzəriyyələr daha geniş vüsət almışdır.

“Avestaya görə dünyada həm maddi, həm də xəyali olan hər şey xeyir və ya şər başlığına malik olmaqla iki qismə ayrılır. Baş Allah Ahura Mazda (Hürmüzd) xeyirxah, dağıdıcı ruh, Anhra Manyu (Əhrimən) –şər başlanğıcın ifadəsi və ya rəmzidir. İnsan bu və ya digər mövqeyi seçməkdə sərbəstdir” (1, səh.35).

Hələ qədim dövrdə insanlıq-ünsiyyətlə bağlı başlıca məsələlərə bu cür yanaşılması, demokratik meyillərin hələ o dövrdə xüsusi vurğu ilə nəzərə çatdırılması haqqında da düşünmək lazımdır. İstər-istəməz belə qənaətə gəlirsən: Qadir Allah yaratdıqlarını yaxşı yaradıb. Bütün günahlar, xoşagəlməz hadisələr isə sonralar yaşadıqları mühitin şeytan cismində və şeytan fitvası ilə yaşayan insanların – şər qüvvələrin təsiri ilə üzə çıxıb.

İnsan o vaxt yer üzünün ən qadir, yaradıcı qüvvəsinə çevrilir ki, o, qabaqcadan edəcəyi hər bir hərəkətin nə ilə nəticələnəcəyi, insanlara nə kimi xeyir verəcəyi imkanları haqqında düşünür. Müqəddəs kitabımız “Qurani-Kərim”in “Fatihə”, “Ali-İmran”, “Nəsr” və digər surələrində öz əksini tapan ayələrdə deyilən kəlamlar əsl insana - insanlıq yolunu göstərir.

“Ey insanlar, yeyin yer üzündə olan halal və təmiz şeylərdən, yeriməyin şeytanın yerişini… Ağrılı bir əzab gözləyir onları. Onlar o kəslərdir ki, doğrunu verib, çaşqınlığı, məğfirəti (günahdan keçmə, bağışlama) verib, əzabı satın almışlar…

Yaxşı o kəsdir ki, kitaba və peyğəmbərlərə iman gətirdi” (“Fatihə” surəsi. 168, 174, 175, 177-ci ayələr).

Dünyagörüşündən, təhsil, peşə səviyyəsindən asılı olmayaraq hər kəs bu müqəddəs sözlərin təsiri ilə yaşayır, əməli fəaliyyət göstərirsə, deməli, istər-istəməz əxlaqi kamilliyə, əxlaqi davranış normalarının məcmusundan ibarət olan etik mədəniyyətə yiyələnirlər. Belələri əxlaqi kamilliyin, ünsiyyət, davranış mədəniyyətinin əsas carçısına, fəal qüvvəsinə çevrilirlər.

Sözümüzün bu yerində Həzrəti Məhəmməd Peyğəmbər əleyhissəlamın hədislərindən bir neçəsini diqqət mərkəzinə gətirməyi savab sayırıq:

Bir nəfər Həzrəti Peyğəmbərdən: “Ya Rəsulallah, insanların ən xeyirlisi kimdir? – deyə soruşdu.

- Ömrü uzun, əməli gözəl olandır.

- Bəs insanların ən pisi kimdir?

- Ömrü uzun əməli bəd olandır” (2, səh.31).

Bu sözlərin mənasına, deyim tərzinə diqqət yetirdikcə ulu peyğəmbərimizin çox sadə deyiminə, lakin tarixin müxtəlif mərhələlərində yolunu azacaq insanlara düzgün istiqamət verəcəyinə bir daha əmin olursan.

Doğrudan da ömrü uzun, əməli bəd, daima şər qüvvələrin girdabında baş girləyən insanlardan daha nə gözləmək olar? Bir də unutmayaq ki, bəd əməlin mahiyyəti bir epizodla, bir hərəkətlə məhdudlaşmır. Bəd əmələ qurşananlar, eyni zamanda rəzilliyi, qəbahəti, qara yaxmaları ilə vicdanlı əsli-köklü insanlar arasında nifaq toxumu səpməklə məşğul olurlar. Belələri unudurlar ki, insanın davranışının xeyirli və zərərli cəhəti elə ilk ünsiyyət anlarından başlayır. Yazıçı, jurnalist Davud Dəmirli hələ keçən əsrin 80-ci illərinin sonunda yazırdı:

“Dilimizdə işlənən “üns” və “ünsiyyət” ərəb sözü olub bir-birinə qovuşma, dostlaşma, mehribanlıq mənasını verir. Ünsiyyət etik-psixoloji problem olmaqla yanaşı insan fəaliyyətinin bütün sahələrini əhatə edir. Ünsiyyət birlikdir, sənətdir, insanın yaradıcılıq prosesidir. Müdrik adamlar ünsiyyətin əhəmiyyətini dərindən başa düşmüş və onu həmişə yüksək qiymətləndirmişlər” (3, səh.19).

Dünyanı heyran edən dahi Nizaminin çox geniş etik-estetik fikirlər ensiklopediyası kimi dəyərləndirilən əsərlərini oxuduqca ən

* 3

ülvi hislərlə yaşamağın heyrətindən vəcdə gəlirsən:

Xeyirlə-şər izləyir hər bəşəri əzəldən,
Xeyir-xeyri tapandır, şər də şəri əzəldən…
Birinin şirinsə sözü, söhbəti,
Başqa şey istəmə, bəsti ülfəti…
Oylə bir ixtiyar olsaydı məndə
Qoymazdım bəndəyə möhtac bir bəndə…
Xoş ətirlər saçmaq istəyən adam,
Gültək xoş xasiyyət olmalı müdam!

(4, səh.12, 14, 16).

Nizaminin hikmət dünyasından qanadlanan bu sözlər, misralar sözün, sənətin ülviyyətinə qiymət verməyi və onların təsiri ilə yaşamağı bacaranlar üçün əsl həyat, ülviyyət-ünsiyyət məktəbidir, - desək, əlbəttə, yanılmarıq.

Nümunə gətirdiyimiz misraların, beytlərin hər biri isə insanı əxlaqi zənginliyə istiqamətləndirən söz-sənət inciləridir. İnsanın saf, əxlaqi yetkinliyi olmadan onun gələcək xoşbəxt taleyindən danışmaq nəzəri cəhətdən belə mümkün deyil. Çünki əxlaq – ictimai şüurun əsas diqqət mərkəzində olan formalarından biridir. Etika isə əxlaqın mahiyyəti, formalaşması yollarından bəhs edən dünyəvi-bəşəri elmdir.

Yeri gəlmişkən bir cəhəti də qeyd etmək lazım gəlir. Etikadan-şəxsiyyətin etik mədəniyyətindən danışarkən “etiket” sözünə – terminınə də istinad olunur. Çünki bu söz də mahiyyəti etibarilə etika ilə, əxlaqla sıx bağlıdır. Müxtəlif xarakterli ensiklopediyalarda, lüğət məlumat kitablarında göstərilir ki, etiket müxtəlif ölkələrdə, saraylarda, diplomatik dairələrdə və digər mötəbər yerlərdə, iri yaşayış bölgələrində qəbul edilmiş davranış və nəzakət formalarıdır.

Müxtəlif nəsildən olan insanların etik təsir vasitələri ilə mənəvi zənginliyi böyük mütəfəkkirlərin, söz-sənət ustalarının həmişə diqqət mərkəzində olub. Görkəmli əxlaq nəzəriyyəçisi, ensiklopedik bilik sahibi – “Əxlaqi Nasiri” ilə dünyanın müxtəlif qəbildən olan insanlarını heyran edən X-XI əsrdə yaşayıb yaratmış Nəsirəddin Tusi də riyaziyyat, həndəsə, astronomiya, mineralogiya və sair fundamental elm sahələri ilə yanaşı, etika elminin başlıca istiqamətlərini də olduqca inandırıcı, həyatı mövqedən işıqlandırmağa nail olmuşdur. Maraqlı cəhət budur ki, N. Tusi irsinin tədqiqatçılarından sayılan alimlərimizdən olan Mehri Məmmədova hələ 1987-ci ildə “Elm və həyat” jurnalınının 9-cu nömrəsində dərc etdirdiyi “Nəsirəddin Tusinin etik görüşləri” adlı məqaləsində şagirdlər üçün nəzərdə tutduğu “Öyrənənlərin etikası”əsərinin əsas mahiyyəti üzərində dayanaraq yazır:

“Əsər elm və fəzilətin mahiyyəti, səy və çalışqanlıq, itaətkarlıq, təhsil almağın dövrü, qayğıkeşlik və nəsihət, pənah aparmaq, hafizənin irsən keçməsi, ruzi əldə etmək kimi başlıqlara bölünür.

Cəmiyyətin inkişafında müəyyən rol oynayacaq insanların yetişməsində faydalı məsləhətlərlə zəngin olan bu risalədə təhsil və tərbiyənin əhəmiyyətindən bəhs edilir: Təhsili uşaq yaşlarından savadlı və kamil müəllimdən almaq məsləhətdir. Savadlı şəxs eyni zamanda insani xüsusiyyətlərə malik olmalıdır. İnsan o zaman həqiqi alim sayılır ki, onda bilikdən əvvəl fəzilət, mərifət, əxlaq da öz əksini tapsın. Elmi olmayan kəs tam mənasında anlaşılan insan da ola bilməz. İnsanı bütün canlılardan ayıran amil elmdir. Elmi çıxanda insan ilə digər canlılar arasında elə bir fərq qalmır” (5, səh.16).

Bu da maraqlıdır ki, böyük alim həmin əsərində problemin çox mühüm bir cəhətindən, uşaqlıq illərində saf, təmiz qəlbli insanlarla ünsiyyət və ülviyyəti valideynlərin diqqət mərkəzinə gətirərək yazır: “Pis yoldaş ilandan betərdir. Başardıqca pis yoldaşdan qaç. Bəd ilan sənin təkcə bədənini zəhərləyər, pis yoldaş isə həm canını həm də imanını zəhrləyər” (3, səh.16).

Əxlaq-etika ilə bağlı bu cür dəyərli fikirlərin sayını artırmaq da olar. Ölkəmizdə əxlaqi saflığın əsası sayılan fəzilət və onun

əks tərəfi hesab edilən qəbahətin mahiyyəti ilə bağlı fundamental əsərləri ilə tanınan fəlsəfə üzrə elmlər doktoru, professor Ziyəddin Göyüşov yazır:

"İnsanları fəzilətə öyrətmək üçün əvvəlcə onları fəzilətə heyran olmağa, fəziləti lazımınca qiymətləndirməyə, fəzilətli şəxsə hörmət və ehtiram etməyə öyrətmək lazımdır. Məlumdur ki, hər bir insan başqalarından fərqlənməyə, üstün olmağa çalışır. Bunun üçün bəziləri var-dövlət qazanmağa, bəziləri yüksək vəzifə tutmağa və i.a. cəhd edir… cəmiyyətdən kənarda heç bir fəzilət və qəbahət yoxdur. Nə ədalət, nə şəfqət, nə insanpərvərlik, nə alicənablıq, nə comərdlik, nə də sadəlik və təvazökarlıq cəmiyyətdən kənarda təsəvvür edilə bilməz" (6, səh.48).

Həyatı müşahidələrin nəticəsində deyilən bu fikrin, bu düşüncənin mənası haqqında da düşünməli olursan. Bax elə bu prosesdə ulularımızın "dünya gör-götür dünyasıdır" deyimi də yada düşür. İstər-istəməz düşünürsən, müasir uşaqların, məktəblilərin əxlaqi görüşü, etik mədəniyyəti səviyyəsi haqqında nə demək olar? Təəssüf və təəccüb doğuran cəhət olsa da həmin suallara müsbət cavab vermək olmur. Mövcud vəziyyətin çox mühüm bir cəhəti ətraf aləmin, mühitin qeyri-etik cəhətləri, əndazəsiz geyim dəbləri, bahalı müxtəlif telefon aparatları, metro qatarlarında, avtobuslarda qulaqlarına qulaqcıq taxan, sanki ətrafındakıları görməyən yeniyetmələr, məktəblilər, internet şəbəkələrinə ötürülən yazılar, mesajlar, təhqiramiz böhtan dolu sözlərin ayaq açıb yeridiyi bu dövranda necə edək ki, insan əndazədən çıxmasın?...

Bax elə bu anda tanınmış Amerika yazıçısı Uilyam Folkerin sözləri yada düşür. O deyirdi: "Nə qədər ki, gec deyil və insan iki ayaqlı heyvana çevrilməyib, şəxsiyyəti simasızlıqdan xilas etmək lazımdır…"

Etiraf etmək nə qədər çətin olsa da son vaxtlar məktəb mühitində etik maarifçiliyə lazımi diqqət yetirilməməsi, etik münasibətlərin heç də həmişə gözlənilməməsi, bu sahədə ahəngdarlığın pozulması halları da nəzərə çarpır.

İstər müəllim-şagird, istərsə də müəllim-müəllim, müəllim-valideyn münasibətlərindəki qeyri-səmimi hislərin baş verməsinə təsadüf olunur. Qaraqabaq, dili acı, kimdənsə, nədənsə incik olan müəllimi şagirdlər və onların valideynləri heç zaman sevməmişlər. Buna görə də ağlagəlməyən problemlər yaranmışdır. Əgər indiki dövrdə şəxsiyyətyönümlü tərbiyədən söhbət gedirsə və pedaqoji fəaliyyətin qiymətləndirilməsində əsas prinsiplərdən sayılırsa xeyirxahlıq, nikbinlik, hərəkətverici qüvvə kimi dəyərləndirilməlidir.

Belə bir cəhəti də unutmaq olmaz ki, ixtisasından asılı olmayaraq pedaqoqlar üçün ali tədris kitabı sayılan və müxtəlif illərdə nəşr olunan "Pedaqogika", "Məktəb pedaqogikası" kitablarında müəllim şəxsiyyətinə, onun elmi dünyagörüşünə, fəaliyyət istiqamətlərinə verilən tələblərə xüsusi diqqət yetirilmişdir. Problemin belə bir cəhəti də maraq doğurur ki, hələ keçən əsrdə ibtidai siniflər üçün dərsliklərdə də müəllim-şagird etikasının əhəmiyyətli cəhətləri diqqət mərkəzinə gətirilmişdir. Budur qarşımızda ibtidai sinif şagirdləri – xüsusilə 1-ci siniflər üçün çox zəruri olan bir dərslik var: "Hüsnxət".

Ə.M. Qafarlı tərəfindən 1-ci sinif şagirdləri üçün yazılan və 1950-ci ildə nəşr olunan, şagirdlərə gözəl xətlə yazmaq bacarığını aşılayan həmin dərs vəsaitinin sonu "Unutmayın" başlığı altında aşağıdakı sözlərlə tamamlanır:

Uşaqlıqdan vaxtınızı
Düz bölməyə adət edin.
Dərsinizə öz vaxtında
Üstü-başı təmiz gedin.
Müəllimə hörmət edin,
Sevin hər vaxt intizamı.

İntizamlı uşaqları
Əzizləyib sevir hamı. (6, səh.24)

Daha sonra otaq bitkilərinin məktəb həyatını necə gözəlləşdirməsindən bəhs olunur. Şagirdlərdən birinin dilincə: "Mən beş qutu düzəltdim. Bu qutularda gül toxumu və şitil əkdim. İndi onlar göyərmişdir. Bizim dəhlizdən cürbəcür gül ətri gəlir. Mən bitkiləri sevirəm və onları qoruyuram" (7, səh.27).

Kitab deyir: "Uşaqlar məni açın, oxuyun, ancaq əzməyin, çirkləndirməyin, cırmayın, xarab etməyin. Mən sizi sevdiyim kimi, siz də məni sevin" (7, səh.27).

Sual olunur, uşaqları 1-ci sinifdən məktəbli etikasına yiyələnməyə çağırış ruhunda səslənən bu sözləri nə həmin sözlərin əks etdirildiyi dərs vəsaitini unutmaqla, əgər belə demək mümkünsə aradan çıxartmaqla nə qazanmışıq? Keçmiş SSRİ məkanında, o cümlədən Rusiyada, Belarusiyada, Pribaltika respublikalarında, Moldaviyada, Özbəkistanda, Qazaxıstanda və digər respublikalarda şagirdlər məcburi dərs və ya fakültətiv məşğələlər üçün etika üzrə xüsusi dərs vəsaitləri çap edilirdi.

Ali və orta ixtisas məktəblərində "Etikanın əsasları" üzrə kurs keçirilirdi. Tələbə şəxsiyyətinin mənəvi zənginliyinə müsbət təsir göstərilirdi. Hamısı unudulub, sıradan çıxarılıb (peşə texniki məktəbləri istisna olmaqla).

Görəsən uzun müddət müsbət, dəyərli ənənəyə çevrilmiş həmin işlər, həmin sistem kimlərin xoşuna gəlməyib? Təəccüblü burasıdır ki, bilavasitə Respublika Təhsil Nazirliyinin nəzdində olan liseylərdə, gimnaziyalarda keçirilən "Etika", "Etika və etiket", "Estetika" fənlərinin tədrisinə də son qoyulmuşdur. Mövcud vəziyyətin əsas səbəbini isə ölkəmizin təhsil sistemində kurikulum islahatının həyata keçirilməsi və bu əsasda hazırlanan tədris proqramı ilə əlaqələndirirlər. Təəssüf, çox təəssüf! …

Tarixin sınaqlarından çıxan, mühüm əhəmiyyət kəsb edən ənənəyə beləmi riayət edirlər? Ancaq təsəllimiz də var. Ümidvarıq ki, Azərbaycan Respublikası təhsil nazirinin 16 may 2014-cü il tarixli 600 nömrəli əmri ilə təsdiq edilmiş "Müəllimlərin etik davranış qaydaları" məktəb, təhsil mühitində etik davranışın daha da inkişafına, müasir tələblər səviyyəsində formalaşmasına qüvvətli təsir göstərəcək.

"Ümumi müddəalar", "Etik daıvranış prinsipləri və onlara uyğun tələblər", "Müəllim şəxsiyyəti", "Münasibətlər", "Müəllim andı", "Etik davranış qaydalarına riayət olunmasının təmin edilməsi" bölmələrinin hər birində müasir təhsil sistemimizdə əsas aparıcı rol oynayan müəllimlərin şəxsiyyət nümunələri, şəxsiyyət zənginliyinə verilən tələblər daha konkret şəkildə nəzərə çatdırılmışdır. Həmin bölmələr, başlıca istiqamətlər üzrə qarşıya qoyulan vəzifələrin hər biri mahiyyət dolğunluğuna görə diqqəti cəlb edir.

"Etik davranış prinsipləri və onlara uyğun tələblər" bölməsində müəllimin mədəni davranışı ilə bağlı etik keyfiyyət göstəriciləri bir daha müqəddəs peşənin aliliyini gözlərimiz önünə gətirir:

"… Müəllim təhsilalanlarla, rəhbərlik və həmkarları ilə davranışda nəzakətli, xeyirxah, diqqətli və təmkinli olmalıdır. Müəllim peşə fəaliyyəti ilə əlaqədar iradları, tənqidi fikirləri qəbul etməli, qiymətləndirməli və onlardan düzgün nəticə çıxarmalıdır. Müəllim səmimi, çalışqan, intizamlı, təşəbbüskar olmalı, xarici görkəminə, geyiminə xüsusi fikir verməli, hər zaman səliqəli olmalıdır" (1).

Əlavə izaha, şərhə ehtiyac varmı? Əlbəttə, yox. Ancaq onu əlavə edək ki, müəllim tərbiyəçi adını daşıyan hər kəs qəlbinin səsinə qulaq assın, əqidəsi, vicdanı, yüksək humanizmi, dərin vətənpərvərlik əzmi ilə çalışsın, nümunə göstərilməyə layiq olsun. Gəlin görkəmli pedaqoq, maarif fədaisi Sultan

Məcid Qənizadənin sözlərini xatırlayaq. Belə nəql edirlər ki, o, sevimli şagirdləri ilə görüşərkən deyirmiş: Sabahınız xeyir gələcəyin müəllimləri, həkimləri, mühəndisləri, alimləri!

Müəllimlik peşəsini daima yüksək qiymətləndirən S.M. Qənizadənin fikrincə müəllimin evi kitabxanadır, sazı və nəğməsi şagirdlərinin sədasıdır, istirahəti dəftərlərin təshihi, qazancı isə millətin məhəbbəti və ehtiramıdır.

Müəllimin peşəkarlıq səviyyəsini daim yüksəltmək qayğısına qalması da onun etik mədəniyyətinə daxildir. O, tələb olunan yüksəklikdə davam gətirmək üçün öz bilik və bacarıqlarını, pedaqoji, psixoloji və metodiki hazırlığını daim artırmalı, təhsildə baş verən yeniliklər, tətbiq olunan müasir texnologiyalarla tanış olmaq üçün dövrün pedaqoji mətbuatın, yeni nəşr olunan elmi-pedaqoji, metodiki ədəbiyyatı daim izləməli, özünün elmi-metodiki, etik və estetik arsenalını zənginləşdirməyə çalışmalıdır.

Gəlin unutmayaq ki, müəllim şagird üçün, el üçün heyranedici təəccüb oyadan bəşəri kamilliyin ali nümunəsidir.

*Rəyçi: prof. O.Rəcəbov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Müəllimlərin etik davranış qaydaları.//Azərbaycan məktəbi, № 3, 2013.

2. Azərbaycan sovet ensiklopediyası. I cild. Bakı, 1976.

3. Az söylə, söz söylə (tərtibçilər: A. Abbasov, S. Həsənova). Bakı: Maarif, 1992.

4. Dəmirli D. Bizə hər şeyin dəxli var. Bakı: Azərnəşr, 1987.

5. Nizaminin hikmət və nəsihətləri. Bakı: Yazıçı, 1981.

6. Məmmədova M. Nəsirəddin Tusinin etik görüşləri. //Elm və həyat, 1987, № 9.

7. Göyüşov Z. Fəzilət və qəbahət. Bakı: Azərnəşr, 1972.

**В.Халилов**

**Этическая культура - основное моральное качество каждого**

**Резюме**

В статье указывается, что каждая специальность имеет свои этические правила. Автор касается вопросов развития и формирования этической культуры.

**V.Khalilov**

**Ethical culture is everyone's moral qulity**

**Summary**

In the article it is spoken about the ethical rules of each profession. Formulation and development of ethical rules is also noted here.

# DÖVLƏT STRATEGİYASI TƏHSİLİMİZİ YENİ UĞURLARA YÖNƏLDİR

**Aida Salahova**
***Azərbaycan Dövlət Neft Akademiyasının dosenti, kafedra müdiri***

Ölkə iqtisadiyyatının dinamik inkişafı, sənaye potensialının genişlənməsi, yeni müəssisələrin açılması qarşıdakı illər üçün yüksəksəviyyəli kadrların hazırlanmasını tələb edir. Bütün bunların əsası təhsil sistemində qoyulur. Azərbaycan Respublikası Prezidenti İlham Əliyev demişdir: "Əgər inkişaf etmiş ölkələrin təcrübəsinə nəzər salsaq görərik ki, həmin ölkələrin uğurlarının təməlində ideya, fikir, innovasiya, elmi-texniki tərəqqi dayanır. Ölkəmizdə də müxtəlif istiqamətlərdə islahatlar apararkən müasirləşməyə üstünlük verilir. Müasir dövlətin qurulması elmi inkişaf olmadan mümkün deyildir". İstər ümumtəhsil, istərsə də ali və orta ixtisas məktəblərində təhsilimizin ən inkişaf etmiş ölkələrdəki təhsil sisteminə yaxınlaşması təhsil islahatının əsas məqsədlərindən biridir. Azərbaycan Respublikasının təhsil naziri Mikayıl Cabbarov demişdir: "Müasir dövrdə qloballaşan dünyanın tələblərinə uyğun təhsil sistemini formalaşdırmaq ölkənin beynəlxalq rəqabətliliyini şərtləndirən əsas amillərdəndir." Bu baxımdan ölkə ictimaiyyətini düşündürən, təhsil sahəsi ilə maraqlanmış hər kəsi narahat edən məsələlərin köklü həllini nəzərdə tutan "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın qəbul olunması mühüm əhəmiyyət kəsb edir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin 24 oktyabr 2013-cü ildə imzaladığı bu mühüm dövlət sənədində təhsilin ən mühüm məsələləri, onun inkişaf istiqamətləri dəqiq və aydın müəyyənləşdirilmişdir. Bütün bunlar bir daha göstərir ki, təhsil işçilərindən gözləntilər olduqca böyükdür.

Artıq dünyada hər sahədə rəqabət aparıldığı kimi, təhsil sahəsində də rəqabət güclüdür. Məhz ona görə də, ildən-ilə ölkə Prezidentinin qayğısı nəticəsində infrastruktur əsaslı şəkildə yeniləşdirilib, məzmun, dərsliklər, monitorinq-qiymətləndirmə sistemi sahəsində nailiyyətlər əldə olunmaqdadır. Hazırda təhsilin inkişafı üzrə Dövlət Strategiyasında irəli sürülən tələblərə uyğun olaraq, digər həlli vacib olan məsələlərlə bərabər fənn kurikulumlarının təkmilləşdirilməsi və yeniləşdirilməsi istiqamətində işlər özünün ilk nəticələrini verməkdədir. Artıq pedaqoji mətbuatda, elmi-praktik konfranslarda, müxtəlif pedaqoji tədbirlərdə düşüncə və təfəkkür məktəbinə doğru atılmış addımların nəzəri-konseptual, eləcə də inkişafetdirici xarakterindən danışılır, müzakirələr aparılır, nəticələr çıxarılır. Müstəqillik dövründən keçən qısa zaman kəsiyində Azərbaycanda təhsil müəssisələrinə ardıcıl diqqət yetirilir. Dövlət siyasətində təhsil məsələləri, demək olar ki, prioritet məsələlərdən birini təşkil edir.

Həmişəyaşar Azərbaycan dövlətinin qurucusu, xalqımızın müdrik rəhbəri, türk dünyasının böyük oğlu Heydər Əliyev tərəfindən əsası qoyulan iqtisadi, sosial və mədəni islahat proqramlarının elmi əsaslarla inkişaf etdirilməsi strategiyasını uğurla davam etdirən möhtərəm Prezidentimiz İlham Əliyev ciddi elmi islahatlara rəvac verdi. Bu da, şübhəsiz, Azərbaycanda yeni təhsil müəssisələrinin açılmasına, komplekslərin yaradılmasına, mövcud olanların əsaslı və cari təmirinə, müasir dəyərlərdən qidalanan kadr potensialının yetişməsinə, ali və orta məktəblərin maddi-texniki bazasının inkişaf etdirilməsinə, Avropa təhsil məkanına inteqrasiya prosesinin sürətləndirilməsinə, inkişaf etmiş dövlətlərin bu

sahədəki qabaqcıl təcrübəsinin yayılmasına, ümumtəhsil məktəblərində, ali təhsil müəssisələrində kompyuter və informasiya texnologiyalarının geniş tətbiq edilməsinə və kompleks tədbirlərin həyata keçirilməsinə xidmət etmişdir. Belə dövrdə mövcud olan uğurların qorunub saxlanması mühüm amillərdəndir.

Gənclərimizin virtual dünyaya çıxmasının təmin edilməsi, onların informasiya texnologiyaları ilə işləmək vərdişlərinə yiyələnmələri üçün aparılan məqsədyönlü tədbirlər Azərbaycanda informasiyalı cəmiyyətin inkişafı baxımından böyük əhəmiyyət daşıyır. Ölkəmizdə təhsilin keyfiyyətinin artırılmasına, dünya təhsil sisteminə inteqrasiyasına geniş imkan yaradılmış, Azərbaycan əhalisini informasiyalı cəmiyyətin üzvlərinə çevirən proqramlar qəbul edilmişdir. Bu proqram çərçivəsində müasir rabitə və informasiya texnologiyaları ölkənin hərtərəfli inkişafına, əhalinin intellektual səviyyəsinin yüksəldilməsinə, həmçinin dünyada baş verən inteqrasiya prosesinə daha aktiv cəlb olunmasına geniş imkanlar yaradır.

İndi informasiya-kommunikasiya informasiyalarının tətbiqi sahəsində ölkəmiz regionda liderlik mövqeyindədir və bu mövqe günü-gündən artır.

Prezidentimizin ciddi səyi nəticəsində dövlətimizin gələcəyi olan təhsil sahəsi müasirləşir, yeniləşir, maddi-texniki bazası möhkəmlənir, tədris prosesi inkişaf edir. Bu işlərin yerinə yetirilməsində Azərbaycanın iqtisadi imkanları, ildən-ilə artan büdcəmiz, investisiya xərclərinin artırılması mühüm rol oynayır. Bunların hamısı belə düşünməyə imkan verir ki, Prezidentimiz qeyd etdiyi kimi həm maddi-texniki bazanın möhkəmləndirilməsi, həm də tədris prosesinin yeniləşdirilməsi paralel şəkildə həyata keçirilməlidir. Beynəlxalq əməkdaşlığa həssaslıqla yanaşan möhtərəm Prezidentimiz İlham Əliyev Bolonya prosesinə qoşulan Azərbaycan təhsil sistemində tələbə mübadiləsinin sürətləndirilməsinə toxunaraq Azərbaycan gənclərinin dünyanın aparıcı ali məktəblərində oxumalarının vacibliyini ön plana çəkir. Xaricdə təhsil alan gənclərin dövlət vəsaiti hesabına təhsil almaları üçün bu yaxınlarda verdiyi xüsusi fərman bir daha buna əyani sübutdur. Prezident İlham Əliyevin ən inkişaf etmiş ölkələrin təcrübəsindən istifadə edərək ölkənin inkişafında aparıcı rol oynayan iqtisadi inkişaf potensialımızın intellekt potensialına çevrilməsi üçün şərait yaratmasını, gənc nəslin dünyanın ən müasir standartlara cavab verən şəraitdə oxuyub, bilik almaları üçün gələcəkdə də mühüm işlər görəcəyi biz müəllimləri sevindirir.

Azərbaycan müəllimləri təhsilimizi, onun xoşbəxtliyini, gələcəyini Prezidentimiz İlham Əliyevin təhsilə, təhsil işçilərinə göstərdiyi xeyirxah əməllərində görür. Ona görə də təhsil işçiləri daim onun fikirlərini dəstəkləyir.

Təhsilin forma və məzmunca yeniləşməsi prosesi, eyni zamanda, yeni dövrün tələblərinə cavab verən təhsil infrastrukturunu ən qabaqcıl təhsil sisteminə uyğun qurmaq məqsədi ilə dövlət büdcəsindən ən böyük vəsaitin ordu quruculuğundan sonra məhz təhsilə ayrılması ölkə başçısının bu sahənin milli inkişaf və tərəqqi prosesindəki müstəsna rolunun adekvat dəyərləndirilməsindən xəbər verir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müəyyənləşdirdiyi bütün ümummilli tədbirlərin həyata keçirilib planlaşdırılmasında Hedər Əliyev fondunun prezidenti, YUNESKO və İSESKO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın xidmətləri misilsizdir. Dövlət başçımızın irəli sürdüyü bütün təşəbbüslər və onun rəhbərliyi ilə görülən işlər məhz mövcud potensialın insan kapitalına çevrilməsində, Azərbaycanın sivil dünyanın reallıqları ilə ayaqlaşmağı bacaran yüksək intellektual potensiala, geniş dünyagörüşə malik vətən-

daşlarının tərbiyəsində, milli-mənəvi dəyərlərimizin qorunaraq gələcək nəsillərə çatdırılmasında, Azərbaycan mədəniyyətinin dünya mədəniyyətinə inteqrasiyasında xüsusi rol oynayır.

İnformasiya və kommunikasiya texnologiyalarının tətbiqi, elektron məktəbin yaradılması, elektron lövhələrdən istifadə olunması, təhsil işçilərinin ixtisas səviyyəsinin yüksəldilməsi, kadr hazırlığı, təhsilin idarə olunması üçün atılan addımlar, biliyin qiymətləndirilməsi istiqamətində həyata keçirilən layihələr buna əyani sübutdur.

"Elektron məktəb" layihəsinin tətbiq edilməsi təhsil sisteminin çevik idarə olunmasına, valideyn-məktəb əlaqələrinin möhkəmləndirilməsinə, təhsil müəssisələri arasındakı elektron əlaqələrin genişləndirilməsinə və ümumilikdə şagirdlərin davamiyyəti və nailiyyətləri haqqında dərhal məlumat almaq üçün zəmin yaradır.

Təhsilimizin inkişafı üçün bir sıra çox mühüm tədbirlər həyata keçirilmişdir. Tədris sisteminin, təhsil mühitinin dəyişdirilməsi, sağlamlaşdırılması istiqamətində mühüm addımlar atılmışdır. Paytaxt müəllimləri üçün keçirilən sınaq imtahanları razılıqla qarşılanmışdır. Müəllimlərin sınaq qiymətləndirilməsinin növbəti mərhələsi bütün ölkə üzrə tətbiq olunacaqdır. Məktəblərin maddi-tədris bazası da möhkəmlənir. Yeni məktəblərin tikintisinə, məktəblərin cari təmirinə diqqət artırılmışdır. İdarəetmə sahəsində dəyişikliklər də diqqətəlayiqdir. Müasir idarəetmə səviyyəsi üçün tam imkan və şərait yaradılmışdır.

Təhsilimiz beynəlxalq aləmdə gedən proseslərə inteqrasiya edir, 30-dan çox ölkə ilə təhsil sahəsində müqavilələr imzalanmışdır. BMT və digər beynəlxalq təşkilatların dəstəyi ilə 70-dək proqram və layihə həyata keçirilmişdir.

Ümumtəhsil sistemində əldə edilmiş nailiyyətlər abituriyentlərin ali məktəbdə təhsillərini uğurla davam etdirməsinin təməl daşıdır. Bu baxımdan ali məktəbdə mütəxəssis hazırlığı sistemi də keyfiyyətcə yaxşılaşır.

Azərbaycan xalqını işıqlı və firavan gələcəyə aparan təhsil sisteminin dünya standartlarına çatdırılması istiqamətində görülən işlər qarşıdakı illərdə də möhtərəm Prezidentimiz İlham Əliyevin rəhbərliyi altında inkişaf tempini artıraraq mütəxəssis hazırlığı səviyyəsinin yüksəldilməsinə inam yaratmışdır.

*Rəyçi: dos. İ.Cavadov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. //Azərbaycan məktəbi, 2013, №5.

2. Azərbaycan müəllimlərinin XIV qurultayının materialları. //Azərbaycan məktəbi, 2014, №1.

3. Cabbarov M. Təhsil sistemi milli dəyərlər və peşəkar kompetensiyalara malik Azərbaycan vətəndaşı yetişdirməlidir. //Azərbaycan məktəbi, 2013, №5.

**А.Салахова**

**Государственная Стратегия направляет образование врусло новых успехов**

**Резюме**

В статье повествуется о важности реформы образования в средних и высших школах и об удачах в этой области. Отмечаются пути развития качества образования.

**A.Salahova**

**State Strategy focuses on successes**

**Summary**

The article is dedicated to the importance and success of educational reforms. The ways of enhancing the quality of education is emphasized.

**Pedaqogika, psixologiya**

# ŞAGİRD ALƏMİNİN "DÜNYAYA AÇILAN MƏNZƏRƏSİ"

**Əbdül Əlizadə**
***psixologiya üzrə elmlər doktoru, professor***

Dərsliyi füsunkar şagird aləminin "dünyaya açılan pəncərəsi" adlandırırlar. Bu, obrazlı deyim olsa da, uşağın bir şəxsiyyət kimi formalaşmasında dərsliyin əhəmiyyətini dəqiq səciyyələndirir. Zamanın filosofları və sosioloqları, psixoloqları və pedaqoqları da dərsliyin dəyərini həmişə bu ölçülərlə mənalandırıblar.

Dərslik şagird üçün yazılır. Lakin məktəb təcrübəsində bərqərar olmuş ənənələr axarında ondan həm şagird, həm də müəllim istifadə edir.

Şagird üçün dərslik bilik mənbəyidir. Müəllim isə dərsliyə ali təhsilli mütəxəssis kimi müraciət edir, əslində o, dərslikdə verilmiş materialları daha dərindən və ətraflı bilir, ancaq onları özününküləşdirir, dərslikdən dərsin "müəllim ssenarisini" yazmaq üçün istifadə edir.

Əgər dərsi özünəməxsus tamaşa kimi nəzərdən keçirsək, bu anlam məqsədyönlüdür. Teatrın öz qanunları var: hər hansı bir pyesi tamaşaya qoymaq üçün rejissor, ilk növbədə, onun "rejissor ssenarisini" yazır, özünün qayəsini, amalını tamaşa vasitəsilə ifadə etmək üçün buna aylarla, hətta bəzən illərlə vaxt sərf edir. Müəllim də dərsə hazırlaşarkən dərsliyə müraciət edəndə artıq bir növ tamaşa qoymaq üçün müəyyən bir pyesə müraciət edən rejissoru xatırladır. Rejissor tamaşanın ssenarisini yazanda teatrın kanonlarına arxalanır, müəllim isə dərsin ssenarisini yazanda elmi-metodik qanunlara əsaslanır...

Dərsliyi oxuyarkən şagird, bir tərəfdən, müvafiq mətnin məzmununu, digər tərəfdən, bu materialların müəyyən etdiyi iş üsullarını mənimsəməlidir.

**HAŞİYƏ.** Şagirdlər mətnlə müstəqil işləyə bilirlərmi? Psixoloqlar bu məsələni araşdırarkən müasir məktəb üçün fərəhsiz faktlar açıqlamışlar. Müəyyən edilmişdir ki, öyrənilən sayseçimində min nəfər yuxarı sinif şagirdindən yalnız üç nəfəri mətnlə iş sahəsində elementar bacarıqlara malikdirlər. Görəsən, bu təsadüfi haldır? Məktəbdə şagirdlərə kitab (dərslik) üzərində iş üsullarının öyrədilməsinə, təəssüf ki, çox vaxt kifayət qədər diqqət yetirilmir. Öyrənmənin səmərəli yolları ilə də onlar sistemli şəkildə tanış edilmirlər. Dərsliyi öyrənərkən hər şeyi, necə deyərlər, olduğu kimi yadda saxlamağa çalışan şagirdlərə az təsadüf olunur?! Müəllimlər də dərslik materiallarının müəyyən etdiyi iş üsullarının təhlilinə əksər hallarda əhəmiyyət vermirlər. Halbuki bu üsulların təhlili şagird ağlının formalaşmasında önəmli rol oynaya bilərdi...

Şagirddən fərqli olaraq, dərslik müəllim üçün metodik vəsaitdir (və ya rəhbərlikdir). O, dərsdə şagirdlərin təhsili, inkişafı və tərbiyəsi kimi köklü məsələləri həll edərkən dərsliyə əsaslanır, dərs üçün zəruri materialı axtaranda, seçəndə və işləyəndə dərslikdən, obrazlı desək, yanar mayak kimi istifadə edir. Bu zaman, o, proqramın tələblərini, ilk növbədə, öyrədiləcək əsas anlayışların, bacarıq və vərdişlərin həcmini zəruri surətdə nəzərə alır.

Bəzi müəlliflər (İ.M.Qritsevski, S.E.Qritsevskaya və b.) dərslik pedaqogikasının paradiqmalarını bu baxımdan araşdırarkən müəllimin dərsliyi aşağıdakı kimi təhlil etməsini məsləhət görürlər:

1. Dərslikdə nə verilmişdir? 2. Necə verilmişdir? 3. Bu nə üçün verilmişdir? 4. Nə üçün məhz belə verilmişdir? 5. Dərsliyin bu materiallarının hansından bilavasitə istifadə etmək zəruridir? Hansı materiallardan dəyişilmiş şəkildə istifadə olunmalıdır? 6. Dərslikdə verilmiş material kafidirmi? Yoxsa dərsliyə nəyi isə əlavə etmək, nəyi isə dəyişmək və ya dərslikdən kənara çıxmaq lazımdır? Əgər lazımdırsa, hansı ölçüdə lazımdır?

Müəllim dərslik materiallarını təhlil edəndə onun fəaliyyətində iki cəhət bir-birilə üzvi şəkildə qovuşur: o, bir tərəfdən, müəlliflərin termini ilə desək, dərslik materiallarını "özü üçün", digər tərəfdən, "şagirdlər üçün tərcümə edir".

"Özü üçün tərcümə" dərslik materiallarının elmi-nəzəri, psixoloji yozumu, şərhi, daha dəqiq desək, təfsiri kimi özünü göstərir. Bu mərhələdə dərsin pedaqoji niyyətini elmi-metodik yönümdə düzgün müəyyənləşdirmək üçün aşağıdakı sualların araşdırılması məsləhət görülür:

Şagirdlərə nəyi öyrətməli? Hansı məsələləri ayırd etməli? Öyrəniləcək mövzuda hansı anlayışlar, ideyalar aparıcı olacaqdır? Dərsdə hansı çətinliklər meydana çıxa bilər və müəllim onları necə aradan qaldırmalıdır? Şagirdləri maraqlandırmaq, onların fəaliyyətini səmərələşdirmək, onu təşkil etmək üçün müəllim hansı priyom və vasitələr seçməlidir? Dərsin səmərəli nəticə verməsi necə təmin olunacaqdır? Müvafiq dərsdə hansı təhsil, inkişaf və tərbiyə məqsədləri yerinə yetiriləcəkdir?

Dərslik materiallarının "şagirdlər üçün tərcümə olunması" köklü psixoloji məsələlərin həlli ilə bağlıdır. Dərslik pedaqogikasında bu cəhətdən aşağıdakı sualların araşdırılması zəruri sayılır:

Şagirdlər yeni materialı qavramaq üçün nə dərəcədə hazırdırlar? Müvafiq mövzu üzrə öyrədiləcək anlayışların formalaşması hansı mərhələdədir? Onların daha da zənginləşdirilməsi hansı istiqamətdə aparılmalıdır? Onlarla əməliyyat apararkən şagirdlər hansı yeni bacarıqlara yiyələnəcəklər? Bu dərsdə hansı tədris bacarıqları tətbiq olunacaqdır? Onlar hansı dərəcədə formalaşmışdır? Dərsdə hələ hansı priyomların formalaşdırılması nəzərdə tutulur?

Dərslik materiallarının "şagirdlər üçün tərcüməsi" onlarda zəruri dəyişikliklər etməyə, bəzi hallarda proqram tələblərini nəzərə almaq şərtilə hətta dərslikdən kənara çıxmağa, müəyyən əlavələr etməyə nəinki yol verir, həm də bunu tələb edir.

Dərslik materialını müxtəlif yönümlərdə dəyişmək olar. İ.M.Qritsevski və S.E.Qritsevskaya onlardan aşağıdakıları ayırd edirlər:

1.Müəllim izah edəcəyi məsələləri formaca dəyişir: dərslikdə geniş işıqlandırılmış bəzi məsələlər dərsdə izah edilmir; bu isə daha çox əhəmiyyətli olan digər məsələləri daha geniş, daha ətraflı aydınlaşdırmaq imkanı verir.

2. Şərhin müəssərliyini və obrazlılığını artırmaq məqsədi ilə müəllim dərslikdə verilməmiş illüstrativ faktlardan istifadə edir.

3. O, dərslikdə verilmiş faktları eynimənalı faktlarla qismən əvəz edir.

4. Dərslik materiallarını yenidən qruplaşdırır.

5. Deduktiv yolla şərh edilmiş materialı induktiv yolla şərh edir və ya monoloji şərhi dioloji şərhlə əvəz edir...

Müəllim dərsə hazırlaşarkən dərsliyə bu ölçülərlə yanaşır və dərslik materiallarında qabaqcadan məqsədyönlü dəyişikliklər edir. Bəzən isə dərsin özündə də qabaqcadan nəzərə alınması mümkün olmayan elə situasiyalar yaranır ki, müəllim onun məntiqinə müvafiq olaraq dərslik materiallarında istər-istəməz müəyyən dəyişikliklər edir.

Dərs müəllimin ağıl və hissinin sehrində yaranır. Əsl müəllim özünün biliyini və istedadını ilhamla dərsə həsr edir. 45 dəqiqə ərzində, necə deyərlər, yanır və yandırır. Axı, dərsin müəllifi dərslik deyil, müəllimin özüdür. Müəlliflik hüququ – çox vaxt səriştəsiz məktəb direktorunun və ya inspektorun fərqinə varmadığı, hətta bəzən asanlıqla dandığı, tanımadığı bu hüquq müasir təhsil konsepsiyası baxımından xüsusi məna kəsb edir. Müasir məktəbə, sözün əsl mənasında, yaradıcı müəllim lazımdır.

Dərslik problemi pedaqoji təxəyyül problemi ilə bilavasitə bağlıdır. Dərsə hazırlaşarkən müəllimin yaradıcılığının səviyyəsi onda məhz pedaqoji təxəyyülün inkişaf səviyyəsi ilə müəyyən olunur. Pedaqoji təxəyyülün kasadlığı, ilk növbədə, müəllim dərsliklə işləyəndə bütün aydınlığı ilə hiss olunur. Pedaqoji təxəyyülü inkişaf etməmiş və ya zəif inkişaf etmiş müəllim istər-istəməz dərsliyin əsiri olur, onun hüdudlarından kənara çıxa bilmir. Müəllimin pedaqoji təəxəyyülü öz vüsətilə cilvələnəndə, necə deyərlər, aşıb-daşanda o, dərsliyi artıq yaradıcı şəxsiyyət kimi "oxuyur", onda hər hansı bir məşhur tarzənin "sarı simə" vurmasını xatırladan məqamlar tapır, materialı əslində özününküləşdirir. Konstruktiv qabiliyyətlər sırasında xüsusi yer tutan pedaqoji təxəyyül çoxcəhətlidir. O, yaradıcı təxəyyüllə bərpaedici təxəyyülün qovşağında əmələ gəlib inkişaf edir.

**HAŞİYƏ.** Müəllimi bəlkə də hər hansı bir romanı (bizim misalımızda dərsliyi) səhnələşdirən dramaturqa bənzətmək daha düzgün olardı. Lakin o, evdə sabahkı dərsə hazırlaşarkən təkcə dramaturq deyildir, həm rejissordur, həm də öz tamaşasında oynayacağı qəhrəman rolunu məşq edən aktyordur. Dərsdə isə, hər şeydən öncə, aktyordur. Bəzən dərsi ilk baxışda bir aktyorun teatrına oxşadırlar. Təəssüf ki, bu təşbehin özü birtərəflidir. Bir aktyorun teatrında onun tərəf – müqabili olmur, müəllimin isə, tərəf – müqabili var. Şagirdlər, sözün əsl mənasında, onun tərəf– müqabilləridir.

Müəllim dərsə hazırlaşarkən, dərslikdən və başqa materiallardan istifadə edərkən məhz sinifdə özünün tərəfi–müqabili ilə şagirdlərlə necə danışacağını, çətin elmi mətləbləri necə izah edəcəyini, özünəməxsus fonetikası, lüğəti və qrammatik quruluşu olan ildən-ilə dəyişən və inkişaf edən dərsi "uşaq dilinə" necə tərcümə edəcəyini, onları necə maraqlandıracağını, təfəkkür zirvəsində şagird fikrini necə "alovlandıracağını" açıqlamalıdır. Şagirdin maraq dünyasına enişli-yoxuşlu yol onun ağıl və hislərində əks-səda doğuran maraqlı dərsdən başlayır. Təcrübəli müəllim üçün bu, pedaqoji fəaliyyətin böyük hərflə yazılan önəmli həqiqətlərindən biridir.

Müəllimin didaktik qabiliyyətləri öz gücünü dərsdə göstərir, lakin dərsə hazırlaşanda da, dərsliyi araşdıranda da o, məhz öz istedadının qüdrətinə güvənir. Bu məqamda öz təcrübəsini götür-qoy edir, müəllim qayəsini (dərsin məqsədini) uğurla həyata keçirmək üçün səmərəli yollar axtarır. "Təcrübə + refleksiya = inkişaf" – D.Pozner yaradıcılıq axtarışlarından usanmayan müəllimin inkişaf yolunu bu maraqlı düsturla mənalandırır.

Aktyor sənətinin öz sirləri var. Doğru deyirlər ki, "səhnə sənəti anidir, ötəridir və bu mənada vəfasızdır. O yalnız yaradıcılıq məqamlarında, qəlblərə güclü təsir göstərərkən yaşayır, ötüb keçəndə, keçmişə çevriləndə isə səraba dönür, görünməz olur. Aktyor ömrü də bir xatirə kimi yalnız onu görənlər üçün mövcuddur, görməyənlərə onu nağıl eləmək, başqalarında təsəvvür yaratmaq nə qədər çətindir".

Məşhur mütəfəkkirlərin aktyor haqqında dedikləri bu qanadlı sözləri eyni ilə müəllimə də aid etmək olar. Müəllim "uşaq qəlbinə təsir göstərərkən yaşayır", müəllim ömrü yalnız şagirdlər –"onu görənlər üçün mövcuddur". Bu sözlərin sehrində müəllim ömrünün romantikasını hiss etmək nə qədər də xoşdur, fərəhlidir.

Deyirlər ki, məşhur aktyorların özünəməxsus tamaşaçı xofu, vahiməsi var. Əsl müəllimin qəlbində də tükü-tükdən seçən, həssas və ağıllı şagird xofu, vahiməsi yaşayır. Bu hiss bənzərsizdir. Onu qorxu kimi yozanlar səhv edirlər. Bu hiss teatrın və məktəbin, sənət və ziya məbədinin müqəddəs kanonlarını göz bəbəyi kimi qoruyub saxlayan məsuliyyət hissidir. Aktyor bu hissi qədirbilən tamaşaçı alqışları ilə yaşayır. Müəllim isə öz xoşbəxtliyini dərsdə inamla alışıb-yanan ağıllı şagird gözlərində tapır. Aktyor bu hissi itirəndə artıq sənətkar kimi ölür. Müəllim bu hissi itirəndə isə dərs onun üçün adiləşir, bu kökdə müəllimin nəinki dərsə, həm də özünə münasibəti dəyişir. Dərsə də, özünə də yaradıcılıq ölçüləri ilə yanaşmır.

Dərsin adiləşməsi fenomenoloji səpkidə müxtəlif əlamətlərlə səciyyələnir. Müəllim öz üzərində işləmir, psixoloji-pedaqoji ədəbiyyatı izləmir, qabaqcıl müəllimlərin iş təcrübəsini öyrənmir, dərsə əməlli-başlı hazırlaşmır, hazırlaşanda da təkcə dərslik əsasında hazırlaşır. Bu isə artıq müəllimin “mənəvi ölümü” kimi mənalandırılmalıdır.

Dərsə təkcə dərslik əsasında hazırlaşmaq məktəb təcrübəsində geniş təsadüf olunan ciddi nöqsanlardan biridir. Onu psixoloji yönümdə araşdıranda iki cəhət diqqəti xüsusilə cəlb edir.

Birincisi: Şagirdlərin müəllimə münasibətləri haqqında. Onlar xüsusilə yeniyetməlik yaşlarından başlayaraq, erudisiyalı müəllimləri daha çox sevirlər. Sinifdə dərsliyin məzmununu “bir təhər” danışan müəllimlərə isə sadəcə olaraq hörmətlə yanaşmırlar.

Şagirdlər elə ki, heyrətlə bu həqiqəti – müəllimin dərsliyin məzmununu “bir təhər” danışması həqiqətini kəşf edirlər, onlarda müəllimə və dərsə özünəməxsus yanaşma yaranır. Bəzi şagirdlər isə müəllim dərsi danışdıqca xəlvəti dərsliyə baxır, müəyyən sözləri müəllimsayağı aramla təkrar edib, sinif yoldaşlarına güldürür, hətta bəzən müəllimin səhvlərini tutur və bununla da dərsdə bir növ əylənirlər. Şagirdlərin bir çoxu müəllimə qulaq asmır, kənar işlərlə məşğul olur, intizamsızlıq edir.

Dərsə ancaq dərsliklə hazırlaşan müəllimlər üçün bir cəhət də səciyyəvidir: onlar sinfə daxil olan kimi şagirdlərdən dərsliyi partanın üstündən götürməyi tələb edirlər və kitab üzərində iş metodlarından qətiyyən istifadə etmirlər. Halbuki müasir təhsil konsepsiyası kitab üzərində iş üsuluna böyük əhəmiyyət verir. Yenilikçi müəllimlərin iş təcrübəsi inkişafetdirici və tərbiyəedici təlim prinsipləri baxımından bu üsulun böyük imkanlara malik olduğunu göstərir.

İkincisi: İdrak (təlim) maraqları haqqında. Şagirdlər dərsdə müəllimə diqqətlə qulaq asanda çox vaxt evdə dərsliyi oxumurlar və ya başdansovdu oxuyurlar. Tanışlıq effekti öz təsirini göstərir. Bu şəraitdə şagirdlərin idrak maraqları tədricən öləziməyə başlayır. Dərslik onun üçün əsl mənasını itirir. Bir çox hallarda kifayət qədər dəyərləndirilməyən bi adi həqiqəti istər-istəməz xatırlamaq lazımdır. Dərslik müəllim üçün deyil, şagird üçündür. Müəllim ondan yalnız özünəməxsus metodik mənbə kimi istifadə edə bilər. Əgər müəllim yeni dərsə ancaq və ancaq şagirdlər üçün nəzərdə tutulan dərsliklə hazırlaşırsa və dərsdə təkcə onun məzmununu danışmaqla öz işini bitmiş hesab edirsə, özü öz əli ilə şagirdlərin idrak marağının zəifləməsi üçün əlverişli şərait yaradır. Bu isə əslində bumeranq effektidir. Şagirdlərin çox vaxt evdə dərsi başdansovdu öyrənmələri bilavasitə bu effektlə bağlıdır.

Şagird üçün müəyyən bir proqram üzrə bilgi almağın iki əsas mənbəyi var. Bunun biri müəllimin şərhi, o biri isə dərslik və dərs vəsaitləridir. Müəllim öz şərhi ilə şagirdlə dərslik arasında əlaqə yaratmalıdır. O, dərsi şərh edərkən nəzərə almalıdır ki, şagirdin dərsliklə müstəqil surətdə işləməsi zəruridir. Müəllim bu işin müvəffəqiyyətli olması üçün şərait yaratmalıdır. Şagirdlərdə

kitabla (bizim misalımızda dərsliklə) müstəqil işləmək bacarığının formalaşmasına ardıcıl diqqət yetirilməlidir. Elmi-texniki inqilab dövründə, informasiya bolluğu şəraitində bu bacarığın əhəmiyyəti xüsusilə artır.

Bir məsələni də, görünür, qeyd etmək lazımdır. Müəyyən edilmişdir ki, gənc müəllimlər də bir çox hallarda dərsə təkcə dərslik əsasında hazırlaşırlar. Onların iş təcrübəsinin təhlili göstərir ki, bu təsadüfi deyildir: dərslik materiallarının elmi, psixoloji-pedaqoji şərhi və ya təfsiri üçün zəruri olan vərdiş və bacarıqların formalaşmaması ilə bağlıdır. Məktəbdə bu yönümdə müəllimlərlə, ilk növbədə, gənc müəllimlərlə sistemli elmi-metodik iş aparılmalıdır. Dərsin nəzəri və elmi-metodik səviyyəsini yüksəltməyin əsas yollarından biri elə bundan ibarətdir.

Respublikamızda orijinal dərsliklərin nəşri sahəsində uğurlarımız az olmasa da, hələ dərslik konsepsiyamız yoxdur. Mövcud dərsliklərin bir çoxu müasir tələblərə cavab vermir.

Görəsən, onlar problemli təlim üçün yararlıdırmı? Bu sual nə dərəcədə adi səslənsə də, köklü mətləblərlə bağlıdır. Dərslik problemi bu gün təkcə psixoloq, pedaqoq və metodistləri deyil, həm də filosofları narahat edir. Filosofların qənaətinə görə, müəllifin (və ya müəlliflərin) avtoritar hakimiyyətinə söykənən dərsliklər həmişə sərbəst yaradıcılıq və ixtiraçılığın əl-qolunu bağlayır.

Dərslik necə olmalıdır? Yeni pedaqoji təfəkkür baxımından bu sual son dərəcə aktualdır. Müasir dərsliklərdə şagirdlərdə inkişaf və tərbiyə ediləcək keyfiyyətlər layihələşdirilməlidir. Bu cəhət zəruri surətdə nəzərə alınmalı, şagirdlərin nəinki mənəvi tərbiyəsində, həm də əqli inkişafında dərsliklərin rolu artırılmalıdır. Respublikamızda çoxcəhətli təhsil islahatı şəraitində dərsliklərin yeni nəslinin yaradılması üçün sistemli elmi-metodik iş aparılır və bu önəmli sahədə böyük müvəffəqiyyətlər əldə edilmişdir. Dərsliklərin (eləcə də proqramların və tədris planlarının) psixoloji və pedaqoji ekspertizadan keçirilməsinə tədricən daha çox diqqət yetirilir.

İnkişaf etmiş ölkələrdə dərsliklərlə yanaşı, konkret fənn və siniflər üzrə metodik vəsaitlərin hazırlanmasına da xüsusi önəm verilir. Vaxtilə respublikamızda bu sahədə də az iş görülməyib. Lakin konkret fənn və siniflər üzrə metodik vəsaitlər sistemli nəşr olunmayıb. Nəşr olunan metodik vəsaitlərdə isə məsələlər pedaqoji psixologiya və pedaqogika yönümündə kifayət qədər açıqlanmayıb.

Konkret fənn və siniflər üzrə metodik vəsaitlərin sistemli nəşr olunması dünya təcrübəsi baxımından günün tələbidir. Bu vəsaitlərin hər biri iki hissədən ibarət olmalıdır. Birinci hissədə müvafiq kursun müəyyən bir sinifdə tədrisinin psixoloji, pedaqoji və metodiki məsələləri aydınlaşdırılmalı, ikinci hissədə isə müəllimin yaradıcılığına və müstəqilliyinə əlverişli şərait yaratmaq məqsədilə mövzunun tədrisi metodikası variativ şəkildə açıqlanmalı, mövzu üzrə əsas və əlavə ədəbiyyat siyahısı verilməlidir... Müəllimlər üçün bu tipli vəsaitlərin sistemli nəşri "dərslik-müəllim-dərs" probleminin həllində mühüm addım olardı.

**А.Ализаде**

**Учебник, ученик, учителъ**

**Резюме**

В статье анализируется психологическая взаимосвязь между учителем и учащимся и их отношение к учебнику.

**A.Alizadeh**

**The textbook, the pupil and the teacher**

**Summary**

In this article are analyzed interaction with teachers and pupils, investigated their relations between textbook.

# ŞAGİRD VƏ VALİDEYNLƏRLƏ PEDAQOJİ İŞİN BƏZİ ASPEKTLƏRİ

**Məlahət Nuriyeva**
***Bakı Dövlət Universitetinin müəllimi***

***Açar sözlər:*** *keçid dövrü, sosial proseslər, məktəb psixoloqu, valideyn-müəllim Assosiasiyası.*

***Ключевые слова:*** *переходной период, социальные процесс, школьный психолог, Родительско-Учительская Ассосиация.*

***Key words:*** *transition period, social process, school psychologist, Parent-Teacher Association.*

Respublikamızda uğurla həyata keçirilən təhsil islahatlarının məqsədi təlim prosesinin səmərəliliyini təmin etməklə milli və ümumbəşəri dəyərlərə yiyələnən, yaradıcı və tənqidi düşünməyi bacaran fəal şəxsiyyət yetişdirməkdir. Təbii ki, bu prosesdə düzgün qurulmuş müəllim-şagird münasibətləri mühüm rol oynayır. Qarşılıqlı ünsiyyət şagirdlərin fəallığını artırır, kollektiv şəkildə işləməyə istiqamət verir.

Təhsil insanlara öz əcdadlarının əsrlər boyu əldə etdiyi təcrübə və biliklərə bir neçə il ərzində yiyələnmək imkanı verir. Yaşadığı zamanın tələbləri səviyyəsində durmağa, hər dəfə sıfırdan başlamaq deyil, özündən əvvəlki nəsillərin işini davam etdirməyə insan yalnız təhsil sayəsində müəssər olur.

Təhsil artıq neçə əsrlərdir ki, cəmiyyətin bir tam halında mövcudluğunu və inkişafını təmin edən əsas sosial institutlardan biridir. Hər bir ölkənin ictimai təşkilatlanma səviyyəsi, ilk növbədə təhsilin keyfiyyətindən asılıdır. Cəmiyyəti təmsil edən şəxslərin hamısı: dövlət xadimləri də, yaradıcı ziyalılar da, iş adamları da və s. ilk sistemli bilikləri təhsil ocaqlarında almış, onların şəxsiyyət kimi yetişməsi də, dövlətçilik təfəkkürləri də, vətəndaşlıq duyğuları da əsasən məktəblərdə formalaşmışdır. Yəni bu gün təhsil hansı səviyyədədirsə, on il sonra cəmiyyət də həmin səviyyədə olacaqdır. Ona görə də, ictimai inkişafın ən böyük resursları təhsil sistemindədir.

Keçid dövründə formalaşan yeni ictimai mühit və yeni dəyərlər sistemi öyrənilmədən, yeni meyarlar formalaşdırılmadan, tərbiyədən danışmaq, ənənəvi pedaqoji bazada yeni tərbiyə sistemi qurmaq mümkün deyil. Bir sözlə, təkcə valideyn və müəllim qismində ayrı-ayrı subyektlər yox, bütövlükdə ictimai mühit tərbiyənin subyekti kimi nəzərdən keçirilməlidir. V.Q.Belinskinin dediyi kimi, təhsilin müxtəlif növləri içərisində ən yüksək mərtəbəni mənəvi-əxlaqi təhsil tutur. Yaxud A.Sent-Ekzüperi deyir: "Tərbiyə təhsildən üstündür. Çünki insanı tərbiyə yaradır". Təhsil dedikdə, əslində, iki şəxs (öyrədən və öyrənci) arasındakı fərdi təlim-tərbiyə prosesindən başlayaraq, beynəlxalq təhsil şəbəkəsinədək genişlənən çoxşaxəli və mürəkkəb bir sistemdən söhbət gedir.

Məlumdur ki, cəmiyyətin inkişafına təkan verən sosial proseslər şəxsiyyətin inkişafına da xüsusi təsir göstərir və mühüm tələblər irəli sürür. Cəmiyyətin inkişafının istiqamətverici qüvvəsinə çevriləcək gənclərdə müasir düşüncə tərzinin formalaşdırılması üçün isə milli maraqlara cavab verə biləcək təhsil və tərbiyə sisteminin yaranması da problem kimi günümüzün aktuallığını özündə əks etdirir. Dəyişən dünyanın reallıqlarından kənarda qalmamaq prinsipinə əsaslanmaqla müasir tələblərə cavab verən yeni

təlim və tərbiyə metodlarının tətbiqi də öz aktuallığını daim qoruyub saxlayır. Deməli, təlim və tərbiyə müasir şagirdi dövrünün həyatına hazırlamalıdır.

Uzun illər Sovet dönəminin təhsilinə alışmış, onun tələblərini və qanunlarını mənimsəmiş müəllim də, valideyn də yeni sistemə, yeni islahata asanlıqla alışa bilmir. Məktəb işində isə bu daha da qabarıq şəkildə görünür.

Valideynlər təhsil islahatının qarşıya qoyduğu tələblərin mahiyyətini dərinliyi ilə bilmədiyi üçün ötən dövr ərzində məktəblə-ailə arasında bəzi anlaşılmazlıqlar da meydana gəlmişdir. Lakin zaman keçdikcə həm müəllimlər, həm də valideynlər bu anlaşılmazlıqları aradan qaldırmağa çalışmış və qismən də olsa, buna nail olmuşlar.

Bu günədək aparılan təcrübi müşahidələr də göstərir ki, ailədən məktəbə üç növ, üç xarakterdə uşaq gəlir. 1. Normal tərbiyə görmüş uşaqlar. 2. Ərköyün böyüdülmüşlər. 3. Ailədə təzyiqə məruz qalan və ya qorxu içində böyüyənlər. Bunların hər birinin özünəməxsus yanaşma tərzi və tərbiyəetmə yolları, tələbləri vardır. Hər ailənin uşağa yanaşma tərzi, məktəb haqqında verdiyi məlumat, valideynin məktəb və cəmiyyət haqqında baxışları müxtəlif olur. Bunun üçün uşağı məktəbə gəlməyə hazırlaşan valideynlərlə (uşağını məktəbə qoymaq üçün ərizə verən valideynlər nəzərdə tutulur) ilkin maarifləndirici görüşlərin keçirilməsi məqsədəuyğundur, daha doğrusu vacibdir. Məktəb haqqında, uşağın gələcək davranış qaydaları haqqında maarifləndirici söhbətlər həm məktəb rəhbərliyi, həm fənn müəllimləri, həm də məktəb psixoloqunun iştirakı ilə aparılmalıdır.

Bəzi hallarda valideynlər ilk gündən məktəbə gəlməyə laqeyd yanaşırlar. Hətta keçirilən tədbirlərə gəlməmək üçün cürbəcür bəhanələr uydururlar. Belə olan halda, müəllimin və məktəb psixoloqunun o ailəyə göndərilməsi zərurəti yaranır. Məktəblə-ailə arasında əlaqənin yaranmasını zəruri edən bir sıra səbəblər vardır. Təcrübə göstərir ki, övladının təhsili ilə maraqlanmayan ailə üzvlərinin məktəb haqqında, müəllim haqqında öz düşüncələri, öz baxışları var. Bu baxışlar heç də həmişə müsbətyönümlü olmur. Bu baxışları müsbətə doğru yönəltmək üçün məktəb tərəfindən o ailə ilə daha tez-tez əlaqə saxlanılmalı, onlarla məktəb, müəllim, şagird və ailə münasibətləri ilə bağlı söhbətlər aparılmalıdır.

Eyni zamanda müəllim ailə nəzarətindən kənarda qalan şagirdlərlə daha məsuliyyətlə məşğul olmalı və nəzarətdə saxlamalıdır. Bu işə məktəb psixoloqu da cəlb edilməli və onun apardığı söhbətlərin effektliliyi izlənilməlidir. Tərbiyə işi uzunmüddətli prosesdir. Son nəticəni əldə etmək üçün səbirlə, təmkinlə hərəkət etmək lazımdır. Hətta burada valideynlərlə əlaqəli işləmək də varsa, daha səbirli, təmkinli olmaq gərəkdir.

Məktəb psixoloqunun və müəllimin valideynlərlə birlikdə həyata keçirdiyi görüş öz effektliliyi ilə seçilir. Çünki psixoloq tərəfindən açıq söhbətə sövq edilən valideyn uşağının necə tərbiyə olunduğunu, məktəb haqqında uşağına hansı fikirləri aşıladığını açıq deyə bilir və bir çox hallarda öz nöqsanlarını etiraf edir.

Məktəb psixoloqunun ustalığı ondadır ki, o, valideynlə söhbət apararkən ailədaxili problemləri üzə çıxara bilsin. Bu zaman uşağı tərbiyə etmək də asan olur. Bir çox hallarda müəllimlər şagirdin çətin tərbiyə olunması haqqında söhbət açırlar. Bildirirlər ki, bu şagird heç kimi eşitmir, öz bildiyini edir, onu tərbiyə etmək çətindir. Çətin tərbiyə olunan uşaq yoxdur, çətin başa düşülən uşaq var. O uşaq dünyasının sirlərini öyrənib üzə çıxarmaq lazımdır. Onun intizamsızlığı haradan qaynaqlanır? Hansı səviyyədədir? Müəllim-şagird münasibəti necədir? Məktəb daxilində və ya məktəbdənkənar vaxtlarda kiminlə dostluq edir? Ailədə vəziyyət necədir? Hansı problem mövcuddur? və s. sualla-

ra cavab tapmaq üçün müşahidələr aparmaq, şagirdin özü və ailə üzvləri ilə ayrılıqda söhbətlər aparmaq, şagirdin aqressivliyinin səbəbini tam aydınlaşdırmaq lazımdır. Bundan sonra onunla ata-ana haqqında, onların uşaqların həyatında tutduqları yer haqqında, gələcəkdə cəmiyyətdə tutacağı mövqe haqqında açıq, inandırıcı və ətraflı söhbət aparılmalıdır. Hər bir valideyn övladının gələcəkdə yaxşı insan olmasını arzulayır. Lakin bir çox valideynlər bu arzunun həyata keçirilmə yollarını bilmirlər. Bəzən uşağı ifrat dərəcədə əzizləyir, bəzən də yerli-yersiz danlayırlar. Onlara elə gəlir ki, uşağı tərbiyə edirlər. Bu cür "tərbiyə" üsulu uşağın "tərbiyələnməsinə" xidmət etmir, əksinə onu ərköyünlüyə və ya laqeydliyə gətirib çıxarır. Bunun əsl yolu valideynləri bu sahədə maarifləndirmək və uşaqda özünəinamı formalaşdırmaq lazımdır.

Hər bir ailə məktəbdə həyata keçirilən yeni təhsil islahatının məzmunu və yenilikləri ilə tanış edilməli, gələcək vətəndaşın təhsilli, tərbiyəli, daha doğrusu, cəmiyyət üçün gərəkli vətəndaş kimi formalaşdırılmasına çalışmalıdır.

Valideyn-övlad, usta-şagird, müəllim-tələbə münasibətləri əsasən fərdi miqyaslı proseslərdir. Bu proseslər cəmiyyət miqyasında təşkilatlandıqda, müvafiq sosial struktur, infrastruktur və mühitlə tamamlandıqda fərqli bir mahiyyət kəsb edir. Amma miqyasından asılı olmayaraq, təhsil prosesinin mərkəzində həmişə konkret təlim və tərbiyə prosedurları dayanır.

Təlim prosesi məqsədyönlü və qeyri-aşkar ola bilər. Belə ki, uşaq ailədə məhz onun üçün nəzərdə tutulmayan söhbətləri dinləyir, hadisələrin şahidi olur. Bu zaman öyrənmə prosesinin subyekti uşaq özüdür. O, özü ətraf mühitdə nə görürsə, onu da götürür; həm də çox vaxt özü də bilmədən, qeyri-aşkar şəkildə. Əslində bu proses öyrətmə yox, öyrənmə prosesidir və təkcə uşaqlıq dövrünü deyil, insanın bütün həyatını əhatə edir. Bu proses təlim və tərbiyəyə aid olmadığı kimi, özünütəlim və özünütərbiyəyə də aid deyil. Belə ki, sonuncuda subyekt insan özü olsa da bu, məqsədyönlü, istiqamətli bir prosesdir. Onun öz metodikası, üsulları ola bilər və insan bu metodlardan şüurlu surətdə istifadə edə bilər. Bu mənada özünütəlim və özünütərbiyə də əslində təlim-tərbiyə prosesinin tərkib hissəsidir. Sadəcə olaraq, burada həm subyekt, həm də obyekt rolunu bir şəxs oynayır.

Valideyn və müəllimlərin sıx əməkdaşlığı vasitəsilə şagirdlərimizin təlim-tərbiyəsinin faydalılığını artırmaq, onların təhsilə marağını ictimai stimullaşdırmaq, evlə məktəb arasında səmərəli əlaqə-ünsiyyəti yaratmaq mümkündür. Uşaqların təlim-tərbiyəsi prosesində, qərarların qəbulunda, ailədaxili və məktəbin ictimai həyatında valideynlərin fəal iştirakını təmin etmək, onların tövsiyələrindən yararlanmaq olduqca zəruridir.

Valideynlər üçün uşaqların təhsil səviyyəsinin artırılmasına və dərsə davamiyyətinə ictimai nəzarət etmə imkanlarını yaratmaq, uşaqların hərtərəfli inkişafında valideynlərin potensialından faydalanmaq, habelə valideynlərin pedaqoji maariflənməsinə yardım etmək müasir təhsil prioriteti sayıla bilər. Bunun üçün ilk növbədə məktəbdaxili problemlərin həlli, təlim-tədris prosesinin idarəolunmasında valideyn, müəllim, dövlət və ictimaiyyətin səylərini birləşdirmək məqsədəuyğundur.

Məktəb həyatında baş verənlərə dair ictimaiyyəti məlumatlandırmaq, təhsil alan uşaq və gənclərin problem və çətinliklərinin həllində, valideyn, müəllim və ictimaiyyətin imkanlarını səfərbər etmək qaçılmazdır.

Valideyn, müəllim, şagird və ictimaiyyətin müxtəlif təbəqələri arasında inteqrasiyaya nail olmaq, müxtəlif sahələr üzrə maarifləndirmə işi aparmaq, bu istiqamətdə xüsusi tədris proqramları, layihələr, maarif-

ləndirici əyani vəsaitlər hazırlamaq və həyata keçirmək pedaqoji işin xüsusiyyətlərindən hesab olunur. Valideynlərin potensialından faydalanmaq üçün həm də valideynlərin ictimai fəallığını və məsuliyyətini, valideynlərin şagirdlərin inkişafındakı rolunu artırmaq, onların qərarların qəbulunda iştirakını təmin etmək, valideynləri məktəb həyatına cəlb etmək zəruri və labüddür. Buna görə də müəllimlərin ailələrlə tanışlığını təmin etmək və müəllimlərin ictimai məsuliyyətini artırmaq məqsədəuyğundur. Bu sahədə ən uğurlu addım fərdi və kollektiv görüşlər və söhbətləri sürətləndirmək, şikayətlərə baxışı ciddiləşdirmək, çevik təkliflər və məsləhətlər vermək, habelə ailələrdə tanışlığı gücləndirərək valideynlər və şagirdlər üçün təlimləri təşkil etmək əhəmiyyətlidir.

Şagirdlərin asudə vaxtının təşkili, sağlam həyat, QİCS-lə mübarizə tərbiyəsi valideynlərlə birgə iş əsasında daha uğurlu ola bilər. Şagirdlərin normal sosiallaşması üçün digər məktəblərlə və təhsil müəssisələri ilə əhali və ictimaiyyətlə əlaqələrə, ziyalılarla və alimlərlə, millət vəkilləri ilə, habelə görkəmli ictimai-siyasi və incəsənət xadimləri ilə, QHT və bələdiyyələrlə, dövlət qurumları ilə, KİV-lə işə xüsusi önəm vermək zəruridir.

İndi ölkəmizdə “Azərbaycan Valideyn-Müəllim Assosiasiyası” ictimai birliyi fəaliyyət göstərir.

ABŞ-da bu cür qurumlar artıq xeyli vaxtdır fəaliyyət göstərir. Onlar ən nüfuzlu, valideynləri, icmanı ən çox birləşdirən bir təşkilatdır. 2000-ci ildən Azərbaycan da bu modellə işləməyə başlamışdır. Lakin hələ bu günə qədər modelin yerli şəraitə uyğunlaşdırılması prosesi gedir. 2002-ci ildə YUNİSEF və Təhsil Nazirliyinin təşəbbüsü ilə Azərbaycanın beş pilot rayonunda - Şəki, Qəbələ, Masallı, Quba və Bakıda icma, valideynlər arasında sorğular keçirilmişdir və belə müəyyən olundu ki, ailə və məktəb arasında əlaqələr get-gedə zəifləyir. Valideynin məktəbə gəlməsi çox ciddi bir şəkildə ehtiyaca çevrilir. Və ona görə də sorğular nəticəsində belə nəticəyə gəlindi ki, ailə ilə məktəbin münasibətləri yaxınlaşmalıdır. Valideynlər təlim-tərbiyə prosesində iştirak etməlidirlər. Onlar öz uşaqlarının inkişafını istəyirlərsə, məktəbə gəlməlidirlər. 2004-cü ildə Valideyn-Müəllim Assosiasiyasının yaranmasına dair təsis konfransı keçirilmiş və 2005-ci ildə Ədliyyə Nazirliyi tərəfindən qeydiyyatdan keçmişdir.

Bu, könüllü olan, valideyn təşəbbüsü ilə yaranan prosesdir. Azərbaycanın 4500 məktəbindən bu gün hələlik 1300 məktəb Valideyn-Müəllim Assosiasiyası yaradıb. Əsas məqam ondan ibarətdir ki, burda valideynlərin təşəbbüsü olmalıdır.

Valideyn-Müəllim Assosiasiyası məktəbdə ictimai nəzarət funksiyasını yerinə yetirən təşkilatdır. Assosiasiyalar olan məktəblərdə maarifləndirmə, valideynlərin təlim-tədrisdə ictimai nəzarəti neqativ məqamları aradan götürür. Valideyn məktəbin ictimai həyatında iştirak edir, məktəbin idarəsində iştirak edir. Problemləri ilə tanış olur. Valideyn ayda bir dəfə məktəbdə olanda problemlərdən xəbərdar olur. Əgər valideyn məktəbə gəlmirsə, o nə məktəbin, nə də öz övladının problemlərini bilmir. Çox vaxt müşahidə olunur ki, valideyn dərsdə oturur və evdə uşağının görmədiyi tərəfini dərsdə görür. Bu, övlad-valideyn münasibətlərini qurmağa kömək edir.

Valideyn-müəllim, şagird-müəllim münasibəti barəsində işlər aparılır. Müəllimin nüfuzunu ailədə, cəmiyyətdə qaldırmaq lazımdır. Müəllim bu gün çox aşağı nüfuzlu bir insana çevrilib. Çünki təlim-tərbiyədə valideyn müəllimin müqəddəs rolunu öz uşağına çatdırmır. Valideyn bu səpkidə də iş görməlidir. Müəllimin uşağın gözündə nüfuzu ailədə müəllim haqqında gedən söhbətlərdən çox asılıdır. Valildeyn yadında saxlamalıdır ki, onun da müəllimi olub. O,

* 4

müəllimin bilik verən insan olduğunu unutmamalıdır.

Son dövrlərdə müasir məktəblərdə psixoloqlar daha çox aktiv fəaliyyət göstərirlər. Psixoloq deyəndə müəllim, şagird həm də valideyn üçün nəzərdə tutmalıyıq. Psixoloji xidmət hər üç tərəfə yönlənməlidir. Hüquq deyəndə təkcə şagirdin yox, müəllimin, valideynin hüququ da nəzərdə tutulur. Müşahidə etdiyimiz məktəblərdə psixoloqların işinin lazımi səviyyəyə qaldırıldığını görürük. Onlara tələbat var. Tələbat da onların fəaliyyətinin aktivləşməsinə gətirib çıxarır.

Valideynin uşağa görə məsuliyyəti aşağı səviyyədədir. Valideyn məsuliyyəti daim məktəbin boynuna atır. Uşaq məktəbə daxil olarkən ailə ilə məktəb arasında müqavilə olmalıdır. Müqavilədə hər iki tərəfin-məktəbin və ailənin vəzifələri izah olunmalıdır. İlk növbədə məsuliyyət artmalıdır. Təhsil sahəsində ictimai nəzarət gücləndirilməlidir.

*Rəyçi: prof. H.Əlizadə*

**İstifadə edilmiş ədəbiyyat**


1. Həmzəyev M. Kiçik məktəbyaşlı uşaqların psixoloji xüsusiyyətləri. Bakı, 1969.
2. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. Bakı, 2009.
3. Əlizadə H. Tərbiyənin demoqrafik problemləri. Bakı: Maarif, 1993.
4. Əzimov Q. Psixi inkişaf və tərbiyənin müasir problemləri. Bakı, 2004.
5. Qədirov Ə. Uşaqlarda idrak proseslərinin inkişafı. Bakı, 1970.
6. Quliyev E. Kiçik məktəblinin psixologiyası. Bakı, 2003.
7. Məhərrəmov A. Təlimin psixoloji əsasları. Bakı, 1992.
8. Rzayev B. Məktəblilərdə idrak proseslərinin fəallaşdırılması yolları. Bakı, 2003.
9. Смирнова Е. Психология ребенка от рождения до 7 лет. П. 1994.


**М.Нуриева**

**Некоторые аспекты педагогической работы с учениками и родителями**

**Резюме**

В статье нашло отражение исследование проблем повышения качества современного образования в соответствии с требованиями времени. Здесь рассматриваются вопросы поиска новых средств и форм повышения качества образования в виде удачного синтеза возможностей треугольника “учитель, ученик, родитель”.

В статье также говорится о работе с родителями, ее сложная природа, подтверждается идея о том, что в данной сфере необходимы педагогические инновации.

**M.Nuriyeva**

**Some aspects of student-parent’s pedagogical work**

**Summary**

The article is dedicated to enhancing the quality of education and formulation of personality. It is also spoken about the relations of student-teacher-parents and its successful impact to enhancing the quality of education and about new ways of students’ socializations. In the article it is also touched upon the essence of pedagogical work with parents and is noted that there is a need for new pedagogical innovations in this sphere.

***Tərbiyə məsələləri***

# ƏMƏK İNSANIN TƏRBİYƏ OLUNMASINDA MÜHÜM VASİTƏDİR

**Ləzifə Qasımova**
***Bakı Dövlət Universitetinin kafedra müdiri, pedaqogika üzrə elmlər doktoru, professor***

**Şahrza Ağayev**
***Azərbaycan Müəllimlər İnstitutunun dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *əmək, insan, əmək alətləri, əmək prosesi, insanın iş görmə qabiliyyəti.*
***Ключевые слова:*** *труд, человек, трудовое орудие, трудовой процесс, трудоспособность.*
***Key words:*** *labor, human, labor tools, the process of labor, person's ability.*

Hələ XIX əsrdə Almaniyanın “Die Neue zelf” jurnalında dərc olunmuş bir məqalədə deyilirdi ki, “siyasi iqtisadçılar qeyd edirlər ki, əmək hər cür sərvətin mənbəyidir”. Əməyin insan həyatının birinci əsas şərti olması isə həmişə vurğulanır. Əmək təbiətlə insan arasında baş verən məqsədyönlü bir proses olub cəmiyyətin zəruri tələbatları ilə şərtlənərək, özündə mühüm səciyyəvi cəhətləri ehtiva edir. Buraya, ilk növbədə məqsədəuyğun fəaliyyət, ictimai və yaradıcı xarakter, əmək alətlərinin yaradılması prosesi də daxil edilir.

Tədqiqatçılar fəlsəfi müddəalara əsaslanaraq əməyin instinktiv və şüurlu formalarından ibarət olduğu fikirlərini də irəli sürürlər.

Alimlərin qənaətinə görə əmək, cəmiyyət və dil arasında qarşılıqlı qırılmaz münasibətlər vardır. Əmək prosesi nəticəsində cəmiyyət yaranmışdır. Əmək prosesində yaranan qarşılıqlı ünsiyyət saxlamaq ehtiyacı dilin yaranmasını zəruri etmişdir. Əməyin xarakterinə, əmək tərbiyəsində onun yerinə geniş şərh verməklə məsələyə aydınlıq gətirmək olar. İnsanın tərbiyəsində əmək ona görə həlledicidir ki, o, insanın məqsədyönlü fəaliyyəti olub istehsalın ayrı-ayrı fazaları - istehsal, bölgü, mübadilə və istehlakla bilavasitə əlaqədardır. Ona görə də əməyə iqtisadi kateqoriya olmaqla pedaqoji prosesdə şəxsiyyətin formalaşmasında mühüm vasitə kimi baxılır.

İnsanın əmək qabiliyyəti, enerjisi onun tərbiyəsi ilə sıx bağlıdır. Bu mənada təlim əməyi prosesində öyrənənin istifadə etdiyi maddi (fiziki əmək) və qeyri-maddi (əqli əmək) qüvvə onun məqsədyönlü fəaliyyətini təmin edir.

Müasir dövrdə ümumtəhsil məktəblərində texnologiya fənninin tədris olunması, ilk növbədə şagirdlərdə texnologiya mədəniyyəti, texnoloji bilik və bacarıqlarının inkişaf etdirilməsi, öz fəaliyyətlərində onlardan məqsədyönlü istifadə edə bilmələri zəruriyyətindən irəli gəlir və şagirdlərdə həyati bacarıqların formalaşdırılması baxımından böyük əhəmiyyət daşıyır. Təbiidir ki, uşaqların mənəvi, intellektual və estetik inkişafının, dövrə uyğun texnoloji bacarıqlar əldə etməklə sosial-iqtisadi uyğunlaşmalarına zəmin yaradılması da əmək tərbiyəsindən başlayır.

Açıq etiraf etməliyik ki, insan heç vaxt malik olduğu əmək qabiliyyətini bütövlükdə sərf edə bilmir. Ona görə də yalnız peşəkarlıq qabiliyyətini əsasən iş qüvvəsi sayırlar.

"Peşəkarlıq" dedikdə haqqı ödənilən işdən söhbət gedir. İş qüvvəsi isə insanın özündən ayrılmayan əmək qabiliyyətidir. Peşəkarlıq ifadəsinin mahiyyətini onun kökündə axtarmaq lazımdır.

Peşə insanın fiziki və mənəvi qüvvəsinin tətbiq sahəsi olub, xüsusi hazırlıq və iş təcrübəsi nəticəsində nəzəri biliklərə və təcrübi vərdişlərə yiyələnmiş insanın əmək fəaliyyətidir. Bu zaman insan çalışdığı peşə ilə bağlı zəruri bilik və bacarıqlara mükəmməl yiyələnməlidir.

Peşələrin meydana gəlməsi və çoxalması da tarixi zərurətlə şərtlənməlidir.

Əməyin ilk bölgüsü müəyyən insan qruplarının və ya fərdin heyvandarlıqla və əkinçiliklə məşğul olması ilə başlamışdır. Bu zaman heyvandarlıq və əkinçilik məhsulları arasında mübadilə prosesi aparılır və tədricən mürəkkəb xarakter aldıqca tacirlərə ehtiyac yaranır. Bununla da peşə sahibləri əmək məhsullarının mübadiləsi ilə məşğul olmağa başlamışlar. Psixoloqlar insanların əmək fəaliyyətinin beş əsas motivlərini müəyyənləşdiriblər:

- maddi vəsait;
- işin stabilliyi;
- həmkarlarla ünsiyyət;
- peşənin nüfuzlu olması;
- öz ixtisasını mükəmməl bilmək (peşəkarlıq).

Hər bir peşə növü insan qarşısına tələblər qoyur. Dörd psixoloji insan tipinin hər birinə uyğun peşə növlərinin olduğu da təsdiq olunmuşdur.

Məsələn, sanqviniklər - sənət seçimi zamanı risk etməyi sevirlər. Səbir, təmkin tələb edən yeknəsək işləri xoşlamırlar. Mühəndis, məşqçi, rəhbər, həkim, satıcı, psixoloq, sürücü, jurnalist və s. peşələrə üstünlük verirlər. Xoleriklər isə ən emosional tip olub menecer, cərrah, tikinti işçisi, aşbaz, məqşçi və s. olmağa can atırlar. Fleqmatiklərdə məsələ başqadır. Bunların arasından daha çox təmkinli olanların seçdiyi peşələrə iqtisadçı, diş texniki, mühasib, kompyuter mühəndisi, katibə, makinaçı, aşbaz, proqramçı, çilingər və s. daxildir. Sakit insanlar kimi tanınan melanxoliklər isə musiqiçi, bioloq, bağban, kitabxanaçı, katibə və s. peşələrə həvəs göstərirlər.

O da həqiqətdir ki, insanın bütün həyatı boyu istifadə etdiyi əsas fəaliyyət növlərinə əməklə birlikdə oyun və təlim də daxildir. Çünki oyun elə fəaliyyət növüdür ki, onun nəticəsində heç bir maddi və mənəvi məhsul əldə edilmir. Burada müəyyən müstəsnalıq nəzərə alınmalıdır. Məsələn, yaşlıların və uşaqların işgüzar və quraşdırma oyunlarının nəzərə alınması da bu qəbildəndir.

Oyunun müxtəlif tipləri var: əşyəvi və süjetli; hərəki və didaktik; fərdi və qrup halında; rollu və qaydalı.

Oyun əsasən insanın məktəbəqədər yaş dövründə aparıcı fəaliyyət növüdür. M.Qorki qeyd edirdi ki, oyun uşağın yaşadığı və gələcəkdə dəyişdirməli olduğu mühiti dərketmə yoludur. Oyun uşaqları fiziki və psixi inkişafını təmin etməklə yanaşı, onlarda sosial keyfiyyətlər (yaşlılarla ünsiyyət) saxlamaq, həyatı başa düşmək, ətrafdakıları təqlid etmək, gələcək həyata hazırlaşmaq kimi cəhətləri formalaşdırır. Burada onlar həm də zəhmətə qatlaşmağı öyrənirlər. Aydındır ki, məktəblilərin, təhsilalanların nəzəri biliklərə, bacarıq və vərdişlərə yiyələnməsi təlim fəaliyyəti nəticəsində reallaşdırılır:

Təlim əməyi insanın fəaliyyət və davranışını bəşəriyyətin ictimai təcrübəsinin mənimsənilməsinə, təhsillənməsinə, tərbiyələnməsinə və psixoloji inkişafına yönəldən fəal bir prosesdir. Qeyd olunan insan fəaliyyəti sistemində əmək mühüm yer tutur.

İnsanın işgörmə qabiliyyəti baxımından hər üç fəaliyyət arasında bərabərlik olsa da, əsaslı fərq də nəzərə çarpmaqdadır.

Əmək fəaliyyətini oyun və təlimdən

fərqləndirən son nəticədə o, özünün məhsuldarlığı ilə fərqlənir. Məhz buna görə də insan üçün əməyi müəyyən ictimai faydalı, maddi və ya ideal məhsullar istehsalına yönəldilmiş fəaliyyət kimi qəbul edirlər. Bu fikri bir qədər də inkişaf etdirsək qeyd olunmalıdır ki, əmək insanı şəxsiyyət kimi formalaşdıran əvəzolunmaz fəaliyyətdir. Burada, şübhəsiz, oyun və təlim fəaliyyətlərinin təsir imkanları da az rol oynamır.

Tərbiyə prosesində unudulmamalıdır ki, insanın iş qüvvəsini şərtləndirən amillərə aşağıdakılar daxildir: əmək qabiliyyəti, fiziki qüvvə, zehni qüvvə, bilik-təcrübə, əmək vərdişləri.

Elmi və pedaqoji ədəbiyyatda sadə və mürəkkəbliyinə görə insan əməyi aşağıdakı kimi xarakterizə olunur:

Sadə əmək – ixtisassız əməkdir.

Mürəkkəb əmək – ixtisaslı əməkdir. Qeyd etmək lazımdır ki, mürəkkəb əmək üçün xüsusi hazırlıq, səriştə, peşəkarlıq, bilik və bacarıq tələb olunur.

Əməyə alışdırma prosesində insanın məqsədyönlü fəaliyyəti zamanı aşağıdakı prinsiplərə əməl edilməlidir: şüurluluq; məqsədəuyğunluq; ictimai faydalılıq; hərəkətlərin enerji məsrəfləri; nəticə.

Əməyin funksiyaları, onun təsnifat əlamətlərinə diqqət etdikdə bir daha aydın olur ki, o, insanın məqsədyönlü fəaliyyətinin, onun hərtərəfli inkişafının təminatçısıdır. Əməyin bütün funksiyaları yalnız insan və cəmiyyətin şəxsi və ictimai tələbatlarının ödənilməsi məqsədi ilə maddi və mənəvi nemətlərin istehsalı, hər növ sərvətin formalaşması və yığımı, elm, texnika və mədəniyyətin inkişafı və s. xidmət edir.

Tərbiyə prosesində xarakter və məzmununa görə əməyin arzuedilən, zəruri və məcburi, fərdi və kollektiv, zehni və yaradıcı olması, insanın məqsədyönlü fəaliyyətinin min illər boyu tələbatları nəticəsində yaranması da nəzərə alınmalıdır. Daha aydın desək, əl, mexanikləşdirilmiş və avtomatlaşdırılmış, aşağı, orta, yüksək texnologiyalı əmək vasitələri və üsulları mərhələlərlə insanların təfəkkür imkanlarının inkişafı nəticəsində meydana gəlmişdir. İnsan əmək prosesində təbiəti dəyişməklə özünü də təkmilləşdirir. Cəmiyyətin inkişafı əsasən əmək alətlərinin və istehsal münasibətlərinin formalaşdırılmasından asılıdır. Məhz buna görə də filosoflar haqlı olaraq insanın və cəmiyyətin yaranmasında "əmək faktorunu" əsas götürmüşlər.

Əmək insanın tərbiyə olunmasında mühüm vasitədir. Əmək tərbiyəsi insanlarda ümumi bilik və bacarıqların inkişafına, əməyə və əmək məhsullarına məsuliyyətli yanaşmanın psixoloji hazırlığına, şüurlu surətdə gələcək peşə seçiminə yönəlmiş tərbiyəçi və tərbiyə alanların birgə fəaliyyəti prosesidir. 1900-cü ildən tətbiq olunmağa başlayan əmək terapiyası əməyin fiziki və əqli qüsuru olan insanların normal fəaliyyətində əvəzsiz rol oynayır. Dünyanın inkişaf etmiş ölkələrindən ABŞ, Çin, Almaniya, Yaponiya, Rusiya, Türkiyə kimi ölkələrdə əmək terapiyası təhsil sisteminin ayrılmaz tərkib hissəsinə çevrilmişdir. Bir daha təsdiq olunur ki, əmək və insan anlayışlarını bir-birindən təcrid olunmuş şəkildə düşünmək olmaz. İnsan məhz əməkdə formalaşır, inkişaf edir, təbiətə təsir göstərir, tələblərini ödəyir. Eyni zamanda insan əmək vasitəsilə saflaşır, müalicə olunur. Əmək terapiyası yaşından asılı olmayaraq hamını, kiçikyaşlı uşaqların da təxəyyülünü inkişaf etdirir. Müşahidələrdən aydın olur ki, əmək terapiyasından sonra uşaqlar bütün hadisələrə məntiqi yanaşırlar. Çünki əmək terapiyası uşağın nəticəyönümlü fəaliyyəti ilə şərtlənir. Məsələn, uşaqlar əmək terapiyasının mühüm vasitələrindən tikmə-biçmə, kəsib-yapışdırmaq, plastilin və gil işi, səhnələşdirilmiş oyunlar, terapevtik rəsm, kulinar və sosial bacarıqlar, qum terapiyası, tanqram (həndəsi quraşdırma), təsərrüfat və məişət işləri, özünəxidmət və təbiətdə və əl

əməyi kimi növləri vardır. Qeyd olunan əmək terapiyasının hər birinin uşaqların maraqlarına uyğun tətbiqi də pedaqogikada səsləndirilmişdir.

Əmək terapiyası dedikdə fiziki qüsuru olan insanları sosial həyata qaytarmaq, ünsiyyət problemini aradan qaldırmaq, əqlin ləngiməsi zamanı və eləcə də münasibətləri tənzimləmək üçün həyata keçirilən müalicə forması başa düşülür.

Dünyanın tanınmış mütəfəkkirləri əmək və insan arasında olan ülvi bağlılığı müdrikcəsinə ifadə etmişlər:

- "Əmək insanı nəcibləşdirir, onu xeyirxah edir" (Belinski).
- "Həyatın cövhəri yalnız əməkdir,
Zəhmətsiz bir insan nəyə gərəkdir?" (Nizami).
- "Əmək həyat lampasına yanacaq tökür, düşüncə isə onu yandırır" (Marks).
- "Əmək bütün xəstəliklərin ən nəcib loğmanıdır, əməkdən fərəhli heç bir şey yoxdur" (Ostrovski).
- "İnsan eşitdikləri və dedikləri ilə deyil, əmək və fəaliyyəti ilə kamilləşir" (Edisson).

İnsanın şəxsiyyət kimi formalaşmasında əmək vasitəsilə tərbiyə (əmək tərbiyəsi) həmişə pedaqoji sahədə tədqiqat aparan alimlərin diqqətini cəlb etmişdir. Təsadüfi deyildir ki, pedaqogikaya dair tədqiqatlarda bu kimi məsələlərə dəfələrlə müraciət olunmuşdur. "Azərbaycanda əməyin və politexnizmin tarixinə dair oçerklər", "Yeniyetmələrin ailədə əmək tərbiyəsi", "Uşaq bağçalarında əmək tərbiyəsi", "Məktəblilərin əməksevərlik tərbiyəsində xalqın əməklə bağlı mütərəqqi adət-ənənələri və fikirlərindən istifadə", "Kənd ümumtəhsil məktəblərində şagirdlərin ictimai-faydalı və məhsuldar əməyinin səmərəli təşkili yolları" və s. bu kimi mövzularda dissertasiyaların müdafiə olunması mövzunun son dərəcə aktual olduğunu şərtləndirir.

Təlim işində əməyin mühüm tərbiyə vasitəsi olaraq təhsilin məzmununda təsbit olunmasını onun mahiyyəti, vasitələri, peşəyönümü ilə bağlı insanın ən zəruri fəaliyyətini keyfiyyətcə təmin etməsində axtarmaq lazımdır.

Əmək tərbiyəsi insanların əməyə, bu sahədə çalışanlara, qazanılan nəticələrə düzgün münasibət formalaşdırmağı, iştirakçıların psixoloji cəhətdən məqsədyönlü fəaliyyətə və şüurlu olaraq peşə seçməyə hazırlamağı reallaşdırır. İnsanın əməyə bağlanması obyektiv və subyektiv amillərin təsiri nəticəsində təşəkkül tapır. Həmçinin obyektiv amillər insanın şəxsi və ictimai tələbatların icrası üçün əmək fəaliyyətinə qoşulmağın zəruriliyidir. Subyektiv amillər isə insanın əməyə şəxsi münasibəti ilə əlaqədardır. Daxili təhrikedici qüvvələr kimi yaradıcı əməyə maraq, onun nəticəsinə həvəs göstərmək və əhəmiyyətini anlamaq və s. mənəvi keyfiyyətlər insanın formalaşmasında mühüm rol oynayır.

Əmək tərbiyəsinə dair anlayışların mahiyyətinin təhlili qarşılıqlı bağlılığa diqqət göstərdikdə sosial əhəmiyyət daha çox nəzərə çarpır. Təsir prosesi olan əmək insanın mövcudluğunun təbii şəraitini təmin edir. Burada eyni zamanda nitq və nitqdə insan psixatı və təfəkkürün yaranması və inkişafı da deyilənləri bir daha təsdiq edir. Tarixin bütün mərhələlərində edilən ixtiralar və kəşflər heç vaxt dərhal alqışlanmamışdır. Bunun başlıca səbəblərindən biri insan fəaliyyətinin əsası olan, onun bütün tələbatlarının təminatına xidmət göstərən sadə əməyin ixtisara düşməsidir. Biz bu mənzərəni ilk əmək alətlərinin, manifakturaları əvəz edən fabrik və zavodların, elektron hesablayıcı maşınlarını əvəzləyən kompyuterlərin və s. yaranmasından aydın görürük. Hər dəfə zərurət üzündən edilən yeniliklərin insan əməyinə olan ehtiyacın azalması istehsalatda önəmli sayılsa da onun mənfi amilləri də vardır. Yəni yaradılan maşınların hər biri öz fəaliyyətlərini sanki insanlara məxsus əməyin oğurlanması hesabına qurmuş olur. 1811-ci ildə dünyada avtomatlaşdırılmış

avadanlıqlara qarşı keçirilən "məhv etmək" qərarı qeyd olunan məntiqdən irəli gəlirdi.

Aparılan müşahidələr və statistikadan aydın olur ki, inkişaf etmiş ölkələrdə insanlar internet televiziyası qarşısında daha çox vaxt itirirlər. Həftə ərzində bu rəqəm ABŞ-da 11 saat, İtaliyada 14 saat, Niderlandda 10 saatdır.

Məlumata görə, Azərbaycanda 2010-cu ildə internet istifadəçilərin sayı 4 milyona yaxındır.

İnsan nə qədər narazılığını ifadə etsə də öz barmaqları ilə klaviaturaya təsir edərək yaratdığı texnikanı hərəkətə gətirir, işini gördürür, lazım gəldikdə axtarışa təhrik etdirir. Bununla da insandan ötrü olan əmək fəaliyyətini texnikaya ötürən insan sanki "rahatlanır". Nəticədə hərəkətsizlik, oynaqlarda ağrılar, maddələr mübadiləsinin pozulması, yuxusuzluq və s. kimi fəsadlar yaranaraq, kapilyarlarda qan dövranının fəaliyyətini əngəlləyir. İnsan şəxsiyyətinin formalaşması prosesi olan tərbiyə dünyanın çox xalqlarının dillərində lüğəti mənaca bəsləyib yetişdirmə, qidalandırma, böyütmə, alışdırma, vərdişetdirmə deməkdir. Pedaqoq alimlər bu işdə əməyin funksiyasının əvəzsiz olduğunu qeyd edirlər! Pedaqogikada "əmək tərbiyəsi" və "əmək təlimi" anlayışların mahiyyəti barədə dərslik müəllifləri professorlardan M.Muradxanov, Ə.Həşimov, N.Kazımov, Ə.Ağayev, F.Rüstəmov, A.Həsənov, F.Sadıqov, R.Hüseynzadə və s. dəyərli fikirlər irəli sürmüşlər.

Əmək tərbiyəsi dünyanı yaradıcılıqla qavramağın, təhsilə şüurlu münasibətin, öyrənənlərin vətəndaş kimi yetişməsi, mənəvi cəhətdən formalaşmasının mühüm amilidir. Əmək təlimi insan şəxsiyyətinin (öyrənənlərin) nəzəri və praktik məsələləri (problemləri) üzrə bilik, bacarıq və vərdişlər sisteminə yiyələndirilməsini təmin edir (müvafiq təlim texnologiyaları vasitəsilə ). İnsan və əmək arasında daimi qırılmaz əlaqənin problem baxımından araşdırılmasına həmişə ehtiyac vardır. Bütün bunlara baxmayaraq nəğməkar şairimiz Mikayıl Müşfiqin misralarında daha aydın ifadə olunmuşdur.

Əmək insanlığın tükənməz varı...
Əmək sərf olunan yer cənnətimdir.
Hüsnümdür, eşqimdir, səadətimdir!

*Rəyçi: dos. N.Nəcəfov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Rüstəmov F. Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri. Bakı, 1998.
2. Kazımov N., Həşimov Ə. Pedaqogika. Bakı, 1996.
3. Qasımova L., Mahmudova R. Pedaqogika. Bakı, 2012.
4. Ağayev Ş. İbtidai siniflərdə şagirdlərdə əməli işlərin təşkili texnologiyası. Bakı, 2011.
5. Azərbaycan Müəllimlər İnstitutunun II Beynəlxalq konfrans materialları. Bakı, 2012, 26-28 noyabr.

**Л.Касумова,**
**Ш.Агаев**

**Труд - важное орудие в воспитание человека**

**Резюме**

В статье указывается важность труда в воспитании подрастающего поколения и его место в учебе, а также отмечаются мудрые слова предмественников.

**L.Gassimova,**
**Sh.Agayev**

**Labor is an important tool in educating people**

**Summary**

In the article it is noted that labor is an important tool in educating people and different pedagogical thoughts on this matter are also emphasized.

# ESTETİK TƏRBİYƏ VƏ ŞƏXSİYYƏTİN MƏNƏVİ ZƏNGİNLİYİ

**Zülfiyyə Şiriyeva**
***Xalq Təhsili Muzeyinin direktor müavini***

Estetik hissə malik olmadan mənəvi cəhətdən inkişaf etmək mümkün deyil.

**Hegel**

***Açar sözlər:*** *estetik tərbiyə, mənəvi zənginlik, estetik şüur, yüksək mədəniyyət, estetik tərbiyənin prinsipləri.*

***Ключевые слова:*** *эстетическое воспитание, высокая духовность, эстетическое сознание, высокая культура, принципы эстетического воспитания.*

***Key words:*** *aesthetic education, spiritual wealth, aesthetic consciousness, high culture, principles of aesthetic education.*

"Estetika gələcəyin etikasıdır", "Estetik tərbiyə yüksək əxlaqi dəyərlərin rəhnidir"- deyənlər haqlıdır. Elm və təhsilin müxtəlif mərhələlərində estetik tərbiyəyə mənəvi zənginliyin təməl sütunlarından biri kimi baxılmış, bu sahədə qarşıya mühüm vəzifələr qoyulmuşdur. Belə bir mövqe təsadüfi deyildir. Aparılan müşahidələr göstərir ki, mənəvi cəhətdən zəngin və yüksək mədəniyyətə malik şəxsiyyətin formalaşmasında estetik tərbiyənin rolu və təsir imkanları böyükdür.

Estetik tərbiyə dedikdə, incəsənət, təbiət, cəmiyyət və insani münasibətlərdə gözəlliklərin qavranılması, onları düzgün dəyərləndirmək bacarığının, estetik zövq və qabiliyyətlərin inkişafına yönələn təsirlərin məcmusu nəzərdə tutulur. Estetik tərbiyənin başlıca vəzifəsi estetik anlayışları, mühakimələri, idealları, tələbatları, zövqləri, bədii təxəyyülü, gözəlliyi duymaq, qiymətləndirmək və paylaşmaq qabiliyyətlərini, həyata, ictimai fəaliyyətə, təbiətə, incəsənətə, davranışa münasibəti formalaşdırmaq və inkişaf etdirməkdir.

Estetik tərbiyə ahəngdar inkişaf etmiş şəxsiyyət tərbiyəsinin tərkib hissələrindən biridir. Ahəngdar inkişaf etmiş şəxsiyyəti səciyyələndirən mühüm xüsusiyyətlərdən biri mənəvi zənginlikdir. Mənəvi zənginlik anlayışı bir sıra ünsürlərlə yanaşı emosional qabiliyyəti, estetik keyfiyyətləri də ifadə edir. İnsanın estetik mədəniyyəti onun ümumi mənəvi zənginliyinin bir hissəsi, mənəvi simanın cövhəridir (2, səh. 237) .

Estetik tərbiyə nəzəri-metodoloji əsas kimi estetika elminə istinad edir. İnsanların gözəlliyə meyli və zövqü eyni zamanda estetikanın gözəllik haqqında elm adlandırılmasına səbəb olmuşdur. Gözəlliyin əsas əlamətləri isə mütənasiblik, forma və məzmun vəhdəti, ahəngdarlıqla xarakterizə olunur. Gözəlliyin başlıca mənbələrini təbiət, cəmiyyət, ədəbiyyat, incəsənət və insan gözəlliyi təşkil edir. İnsanın gözəlliyi zahiri və daxili gözəlliyin vəhdətidir. Bu vəhdətdən yaranan hislər insan qəlbini təmizləyir, saflaşdırır, onu yaxşı əməllərə yönəldir. Gözəl fikrə və qəlbə malik insan pisliyə, bədxahlığa, qəddarlığa yol vermir. Təsadüfi deyildir ki, bu cəhət dünyanın mütərəqqi insanlarını, yaradıcı ziyalıları da düşündürmüş, bu istiqamətdə dəyərli fikirlər söyləmişlər.

Livan yazıçısı və rəssamı X.Cübran yazırdı: "Gözəllik qəlbimizlə duyduğumuz

sirdir. Qəlbimiz ona tabe olaraq şadlanır və genişlənir, ağlımız isə heyrət və təəccüb içində onu sözlə ifadə edə bilməyərək donub qalır. Bu, görənin hisləri ilə görünənin həqiqəti arasında gizli zərrəciklər axınıdır; bu, insanın zahirini nurlandıran müqəddəs ruhların ziyasıdır: həyat toxumun dərinliyindən gülün rayihə və rənglərinə belə çevrilir" (4, səh. 189).

Estetik tərbiyə şəxsiyyət tərbiyəsində müstəsna əhəmiyyətə malikdir. O, tərbiyənin digər tərkib hissələri ilə bağlıdır. Akademik Məmməd Cəfər Cəfərov problemin bu cəhətindən bəhs edərək yazırdı: "Estetik tərbiyə mahiyyəti etibarilə ümumi tərbiyə işinin başqa formalarından təcrid edilmiş bir sahə deyil, əksinə, ümumi tərbiyə işi ilə sıx əlaqədardır, insan tərbiyəsini tamamlayan bir sahədir. Xüsusilə ailədə, bağçada və məktəbdəki estetik tərbiyə ümumi tərbiyə işinin bünövrəsidir. Ailə və məktəbdəki estetik tərbiyə bünövrədir. Ona görə ki, tərbiyə bir qayda olaraq hissi həyatın tərbiyəsi ilə başlayır. Əqli-intellektual tərbiyə də bu bünövrə üzərində başa çatdırılır "(5, səh. 29).

Əqli tərbiyə prosesində ümumbəşəri dəyərlərin mahiyyəti, təbiət və cəmiyyətdəki hadisələrin qanunauyğunluqları dərk edilir. Zehni qabiliyyətlərin, yaradıcı dialektik təfəkkürün, idrak motivlərinin, psixi proseslərin, nəcib insani keyfiyyətlərin təşəkkülü və formalaşması baş verir, insan zəkasının gücünə inam tərbiyə olunur.

Estetik tərbiyə insan əxlaqına güclü təsir göstərir. Ədəbiyyat və incəsənət insan mənəviyyatını zənginləşdirir, humanizm, xeyirxahlıq, səmimilik, ədalətlilik, tolerantlıq, nəciblik, təvazökarlıq, alicənablıq və s. müsbət keyfiyyətlər formalaşdırır. Estetik tərbiyənin mahiyyəti də sadalanan mənəvi-əxlaqi keyfiyyətlərlə sıx əlaqədardır. İslam fəlsəfi fikrinin görkəmli nümayəndəsi Əbu Turxan yazırdı: "Əgər insan dünyanın ahəngini duya bilməsə, təbii gözəllik qarşısında heyrətlənməsə, öz daxili mənəvi güc qaynağını da kəşf edə bilməz. Özünüdərk məqamında insan təbiətin və dünyanın gözəlliyini də əxz edir " (4, səh. 186).

Estetik tərbiyə əmək fəaliyyəti ilə də sıx bağlıdır. Əmək, yaradıcı fəaliyyət zövq mənbəyidir. İnsanın xoşbəxtliyi yaradıcı əməklə, zəhmətinin bəhrəsinin sevinci ilə bağlıdır. Düzgün aparılan əmək tərbiyəsi dünyanı qavramağın, təhsilə şüurlu münasibətin, şəxsiyyətin mənəvi və intellektual cəhətdən formalaşmasının, fiziki inkişafının mühüm amilidir. Əmək tərbiyəsi nəticəsində şəxsiyyətin əməksevərlik, ətraf təbiətə sevgi, peşə etikası, yaradıcı qabiliyyəti və digər keyfiyyətləri formalaşır.

Estetik tərbiyə zəminində aparılan bədən tərbiyəsi və idman məşğələləri sağlamlığa, ahəngdar inkişafa müsbət təsir edir. "Sağlam ruh sağlam bədəndə olar" demişlər. İstər zehni, istərsə də əxlaqi, estetik, hüquqi, ekoloji və əmək tərbiyəsi sahəsində müvəffəqiyyət qazanmağın ilkin şərtlərindən biri insanın məhz fiziki inkişafıdır. Əxlaqi saflıq və fiziki kamillik eyni zamanda mənəvi zənginlik deməkdir.

Estetik tərbiyə ekoloji şüurun inkişafına da müsbət təsir göstərir. Təbiətin gözəlliyini və zənginliyini başa düşüb qiymətləndirə bilən, ətraf mühitə qayğıkeş münasibət bəsləyən insan təbii balansın pozulmasına, havanın, suyun, torpağın müxtəlif növ tullantılarla çirklənməsinə qarşı öz imkanları daxilində mübarizə aparmaq bacarığına malik olur. Tərbiyənin tərkib hissələrinin qarşılıqlı əlaqəsi, üzvi vəhdəti estetik məziyyətlər dolğunluğu ilə diqqəti cəlb edir.

Estetik tərbiyənin mühüm bir vasitəsi təbiət gözəllikləridir. Təbiət gözəlliklər mənbəyidir. O, estetik hislərin, müşahidə qabiliyyətinin və təxəyyülün inkişafına zəngin material verir. Təbiət ən yaxşı rəssamdır. Əsrarəngiz tamaşasına hər kəsi heyran edə biləcək təbiətdə - dağların əzəmətində, yarpaqların pıçıltısında, çılğın dalğalarda, günə-

şin şəfəqlərində, çiçəklərin ətrində, küləyin səsində gözəl bir harmoniya vardır. Təbiət insana gözəlliyi, ülviliyi görmək, hiss etmək, eşitmək, duymaq səadəti bəxş edir. Təbiət həm də tərbiyəçidir. O, insanın ağlını və qəlbini zənginləşdirir, onda yüksək estetik və mənəvi hislər - vətənpərvərlik, xeyirxahlıq, həssaslıq, doğma torpağa məhəbbət, iftixar hisləri oyadır. Təbiət hadisələrinin müşahidəsi və tədqiqi təbiətə, ətraf mühitə, insanlara estetik münasibətin formalaşmasına kömək edir.

Estetik tərbiyə üzrə aparılan məşğələlər prosesində insanda estetik qavrayış, estetik hislərin yaradılması, estetik şüurun formalaşması, estetik zövq və qabiliyyətlərin inkişafı daha çox nəzərə çarpır.

Ətraf aləmin, varlığın insan tərəfindən estetik qavranması və düzgün əks etdirilməsi öz təbiəti etibarilə mürəkkəb prosesdir. Varlığın və incəsənətin bədii-estetik qavranması estetik tərbiyənin mühüm bir mərhələsini təşkil edir. Qavramanın dolğunluğu, tamlığı, parlaqlığı sayəsində insanda müəyyən estetik hislər, varlığa estetik münasibət formalaşır. İncəsənətin müxtəlif növlərində - poeziya və musiqi, teatr və kino sənəti, memarlıq və rəssamlıqda bədii təsvir vasitələrinin köməyi ilə sənətkarın istedadı, yaradıcılıq təxəyyülünün məhsulu dinləyici, tamaşaçı və ya oxucuya çatdırılır. Estetik qavramanın doğurduğu hislər çox müxtəlif çalarlara malikdir: sevinc-kədər, məhəbbət-nifrət, həzz-ikrah, gülüş, həyəcan, qorxu, təşviş və s. Estetik hislər insanda estetik tələbatların əsasında durur: insana sevinc bəxş edən, zövqünü oxşayan, qəlbini riqqətə gətirən və ruhlandıran gözəllikdən yaranan dərin emosional hisslər, həyəcanlar bədii-estetik dəyərlərlə ünsiyyətə ehtiyac doğurur. Gözəl rəqs, maraqlı aktyor ifası, cazibədar rəsm əsəri, ürəyəyatan musiqi, heykəltaraşlıq nümunəsi yeniyetmə və gənclərin, eləcə də fərqli yaş kateqoriyasından olan insanların estetik tələblərini ifadə edir, müasir tendensiyalarla səsləşən estetik hislər formalaşdırır.

Problemin belə bir cəhətini də unutmaq olmaz ki, ətraf aləmin, varlığın estetik qavranması, ona emosional münasibətin və estetik tələbatların yaranması prosesində tədricən estetik şüur inkişaf edir. Estetik şüur və hislərin təsiri ilə estetik zövq formalaşır. Estetik zövq estetik ideal baxımından gözəlliyi və onun əlamətlərini qiymətləndirmək bacarığıdır. Estetik zövq əsasında insanda estetik mühakimə - varlığa, incəsənətə əsaslı, ümumiləşmiş ideya - emosional qiymətləndirmə bacarığı formalaşır.

İncəsənət və onun ayrı-ayrı janr və formaları ilə ünsiyyətə gənc oğlan və qızların özünüdərk və öz-özünü tərbiyələndirməsi prosesi kimi də baxmaq olar. Bədii-estetik tərbiyənin nəticəsi kimi gənclərin bədii, estetik savada yiyələnməsi nəzəri-praktik əhəmiyyətinə görə diqqəti cəlb edir. Gözəlliyin təzahür sahələrini başa düşmək, qəbul etmək və qiymətləndirmək, bədii yaradıcılığa qadir olduğu bacarıqları, incəsənətin konkret növləri üzrə praktiki fəaliyyəti gənclərin şəxsiyyəti və mənəviyyatını xeyli zənginləşdirir.

Böyüməkdə olan nəslin, məktəbli və tələbə gənclərin estetik mədəniyyətinin inkişafında tədris müəssisələrində öyrədilən fənlərin (xüsusən humanitar fənlərin) rolu, təsir imkanları çox genişdir. Gənc nəslin estetik tərbiyəsi üç başlıca vəzifənin yerinə yetirilməsinə yönəlir: estetik hislərin yaradılması, estetik şüurun formalaşması və estetik qabiliyyətlərin inkişaf etdirilməsi. Müəllimlər çalışmalıdırlar ki, şagirdlər, tələbələr onları əhatə edən mühitdəki gözəlliklərə biganə qalmasın, onları duyub mahiyyətini anlasınlar. Gənc nəsil həqiqi, həyati, təbii gözəlliyi fərqləndirməyi bacarmalı, öz yaradıcılıq nümunələri ilə də başqaları üçün gözəllik və ya zövq mənbəyi olmalıdır. Bədii-estetik zövqün tərbiyə olunması da tədris müəssisələrində həyata keçirilir. Ayrı-ayrı ədəbi növ

və janrların estetik təsiri daha mütəşəkkil və davamlı olur.

Tədris müəssisələrində həyata keçirilən, estetik cəhətdən daha əlverişli və geniş yayılan tərbiyə metodlarına daxildir:

- estetik bilgilərin verilməsində istifadə edilən təlim metodları (şifahi şərh, müsahibə, illustrasiya və demonstrasiya, izah və s.);

- estetik zövq və estetik baxışların tərbiyə edilməsində istifadə edilən tərbiyə metodları (söhbət, müzakirə, disput, ədəbi-bədii gecələr və s.) ;

- estetik yaradıcılığın özünə məxsus olan spesifik metodlar (estetik fəaliyyətin təşkili metodları) (1, səh.308-309).

Estetik tərbiyənin mühüm bir istiqaməti insanın ailə və məişətdə, şəxsi həyatda və kollektivdə davranışı, ünsiyyət mədəniyyətinin formalaşdırılması ilə bağlıdır. Estetik cəhətdən istiqamətləndirilən fəaliyyəti, qabiliyyəti və bacarığı formalaşdırmaq, onu gözəllik ruhunda tərbiyə etmək mühüm əhəmiyyətə malikdir. Buna görə də gənclik gözəllik qanunları ilə yaşamalı, onları əhatə edən mühitdəki gözəlliklərə biganə qalmamalı, onları duyub mahiyyətini anlamalı, həqiqi, həyati, təbii gözəlliyi fərqləndirməyi bacarmalı, hər yerdə estetik mühit yaratmağa çalışmalıdırlar: gözəl danışmalı, gözəl davranmalı, səliqəli və zövqlə geyinməlidirlər. Zahiri görünüş gözəllik mənbəyi, estetik tərbiyə vasitəsi olduğundan geyim mədəniyyəti də vacib şərtdir. İnsanın nə və necə geyindiyi onun nəinki estetik zövqünün səviyyəsindən, həm də mənəvi aləmindən asılıdır.

Estetik tərbiyənin nəzəri-praktik əhəmiyyət kəsb etməsini göstərən əsas cəhətlərdən biri də gənclərdə estetik, yəni dünyaya emosional cəhətdən məzmunlu və mənəvi cəhətdən yüksək münasibət yaratmaq, formalaşdırmaqdır. İnsanların estetik hissləri ilkin olaraq onların öz davranış və fəaliyyətlərində əks olunur. İnsanların bir qismi ətraf aləmdəki gözəllikləri müşahidə sayəsində duyur, dərk edir. Estetik cəhətdən əlverişli olan obyektlərə - müxtəlif məzmunlu sərgilərə, muzeylərə, şəkil qalereyalarına, doğma vətənimizin əsrarəngiz guşələrinə təşkil edilən ekskursiya və gəzintilər daha çox yadda qalır.

Unutmaq olmaz ki, estetik tərbiyə insanların fərdi davranış və fəaliyyətində, həmçinin cəmiyyətdə, təbiətdə və incəsənətdə olan gözəlliklərin duyulması, şüurlu qavranılması və düzgün qiymətləndirilməsi bacarığının formalaşdırılması, inkişaf etdirilməsi və vərdişlərə çevrilməsi prosesidir.

Estetik tərbiyənin şəxsiyyətin mənəvi zənginliyindəki rolunu, təsir imkanlarını genişləndirmək üçün aşağıdakı prinsiplərə xüsusi diqqət yetirmək lazımdır:

- Estetik tərbiyə insanın əxlaqi-mənəvi tərbiyəsi, eləcə də tərbiyənin digər tərkib hissələri, dünyagörüşünün formalaşması prosesi ilə sıx əlaqəli şəkildə aparılmalıdır;

- Estetik tərbiyə prosesində fərdi qabiliyyətlərini ən dolğun şəkildə təzahür etdirməsi üçün şərait yaradılmalı, onlarda yüksək zövq və mədəni vərdişlər aşılanmalıdır;

- Estetik tərbiyədə ardıcıllığa, tədriciliyə və sistemliliyə riayət olunmalıdır;

- Estetik tərbiyə prosesində yaş və fərdi xüsusiyyətlər, qavrama qabiliyyətləri, istedad və bacarıq səviyyəsi nəzərə alınmalıdır;

- Dünya mədəniyyəti və incəsənəti haqqında biliklər sisteminin formalaşdırılmasına zəmin yaradılmalıdır;

- Estetik tərbiyənin aşılanması zamanı ailə, təhsil müəssisələri, mədəniyyət ocaqları, bədii yaradıcılıq mərkəzləri bir-biri ilə sıx əməkdaşlıq etməli, qarşılıqlı fəaliyyətləri təmin olunmalıdır;

- Estetik tərbiyə işi ilə məşğul olan müxtəlif kateqoriyalı mütəxəssislər, ilk növbədə özlərinin estetik mədəniyyət səviyyələrini yüksəltməlidirlər.

Məhz həmin prinsiplərə müntəzəm, sistemlə riayət olunması şəxsiyyət və cəmiyyətin estetik mədəniyyətinin inkişafına əhəmiyyətli

təsir göstərir.

Onu da qeyd etmək olar ki, estetik şüurun, estetik dəyərlərin, onların yaradılması və istifadə edilməsi üsullarının, bədii estetik fəaliyyət formalarının, estetik tərbiyə ənənələrinin məcmusundan ibarət olan estetik mədəniyyət ən yüksək mənəvi keyfiyyətlərdən sayılır ( 3, səh. 209) .

Estetik mədəniyyətin tərbiyəsi - şəxsiyyətin qəbul etmək və anlamaq qabiliyyətinin məqsədyönlü formalaşması prosesi, həmçinin fəaliyyətinin müxtəlif aspektlərinə bütün gözəllikləri əlavə etməkdir. Estetik mədəniyyətə yiyələnmək şəxsiyyətin zənginliyinin əsas meyarlarından biri, insanın mədəni səviyyəsinin göstəricisidir. Estetik tərbiyə nəticəsində yaranan estetik mədəniyyət mənəvi zənginliyin tərkib hissəsi kimi əməkdə, incəsənətdə, davranışda gözəlliyi, xeyirxahlığı duymağı, qiymətləndirməyi və fərqləndirməyi inkişaf etdirir, formalaşdırır. Peyğəmbərimiz (s.ə.s.) estetikaya və gözəlliyə çox əhəmiyyət vermişdir. Yaşadığı dövrün çətin şəraitində səhra mühitində evin ətrafında gün keçirmişdir. Ən çətin şəraitdə belə ən gözəl, ən estetik, ən keyfiyyətli mühiti yaratmağa çalışmışdır. Peyğəmbərimizin bu gözəl əxlaqından nümunə götürülməlidir. İnsanın mənəvi zənginliyi onun estetik qabiliyyəti və emosional fəaliyyətinin kamilliyi ilə müəyyən edilir. Problemin bu cəhəti pedaqoji prosesin iştirakçılarının hər zaman diqqət mərkəzində olmalıdır.

Beləliklə, estetik tərbiyə şagirdlərdə bədii zövq, estetik mədəniyyət, rəng, forma və məkan hissiyyatı, milli musiqi və tətbiqi sənət növlərinə məhəbbət, habelə ümumbəşəri sənət nümunələrinə maraq, yaradıcılığa meyil və digər mənəvi keyfiyyətləri formalaşdırır.

*Rəyçi: prof. V.Xəlilov*

**İstifadə edilmiş ədəbiyyat**

1. İbrahimov F., Hüseynzadə R. Pedaqoqika. Dərslik 2 cilddə. II cild. Bakı: Mütərcim, 2013.

2. Əfəndiyev M., Əfəndiyeva S. Şəxsiyyət-mədəniyyət sistemi: sosial-fəlsəfi təhlil. Bakı: Elm, 2012.

3. Xəlilov V. Seçilmiş əsərləri. I cild, Bakı: Nərgiz, 2011.

4. Aforizmlər: seçilmişlərdən seçilmişlər. Prof. S.Xəlilovun təqdimatında. Bakı: Çaşıoğlu, 2012.

5. Cəfərov M. Estetik tərbiyə, ailə və məktəb. Bakı: Maarif, 1967.

**З.Шириева**

**Эстетическое воспитание и духовное богатство личности**

**Резюме**

В статье говорится об эстетическом воспитании как основном факторе формирования личности с моральной точки зрения. Под понятием эстетического воспитания подразумевается совокупность влияний, направленных на осмысление красоты искусства и жизни, также развитие эстетических способностей.

**Z.Shiriyeva**

**Aesthetic education and spiritual wealth of personality**

**Summary**

In the article it is spoken about aesthetic education which is considered a major factor in formation of personality. By the concept aesthetic education means the combination of influences, aimed at understanding of art and life. Thus, the development of aesthetic abilities helps formation of student personality.

# UŞAQLARIN DAVRANIŞI VƏ TOLERANTLIQ MƏDƏNİYYƏTİ

**Kifayət Məmmədova**
***Təhsil Problemləri İnstitutunun elmi işçisi***

***Açar sözlər:*** *məktəbəqədər təhsil, tərbiyə, təlim, uşaq, şəxsiyyət, tolerantlıq, inkişaf, ailə, müəssisə, mədəniyyət, valideyn, tərbiyəçi.*

***Ключевые слова:*** *дошкольное образование, воспитание, обучение, дети, личность, толерантность, развитие, семья, учреждение, культура, родитель, воспитатель.*

***Key words:*** *pre-school education, upbringing, education, child, personality, patience, development, family, establishment, culture, parent, educator.*

Uşaqların dostu və himayəçisi olan ulu öndərimiz Heydər Əliyev demişdir ki, uşaqlar bizim gələcəyimizdir. Gələcəyimizi nə cür tərbiyə edəcəyiksə, böyüdəcəyiksə, ölkəmizin, millətimizin, dövlətimizin gələcəyi bundan asılıdır.

Elm və texnikanın sürətlə inkişaf etdiyi müasir dövrdə uşaqların davranışına ardıcıl diqqət yetirilməlidir. Tolerantlıq mədəniyyətinin tərbiyə olunması problemi çoxmillətli və bir-birindən fərqli mədəniyyətlərə malik xalqlar yaşayan Respublikamızda ən aktual məsələlərdən biridir. Müasir cəmiyyətdə tolerantlıq mədəniyyəti xüsusi əhəmiyyət kəsb etməklə, o, həm ümumi insani dəyər kimi, həm də sosial fəaliyyət forması kimi çıxış edir. Tolerantlıq mədəniyyətinin hərtərəfli öyrənilməsinin vacibliyi onunla izah olunur ki, müasir mədəni insan yalnız savadlı insan deyil, həm də özünəhörmət hissinə malik və ətrafdakıları qəbul edə bilən insan olmalıdır. Bu barədə İslam dinində də çox dəyərli fikirlər vardır. Tarixdən məlumdur ki, İslam qardaşlığı sayəsində möminlər irq, qövmiyyətçilik, məzhəb kimi fərqliliklərə baxmayaraq, əsrlər uzunu birlik, bərabərlik hüzuru ilə yaşamışlar. İnsan doğulduğu gündən etibarən fiziki inkişaf baxımdan təbiət qanunlarına tabe olsa da, müəyyən dövrdən sonra özünü dəyişdirmə, yönləndirmə, təkmilləşdirmə vəzifəsi və iradəsi ilə qarşılaşır. Ona görə də böyüməkdə olan nəslin, xüsusən uşaqların və yeniyetmələrin böyüklərlə və yaşıdları ilə qarşılıqlı münasibəti prosesində hörmət, əməkdaşlıq və qarşılıqlı anlayış əsasında ünsiyyətini formalaşdırmaq vacib məsələlərdən biridir.

Sosial-pedaqoji səviyyədə tolerant mədəniyyət əsasında tərbiyələndirilmə işi, cəmiyyətin tolerant şəxsiyyətlərə olan zəruri tələbatın həyata keçirilməsi hələ məktəbəqədər yaşdan başlamalıdır. Bu, uşaqların sosial və şəxsi ünsiyyəti, fəaliyyətindəki uğurlarının əsas şərtidir. Tolerant mədəniyyət prinsipləri sosial münasibətlərin bütün sahələrində vacib şərtlərdəndir. Tolerantlıq mədəniyyətinin formalaşdırılmasının təməli elə məktəbəqədərdən başlayır. Çünki uşaq şəxsiyyətinin inkişafını sürətləndirən tolerantlıq mədəniyyəti davranış mədəniyyətinin digər növləri kimi hələ uşaqlıq dövründən rüşeym şəklində formalaşaraq inkişaf edir. Lakin bunlar öz-özünə deyil, uşağı əhatə edən böyüklərin, valideyn və tərbiyəçilərin onu düzgün istiqamətləndirməsi nəticəsində həyata keçirilərək, onların ciddi nəzarəti altında daha da uğurlu alınır.

Tolerant şəxsiyyətin inkişafında ilk olaraq ailənin böyük rol oynaması danılmaz

bir faktdır. Ailə daxilində valideynlərin bir-birinə qarşı olan münasibətləri övlad tərbiyəsində mühüm şərtlərdəndir. Valideynlər sərtlikdən, şiddətdən, kobud davranışlardan bacardıqca kənarlaşmalıdırlar. Onların, xüsusən atanın adil davranışı, fədakarlıq misalları ailənin məmnunluğunu artırır, səmimi münasibətlərin bərqərar olmasına səbəb olur. Uşaq ilk davranış qaydalarını ailədə öyrənməlidir. Yalnız ata-ana deyil, uşağı əhatə edən digər ailə üzvlərinin davranışları da uşağın tərbiyəsinə böyük təsir edir. Valideynlərin gözəl davranışları övladları üçün ən dəyərli və əvəzolunmaz tərbiyə nümunəsidir. Belə ailələrdə valideynlərin təşkil etdikləri yüksək tərbiyəvi mühit övladlarının gözəl və nümunəvi tərbiyəyə yiyələnmələri ilə yanaşı, eyni zamanda uşaqların sağlam gələcəklərinin təminatçısı olur və bütün bunlar da valideynlərin cəmiyyət üçün sağlam şəxsiyyət formalaşdırmalarına təkan verir. Övlad tərbiyəsindəki uğur ailə başçıları arasındakı xoş ünsiyyətlə, valideynlərin övladlarının dostlarına çevrilməsi, onlara qarşı diqqəti artırmaqla, uşaqların fikirlərinə hörmətlə yanaşılması, uşaqların suallarını səbrlə cavablandırmaları ilə və s. bu kimi digər müsbət tərbiyəvi təsir üsulları ilə əlaqədardır. Özlərinin nümunəvi tərbiyə üsulları ilə yanaşı, valideynlər eyni zamanda uşaqlara qarşı daim diqqəti artırmalı, onlara ətrafdakı insanlarla, həmyaşıdları ilə hörmət və ehtiramla davranmağı, möhkəm iradəliliyi, digərlərinə qarşı dözümlü münasibət, güzəştə getmək bacarıqları formalaşdırmağa çalışmalıdırlar. Bütün bunlar uşaq şəxsiyyətinin inkişafının ailədə qoyulan təməlinin daha da möhkəm olmasını təmin edir. Valideynlərin övlad tərbiyəsi ilə bağlı Peyğəmbər (ə.s.) buyurmuşdur: “Valideynin övladına gözəl tərbiyədən qiymətli hədiyyəsi ola bilməz” [1].

Qeyd etdiyimiz kimi, uşağın inkişafı üçün ailə mühiti vacibdir, lakin uşaq şəxsiyyətinin sistemli və məqsədəuyğun şəkildə inkişaf etdirilməsində məktəbəqədər təhsilin rolu da danılmazdır. Bununla bağlı İslahat Proqramında göstərilir: “Cəmiyyət öz gələcəyini təmin etmək məqsədi ilə yeni nəslin yüksək səviyyədə hazırlığına nail olmalı və buna görə də təhsil üstün inkişaf etdirilən sahəyə çevrilməlidir” [2]. Çünki ölkəmizin gələcəyi olan uşaqların şəxsiyyətinin inkişafına məktəbəqədər müəssisələrdə təlimin sistemliliyi, tərbiyəçinin şəxsi nümunəsi birbaşa təsir göstərir. Uşaq şəxsiyyətinin inkişafında tolerantlığın mühüm əhəmiyyət kəsb etməsini nəzərə alaraq hər bir tərbiyəçi uşaqlarda milli-mənəvi şüurun inkişaf etdirilməsinə çalışmalı, xalqımıza, mədəniyyətimizə, bütünlüklə milli dəyərlərimizə qarşı uşaqlarda böyük məhəbbət formalaşdırmalı və hər şeydən əvvəl, soykökümüzü, Azərbaycan xalqının qədim ənənələrini uşaqlara tanıtmalıdırlar. Bununla yanaşı, uşaqlara Respublikamızda yaşayan digər xalqların mədəniyyətləri, dinləri, adət-ənənələri, dilləri haqqında, eyni zamanda ümumbəşəri dəyərlər, insan hüquqlarını, azadlıq və insan üstünlüyünün vacibliyi, insanlara qayğı, onların dərdinə acımaq, onları qəbul etmək bacarığı və s. öyrədilməsi onlarda tolerantlıq mədəniyyətinin inkişafına böyük təsir göstərir.

Uşaqların öz ailəsinin, ətrafındakıların dünyaya baxışları, adətləri, ünsiyyəti və s. tam fərqli olduğundan, onların qrup daxilində digər millətdən olan uşaqlarla sosial münasibətlər qurması o qədər də asan olmur. Odur ki, onların bu münasibətləri qurmalarına tərbiyəçi daim dəstək verməli, təlimdə bərabər imkanların vacibliyini nəzərə alaraq, bu işə xüsusi diqqət yetirməlidir.

Kiçikyaşlı uşaqlarda tolerantlığın formalaşdırılmasında oyundan istifadə edilməsi çox effektlidir. Çünki oyun məktəbəqədər yaşlı uşaqların fəaliyyətinin əsas növü olduğundan, bu proses zamanı, müəyyən tədbir-

lərin və bayramların keçirilməsi uşaqların dünya xalqlarının ənənələri ilə daha yaxından tanış olmaları məqsədi daşıyır. Belə ki, Azərbaycan xalq oyunları, süjetli-rollu oyunlar, xalq bayramlarının keçirilməsi, məsələn, “Novruz bayramı” ənənələri, dini bayramlarımız, məsələn, Qurban Bayramı, yaxud da respublikamıza yaxın digər qonşu ölkələrin xalq bayramlarının öyrənilməsi və ya müxtəlif xalq nağıllarının personajlarının rollu oyunlarda yaradılması şəxslərarası münasibət problemlərinin həlli məqsədi daşımaqla, uşaqlarda tolerantlığın inkişafına yönəldilir.

Məktəbəqədər yaşlı uşaqlarda şəxsiyyətin və tolerantlığın inkişafında əməyin də mühüm rolu vardır. Məhz əmək zamanı onlarda təsəvvür, müşahidə və qaydaların mənimsənilməsi prosesi baş verir və bu da uşaqlarda əməyin mənimsənilmiş formalarının sonralar müstəqil təcrübədə tətbiqinə, yəni təcrübi bacarıqların fəaliyyətə tətbiqinə çevrilir. Əvvəlcə uşaqlar mənimsənilən normaları və davranış qaydalarını (kiçik yaşlarda) təqlid yolu ilə izləyirlər, sonralar isə nisbətən mürəkkəb qaydaların və normaların (böyük məktəbəqədər yaşlarda) mahiyyətini anlamağa başlayırlar. Uşaqlar əməklə müstəqil məşğul olduqları zaman yoldaşları ilə birlikdə fəaliyyət göstərir və bu prosesdə onlarda yoldaşları ilə ümumi rəyə gəlmək, fəaliyyətin hansısa mərhələsində müəyyən məsələlərlə bağlı güzəştə getmək kimi vərdişlər formalaşır. Kreativ məhsulun uğurlu alınması üçün təşəbbüs göstərmək qabiliyyətləri tolerantlıq bacarığının səviyyəsini ölçməyə imkan verir. Bunun da nəticəsində tərbiyəçi uşağın tolerantlıq mədəniyyətinin inkişafındakı müəyyən çatışmazlıqları izləyir, onun təmin olunması üçün hansısa tapşırıqlar verməyə nail olur.

Məktəbəqədər yaşlı uşaqların şəxsiyyətinin inkişafına yönəldilmiş tolerantlıq mədəniyyətinin öyrənilməsində aşağıdakılar nəzərə alınmalıdır:

- cəmiyyətin yüksək tolerantlıq mədəniyyətinə malik şəxsiyyətlər yetişdirilməsinə olan tələbatı və məktəbəqədər təhsil müəssisələrinin qoyulmuş bu məsələnin həyata keçirilməsinə hazır olması;
- məktəbəqədər yaş dövründən başlayaraq, tolerantlığın tərbiyə olunmasının vacibliyi və məktəbəqədər yaşlı uşaqlara tolerant mədəniyyəti komponentinin nəzəri əsaslarının lazımi qədər aşılanması;
- problemin elmi-metodiki təminatına təcrübi tələbatların ödənilməsi;
- fəaliyyət prosesində başqaları ilə qarşılıqlı əlaqə zamanı lazım olan tolerant mədəniyyətini dəyər kimi qəbul etməyə imkan verən motivasiyanın yaradılması;
- müxtəlif həyat situasiyalarında davranış və ünsiyyət qaydaları haqqında biliklərin əldə olunmasına kömək edən koqnitiv bacarıqların formalaşdırılması;
- mübahisə, konflikt şəraitində dözüm, özünü idarə edə bilmək qabiliyyətinin inkişafını müəyyənləşdirən emosional iradənin, müxtəlif milli və dini mənsubiyyətə malik insanlara münasibətdə xeyirxahlıq, şəfqət, dözümlülüyü təmin edən davranışın formalaşdırılması;
- digər insanlarla qarşılıqlı ünsiyyət və fəaliyyət zamanı vacib olan tolerant mədəniyyətinin dəyər kimi qəbul edilməsi;
- mübahisə, konflikt yaratmaqdan və aqressivlikdən uzaq olmaq və belə xoşagəlməz şərait yarandıqda, dözüm və özünüidarəetmə bacarıqlarının formalaşdırılması;
- ətrafdakılara, yaxud müxtəlif millətə və digər mədəniyyətə malik insanlara qarşı münasibətdə sədaqət, xeyirxahlıq və dözüm tərbiyə etmək.

İnsan həyatının məzmunu sevgidən, tolerantlıqdan, incəsənətdən, gözəllik və estetikadan zövq almaqdır. Keyfiyyətsiz, estetikadan uzaq həyat tərzi müasir insana əsla yaraşmaz.

Keyfiyyətdən uzaq həyat tərzi insanın düşüncə tərzinə, həyatdan aldığı zövqə, hədəflərindəki gözəllik, estetika və zarafat anlayışına, ədəb-ərkandakı söhbətinə, süfrə davranışına qədər bütün həyatına təsir edir.

Keyfiyyətə əhəmiyyət verilmədikdə və insanların həyatında estetika, gözəllik kimi məfhumlar olmadıqda isə dünya bir növ cəhənnəmə çevrilir.

Bu kobud həyat tərzinin tam əksinə, keyfiyyət, təmizlik və etikanın əhəmiyyəti Quranda da xüsusi vurğulanmışdır. Uca Allah bir ayəsində: "Libasını təmizlə! Pisliklərdən uzaqlaş," - demişdir. Deməli, davranışın məzmununda yüksək əxlaqi keyfiyyətlər də öz yerini tutur. Üstün əxlaq anlayışı həyatın hər sahəsinə, insanların bütün düşüncə və davranışlarına kübarlıq qazandırır.

Beləliklə, məktəbəqədər yaşlı uşağın şəxsiyyətinin inkişafına böyük təsir göstərən tolerantlıq mədəniyyətinin bünövrəsinin ailədə qoyulması və bu prosesin sistemli olaraq məktəbəqədər müəssisələrdə davam etdirilməsi məsələlərində valideyn və tərbiyəçilərin birgə səyi uğurlu nəticəyə səbəb olur.

*Rəyçi: prof. M.İlyasov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasının Təhsil sahəsində İslahat Proqramı. Bakı, 1999.

2. Cabbarov M. Təhsil sistemi milli dəyərlərə və peşəkar kompetensiyalara malik Azərbaycan vətəndaşı yetişdirməlidir.// Azərbaycan məktəbi, 2013, № 5.

3. Altı yaşlı uşaqların məktəbə hazırlanması. N.M.Kazımov, Y.Ş.Kərimovun redaktəsi ilə. Bakı: Maarif, 1980.

4. Əmrahlı L. Uşaqların məktəbə hazırlanmasının psixoloji məsələləri. Bakı, 2006.

5. Lunkov A. Pedaqoqiçeskaya pomoş roditelyam v podqotovke detey k şkolnomu obuçeniyu. Moskva, 1999.

6. "Düşünən insan" jurnalı, 2014, №31.

**К.Мамедова**

**Поведение детей и культура толерантности**

**Резюме**

В статье говорится о поведении толерантстве у детей, о его значении в формировании у них уважения, терпимости к окружающим, а также о воспитании положительного поведения учащихся.

**K.Mammadova**

**Children's behavior and tolerance culture**

**Summary**

In this article the role of children's personality development of a culture of tolerance, the importance of the development, language, religion and race aslılı, the children of the people who respect and demonstrating patience in the social arena approach or as a member of the community to bring their national respect for moral values is about style.

# ƏTRAF MÜHİTİN QORUNMASINDA EKOLOJİ TƏLİM VƏ TƏCRÜBƏNİN ƏHƏMİYYƏTİ

**Yusif Mahmudov**
***Qobustan rayonu, Dərəkənd kənd tam orta məktəbinin müəllimi***

***Açar sözlər:*** *ekoloji təhsil və ekoloji tərbiyə, ekoloji dünyagörüş, təbiətə qayğıkeş münasibət.*

***Ключевые слова:*** *экологическое образование и воспитание, окружающая среда, бережное отношение к природе.*

***Key words:*** *ecological education and education, ecological outlook, careful attitude to the nature.*

Təbiətə qayğıkeş münasibət, ekoloji təfəkkürün yaranması əhalidə və gənc nəsildə ekoloji tərbiyə və mədəniyyətin hansı səviyyədə olmasından asılıdır. Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra ətraf mühitin mühafizəsi və ekoloji təhsillə bağlı qəbul edilmiş ekoloji qanunçuluq bu problemin həllində atılmış mühüm addımlardır. Ekoloji təhsilin məqsədi təbiətə məsuliyyət hissi formalaşdırmaqdır. Ekoloji təhsil dedikdə, ümumi ekoloji mədəniyyətin və məsuliyyətin formalaşmasına yönəldilmiş fasiləsiz təhsil, tərbiyə və inkişaf prosesi başa düşülür. Ekoloji təhsilə ehtiyac insan həyatı üçün əlverişli mühitin təmin edilməsinə olan zərurətdən yaranmışdır. Ekoloji mədəniyyətin formalaşmasında əsas vasitələrdən biri məqsədyönlü ekoloji təhsil almaqdır [3]. Çünki ətraf mühitə düzgün münasibət ekoloji bilik nəticəsində formalaşır. Gənclərdə müasir tələblərə cavab verə bilən davranış vərdişlərinin formalaşmasında da ekoloji tərbiyənin faydası çoxdur. Bu konteksdən çıxış edən alimlər haqlı olaraq, "Ekoloji aspekti olmayan pedoqoji mövzu tanımırıq" qənaətinə gəlirlər [5]. Ona görə də yeni ekoloji dünyagörüşün yaradılmasında pedaqogikanın roluna xüsusi əhəmiyyət verilir, təlimin təşkilində ekoloji tələblərin nəzərə alınması, ekoloji tərbiyənin ön plana çəkilməsi, əxlaq formalarına ekoloji əxlaqın daxil edilməsi kimi məsələlərə xüsusi diqqət göstərilir.

Şagirdlərin idrak fəaliyyətinin və sərbəst işləmək qabiliyyətinin inkişaf etdirilməsi onlarda ətraf mühiti dolğun qavramaqda, ekoloji şüur və təfəkkürün, ekoloji dünyagörüşünün formalaşmasında xüsusi əhəmiyyət kəsb edir. Gənc nəslin, eləcə də cəmiyyətin ekoloji mədəniyyətinin fasiləsiz inkişaf etdirilməsi təbiəti milli və ümumibəşəri sərvət kimi qorumağı qarşıya qoyur. Ekoloji tərbiyə əxlaqi cəhətdən təbiətə münasibətdə fəal, şüurlu mövqeyin formalaşmasını tələb edir. Cəmiyyətlə təbiətin qarşılıqlı münasibəti sistemində ahəngdarlığın zəruri amili kimi çıxış edən ekoloji tərbiyə insan həyatının böyük rolunun dərk edilməsinə kömək etməklə yanaşı, hərtərəfli inkişaf etmiş şəxsiyyətin formalaşması işində bilavasitə iştirak edir [1]. Ətraf mühitə münasibətimizi çağdaş dövrün tələbləri səviyyəsinə yüksəltmək istəyiriksə fasiləsiz olaraq ekoloji təhsilə yiyələnməliyik.

Ölkənin təhsil sistemində səriştəli təhsilverənlərə, ən yeni texnologiyalara əsaslanan infrastruktura malik, keyfiyyət nəticələri və əhatəliliyinə görə dünya ölkələri sırasında qabaqcıl mövqe tutan təhsil sistemini yaratmaq, iqtisadi cəhətdən dayanıqlı və dünyanın aparıcı təhsil sistemlərinin standartlarına uyğunlaşmaq məqsədi ilə "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" qəbul edilmişdir. Fikrimizcə, gənc nəsildə həm də ətraf mühitə münasibəti

yeni tərzdə formalaşdırmaq üçün strategiyada qarşıya qoyulan vəzifələr hər bir təhsilverən üçün əsas olmalıdır. Qeyd etmək lazımdır ki, hazırkı şəraitdə elm və təhsil sahəsində ekologiyanın inkişafı öz əksini tapıb: bu sahədə yeni istiqamətlər müəyyənləşdirilmişdir. İlk növbədə ölkənin ali və orta ixtisas təhsili müəssisələrində ekoloji fakültə və kafedralar açılıb, ekoloji tədris şəbəkələri genişlənib. Respublikanın ümumtəhsil məktəblərində “Təbiətşünaslıq” (hazırda “Həyat bilgisi”), biologiya və coğrafiya fənlərinin tərkibində “Ümumi ekologiya” tədris olunur. Ekoloji təhsilin səviyyəsini yüksəltmək məqsədi ilə bəzi ümumtəhsil məktəbləri təbiət təmayüllü məktəblərə və ekoloji liseylərə çevrilmişdir.

Gənc nəsildə ekoloji dünyagörüşün formalaşması istiqamətində həyata keçirilən tədbirlər canlı təbiətə qarşı humanist münasibətin yaranmasına səbəb olur. Apardığımız tədqiqatlar göstərir ki, uşaq, yeniyetmə və gənclərin ekoloji təhsil və tərbiyəsi ilə məşğul olan dövlət müəssisəsi kimi Azərbaycan Respublikası Təhsil Nazirliyinin Respublika Ekoloji Tərbiyə və Təcrübəçilik Mərkəzinin (RETTM) bu sahədəki fəaliyyəti məktəblilərdə ekoloji tərbiyəsinin düzgün qurulmasına kömək edir. Mərkəzin əməkdaşları təhsil sahəsində aparıcı mütəxəssislərin birgə iştirakı ilə məktəbəqədər tərbiyə müəssisələri üçün nəzərdə tutulmuş “Ətraf mühit və biz” ekoloji təlim-tərbiyə proqramı və metodik tövsiyələr, habelə ümumtəhsil məktəblərinin I-IV, V-VII və VIII-XI sinifləri üçün ekoloji dərnək, klub və digər birləşmələrin nümunəvi tədris proqramlarını işləyib hazırlamış və çap etdirmişdir. Dərnək məşğələlərində proqrama uyğun “Ailə və ətraf mühit”, “Cəmiyyət və ekologiya”, “Ekoloji jurnalistika”, “Kimyanın ekoloji aspektləri”, “Kənd təsərrüfatı və ekologiya”, “Sənayenin ekologiyası”, “Meşəçilik”, “Turizm və ekologiya”, “Floristika”, “Gülçülük” “Heyvanların ekologiyası”, “Nəqliyyat və ətraf mühit” və s. mövzular tədris olunur.

Şagirdlər məşğələlərdə əldə etdikləri bilikləri vaxtaşırı iştirak etdikləri ekoloji tədbirlərdə, tədris-təcrübə sahəsində, çöl təcrübə işlərində praktiki olaraq tətbiq etməyi bacarmalıdırlar. Bu cür vərdişləri tədricən inkişaf etdirmək onlarda ekoloji tərbiyənin yaranması və möhkəmlənməsinə səbəb ola bilər. Bakı şəhərinin Nizami rayonundakı 10, 32, 62 və Xətai rayonundakı 91 nömrəli, Cəbrayıl rayon Cocuq Mərcanlı və Şahvəlli kənd, eləcə də Qobustan rayonunun Dərəkənd kənd tam orta məktəblərində təşkil etdiyimiz “Ən yaxşı məktəbli ekoloq-jurnalist” müsabiqələri (ümumi ekoloji problemlər mövzusunda) və “Şagird elmi-praktik konfrans”ları (biomüxtəlifliyin saxlanması və qorunması mövzusu üzrə) bu cəhətdən səmərəli olmuşdur. Müxtəlif üsullarla, məsələn, “Breyn-Rinq”, viktorina, konfrans, müsabiqə, dəyirmi masa, müsahibə və s. şəklində həyata keçirilən belə tədbirlərdə şagirdlər həvəslə iştirak edir və yüksək fəallıq göstərirlər. “Müharibə və ekologiya” mövzusunda keçirilən konfranslarda məktəblilər Qarabağ müharibəsi, bölgənin təbiəti və ona müharibənin neqativ təsirləri barəsində axtarışlar aparır, müəyyən məlumatlar toplayır, eyni zamanda ekologiya haqqında biliklərini zənginləşdirirlər.

Respublikamızın ümumtəhsil məktəblərində ekologiya “Ümumi biologiya”nın “Ekologiyanın əsasları” və “Biosfer təlimi” adlı fəsillərinin tərkibində verilib. Bunun az olmasını nəzərə alaraq M.Babayev və Q.Mustafayev tərəfindən “Ümumi biologiyaya ekologiyadan əlavələr” adlı vəsait yazılmış və tədris proqramına daxil edilmişdir. Fikrimizcə, bu da tələbatı tam ödəmir. Yaxşı olar ki, ümumtəhsil məktəblərində ekologiya təhsilin bütün səviyyələrində öyrənilməsinə şərait yaradılmışdır.

Ekologiyanın digər təbiət elmləri ilə əlaqəli tədrisi üçün aşağıdakı imkanlar vardır; bir çox bitki və heyvan növləri haqqında məlumat, onların bioloji xarakteristikası, ərazilər üzrə yayılmalarında rol oynayan coğrafi mühit, təbii komplekslərin xarakteri, yaşadıqları ərazidə kimyəvi çirklənmənin ətraf mühitə zərərli təsiri, növlərin həyat

tərzi və davranışlarında baş verən dəyişikliklərdə fiziki qanunauyğunluqların mövcudluğu, təbiət hadisələrinin səbəb və nəticələri, radiasiya şüalanması və ətraf təbii mühit.

Ekoloji problemlər o qədər çoxalıb ki, indiki dövrdə onu yalnız bir elm çərçivəsində öyrənməklə həll etmək çətinlik törədir. Ona görə də ekologiyanın həm elm, həm də bir fənn kimi inteqrativ şəraitdə öyrənilməsi zəruridir. Məsələn, ekologiya elminin və ekoloji problemlərin tarixi aspektdən araşdırılması müasir dövrdə çox aktualdır. Sənətkarlıq nümunələrində, folklorda, adət-ənənələrdə əhalinin təbiətə münasibəti, bitki və heyvanların qorunma üsulları gənc nəsil üçün bir örnək ola bilər. Bu baxımdan ekologiyanın əsaslarının ümumtəhsil məktəblərində öyrədilməsi zamanı onun təkcə biologiya və coğrafiya (az miqdarda kimya) fənlərinin daxilində deyil, tarix, dil-ədəbiyyat, fizika, riyaziyyat, informatika və s. kimi fənlərlə birgə öyrənilməsi də effektli səmərə verə bilər.

*Rəyçi: prof. M.Həsənov*

**İstifadə edilmiş ədəbiyyat**


1. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum). // Azərbaycan məktəbi, 2005, № 6.
2. "Əhalinin ekoloji təhsili və maarifləndirilməsi haqqında" Azərbaycan Respublikasının Qanunu. Bakı, 2002.
3. Məmmədov N., Suravegina İ. Ekologiya. Ümumtəhsil məktəblərin 9-11-ci sinifləri üçün dərs vəsaiti. Bakı: Maarif, 2000.
4. Mustafayev Q., Əlizadə E. Ekologiya. Bakı: Ozan, 2001.
5. Mustafayev Q. və Məmmədov A. Həyat və Poeziya (ekoloji aspektlər). Bakı: MBM, 2006.


**Ю.Махмудов**

**Значение экологического обучения и практики в охране окружающей среды**

**Резюме**

Известно, что охрана окружающей среды является одной из основных проблем современности. Бережное отношение к природе, экологическое мышление молодого поколения зависят от уровня экологического образования и культуры. Законодательства и решения, принятые, в связи с защитой окружающей среды и экологическим образованием, после восстановления государственной независимости Азербайджана, стали важными шагами для решения этой проблемы. В Концепции Национального Образования основное внимание уделяется экологическому образованию и воспитанию молодого поколения. В результате исследования делается к выводу, что защита окружающей среды имеет особое значение для экологического обучения и практики.

**Y.Mahmudov**

**Value of ecological training and practice in tnvironmental protection**

**Summary**

The article is about environmental protection which is the main problem of modern era. It is noted that careful attitude to the nature, ecological thinking of young generation depends on the level of ecological education and culture. Legislations and decisions were made in connection with environmental protection and ecological education and important steps were taken for the solution of this problem. The result of research showed that environmental protection plays special role in ecological training ant practice.

***Sağlamlıq***

# SAĞLAM NƏSLİN YETİŞDİRİLMƏSİNDƏ TİBBİ BİLİKLƏRİN ROLU

**Həqiqət Hacıyeva**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti, pedaqogika üzrə fəlsəfə doktoru***
**Aybəniz Cəfərova**
***həkim-pediatr***

***Açar sözlər:*** *sağlam nəsil, tibbi biliklər, gigiyena, profilaktika, fəal təlim, tütün, herbari, video görüntülər, prezentasiya.*
***Ключевые слова:*** *здоровое поколение, медицинские знания, гигиена, профилактика, активное обучение, табак, гербарий, видеозаписи, презентация.*
***Key words:*** *healthy generation, medical knowledge, hygiene, prophylaxis, active training, tobacco, herbarium, video footages, presentation.*

Hazırda bütün dünyada tibbi biliklər xeyli genişlənmiş və dərinləşmişdir. Bu da şaxələnərək bir sıra müstəqil elmlərə başlanğıc vermişdir. İndi insanların sağlamlığını tibb elminin müxtəlif sahələrində çalışan mütəxəssislərin böyük bir ordusu qoruyur. Bununla belə insanlar öz sağlamlığını təkcə həkimlərin, tibb işçilərinin öhdəsinə buraxmırlar və buraxa da bilməzlər. Deməli, hər kəs ixtisasından asılı olmayaraq minimum tibbi biliklərə yiyələnməlidir; bunun təməli, başlanğıcı isə, əlbəttə, təhsil ocaqlarında qoyulmalıdır.

Sağlamlığın qorunması cəmiyyəti daim narahat edən problemlərdəndir. Sağlamlığa təsir edən mənəvi, iqtisadi, siyasi, ekoloji, maddi, psixoloji amillərin artması bu problemin aktuallığını bir daha artırmışdır. Bu gün dünya ölkələri və vətəndaşlar arasında gedən çəkişmələr, terror və işğalçılıq, fövqəladə hallar, təbii fəlakətlər, ekoloji proseslər minlərlə insanın, xüsusilə uşaqların sağlam yaşamalarını, inkişafını təhlükə altına almışdır. Dünyada mənbəyi bilinməyən xəstəliklər də bu qəbildəndir. Təəssüf ki, qloballaşma şəraitində müxtəlif ölkələrdə birdən tüğyan edən epidemiya çox sürətlə yayılır. Son vaxtlar insanların sağlamlığı üçün ciddi təhlükə yaratmış ebola epidemiyasını da buna aid etmək olar. QİCS-lə mübarizədə müəyyən uğurlar əldə edilsə də, hələlik bu sahədə dönüş anı baş verməmişdir, lakin alimlərin səyi nəticəsində epidemiya ciddi müqavimətlə qarşı-qarşıyadır. 2030-cu ildə buna qalib gəlmək ümidi də yaranmışdır. Bundan başqa bu və ya digər səbəblər üzündən minlərlə insanlar aclıqdan, xəstəliklərdən, maddi və mənəvi cəhətdən əziyyət çəkirlər. Xəstəliklərin artması, sağlam yaşam tərzinin pozulması bir tərəfdən də sağlamlıqla bağlı bilik və bacarıqlarının olmamasından irəli gəlir. Uşaqlara kiçik yaşlarından sağlamlığın qorunmasına dair tibbi-gigiyenik bilik və bacarıqların aşılanması bu problemin həllinin əsas şərtlərindəndir. Bu sahədə məktəbəqədər müəssisələrin tərbiyəçilərinin, pediatrların, terapevtlərin üzərinə də böyük vəzifələr düşür.

Məhz ona görədir ki, uşaqlara gigiyena və sağlamlığa dair sadə anlayışlar hələ məktəbəqədər yaşlarından verilir. Məktəbin ibtidai siniflərində fənlərin tədrisində şagirdlərə insan orqanizminin quruluşu, onun sağ-

lamlığı, sağlamlığın qorunması, ona təsir edən müsbət və mənfi amillər öyrədilir. Şagirdlərin yaşına uyğun tibbi anlayışların öyrədilməsi imkanları fənlərin, o cümlədən “Həyat bilgisi” fənninin məzmununda da öz əksini tapmışdır. Şagirdlərə verilən tibbi-gigiyenik biliklər yuxarı siniflərdə biologiyanın tədrisində, ali məktəblərdə tibbi biliklərin əsaslarının öyrədilməsində daha da genişləndirilir və dərinləşdirilir.

Bildiyimiz kimi, uşaqların sağlamlığına ciddi təsir göstərən amillərdən biri zərərli vərdişlərdir ki, onlardan biri kiçik yaşlardan şagirdləri cəlb edən siqaret çəkilməsidir. Ona görə də tərbiyəçi və müəllimlərin əsas vəzifələrindən biri zərərli vərdişlərlə, o cümlədən siqaret çəkilməsi ilə daim mübarizə aparmaqdır. Siqaret sağlamlığa ciddi zərər vuran elə vərdişdir ki, ona uşaqlar, xüsusilə oğlanlar kiçik, gənc yaşlarından meyil göstərirlər. 10-16 yaşlı uşaqlar arasında aparılan sorğuda bir qrup uşaqlar onu kişilik əlaməti hesab etdiyini söyləmiş, onun sağlamlığa zərər vurmasına inanmamış, başqa bir qrup ondan əyləncə kimi istifadə edildiyini bildirmiş, digərləri fikri dağıdan vasitə olduğunu qeyd etmişlər. Lakin müəllimlər mövzuların tədrisində siqaretin nə kişilik, nə əyləncə olduğunu, hətta sağlamlıq üçün ciddi təhlükə yaratdığını inandırıcı faktlarla izah etməlidirlər. Bu sahədə məktəblərimizdə müəyyən profilaktik işlər görülür. Lakin bu işlər illərlə təkrarlanan, ənənəvi formada, cəzalandırma, qadağanetmə və şablon fikirlər, tövsiyələr söylənilməklə həyata keçirilir. Siqaretə qarşı təbliğat ali məktəb tələbələri arasında daha dərin elmi sübutlarla şərh edilməlidir. Təhsil ocaqlarında siqaretin qadağan olunmasına dair tədbirlər buna kömək etsə də, onun birdəfəlik ləğvinə son qoya bilməmişdir.

Son illər uşaqların inkişafında, dünyagörüşündə, həyat hadisələrinə yanaşma tərzində fərqlərin yarandığını nəzərə alaraq, tərbiyəçilər, müəllimlər problemin həllində də yeni yanaşma tərzinə keçməli, təlimdə, xüsusilə tibbi-gigiyenik biliklərin verilməsində fəal təlim metodlarından, daha səmərəli vasitə və formalardan istifadə etməlidirlər. Fənlərin, o cümlədən biologiyanın məzmununda tibbi biliklərin verilməsi baxımından imkanlı mövzular müəyyən edilməli, onlara çox yer verilməlidir. Daha dəqiq ifadə etsək, bu işin ciddiliyinə elə orta məktəbdən başlanılmalıdır.

Uşaqlar, yeniyetmələr və gənclər arasında siqaret çəkməklə mübarizə problemi son dərəcə mürəkkəb və ciddidir. Bu işin məktəbdə iki əsas istiqamətdə aparılması səmərə verir. Birincisi, siqaret çəkməyin son dərəcə təhlükəli nəticələrə səbəb olması barədə uşaq və yeniyetmələrdə inam yaradılmasına doğru yönəldilmiş izahat və tərbiyə işi sadəcə olaraq “siqaret çəkmək sağlamlığa zərər vurur” ifadəsi ilə məhdudlaşmamalıdır. Hər bir yeniyetmə siqaret çəkməyin onun sağlamlığı üçün törədəcəyi nəticələri aydın təsəvvür etməlidir. İşin bu istiqamətinə daha çox diqqət verilməli, istifadə olunacaq vasitə və metodlar konkretləşdirilməlidir. Ali məktəblərdə isə, tələbələrlə daha açıq söhbətlər aparılmalıdır. Onlar bu barədə daha çox şey bilməlidirlər.

Heç də az əhəmiyyətli olmayan ikinci istiqamət – ictimai yerlərdə uşaq və yeniyetmələrin siqaret çəkmək imkanlarını məhdudlaşdıran, onların siqaret çəkməsinə yol verməyən tədbirlərin gücləndirilməsidir. O da aydındır ki, ictimai yerlərdə tələbələr daha çox olurlar. Onlar bütün məsuliyyəti dərk edərək, bu tələblərə ardıcıl əməl etməlidirlər.

Siqaret çəkənlərlə sorğudan məlum olmuşdur ki, siqaret çəkməyə alışmanın ən yüksək nöqtəsi 12-15 yaşlara düşür, ona görə də ümumtəhsil məktəblərində siqaret çəkməyə qarşı profilaktika və mübarizə işləri aşağı siniflərdən başlanmalıdır. Tədqiqatlar göstərir ki, kişilərin 84,2%-i 14-16 yaşlarından siqaret çəkməyə başlamışlar. Hazırda

məktəblərdə 6-8-ci sinif şagirdləri arasında siqaret çəkənlərin sayının artması nəzərə çarpır. Bunu nəzərə alaraq, ümumtəhsil məktəblərində siqaret çəkməklə mübarizəni və ona qarşı profilaktikanı gücləndirməyə daha aktual problem kimi baxılmalıdır. Bu barədə dünyada aparılan işlər də onların nəzərinə çatdırılmalıdır.

Uşaq və yeniyetmələr arasında siqaret çəkməyin zərəri haqqında müvəffəqiyyətli izahat və tərbiyə işinin mühüm şərti ailə və məktəbin tələblərinin vahidliyi və sıx əməkdaşlığı, fəal sanitar-maarif işinin həyata keçirilməsi, bir yaş qrupundan digərinə keçən zaman varisliyə riayət olunmasıdır.

Siqaret çəkməklə mübarizəyə məktəbin pedaqoji kollektivləri və tibbi heyəti tərəfindən birinci dərəcəli məsələ kimi baxılmalıdır. Ziddiyyətli suallara aydın və elmi cavablar verilməlidir. İstər ümumtəhsil, istərsə də ali məktəblərdə müəllimlər dərslərdə şagirdlərin bu sahədəki suallarını elmi əsaslarla cavablandırmağa çalışmalıdırlar.

Məsələyə bir qədər konkret yanaşsaq, VI-XI sinif şagirdləri ilə siqaret çəkməyin zərəri haqqında izahat və tərbiyə işi təbiət fənlərinin öyrənilməsi zamanı aparılır. VI sinif şagirdlərinə tütün haqqında əsas məlumat biologiyanın bitkilər kursunda verilir. Müəllim şagirdlərə bitkilərin quruluşuna, əhəmiyyətinə, həyat tərzinə, tərkibinə dair məlumat verir, zəhərli, sağlamlıq üçün zərərli olan bitkilərdən tütün, tənbəki barədə onları məlumatlandırır. Mövzunun tədrisində şagirdlərə evdə sağlamlıq üçün zərərli bitkilər haqqında məlumat toplamaq da tapşırılır. Bununla da uşaqların diqqəti siqaretin sağlamlığa zərbə vurmasına cəlb edilir.

Kursun bəhs və mövzularına uyğun olaraq müəllim bitkilərin quruluşunu öyrədərkən onların sağlamlığa zərər yetirən orqanlarını tanıtmağa da nail olur, həm də herbari, video görüntülərindən istifadə edir. Beləliklə, müəllim tədris etdiyi mövzunu zərərli vərdişlərlə əlaqələndirərək şagirdlərin diqqətini sağlamlığa zərər vuran tütün, tənbəki kimi bitkilərə cəlb edir. Bunlar həm də ümumtəhsil məktəblərində siqaret çəkməklə mübarizə üzrə profilaktik işin gücləndirilməsinə xidmət edir.

Şagirdlərin suallarının cavablandırılması və siqaretin sağlamlığa zərər vurmasına dair tam inamın yaradılması imkanları kursun "Çiçəkli bitkilərin təsnifatı. Örtülütoxumlu (çiçəkli) bitkilər şöbəsi" bəhsində genişliyi ilə verilir. Bəhsin "Badımcançiçəklilər fəsiləsi" mövzusunda müəllim fəsilənin bir çox zəhərli bitkiləri (quşüzümü, xanımotu, dəlibəng, batbat və s.) haqqında məlumat vermək imkanı əldə edir. Həmin bitkiləri şəkillər, təbii bitki, herbari, video görüntülər əsasında şagirdlərə tanıdır, onlarla rəftar qaydalarını öyrədir. "Badımcançiçəklilər" fəsiləsi öyrədilərkən qeyd etmək lazımdır ki, tütün öz qohum bitkilərindən bir mühüm əlamətlə fərqlənir: onun tərkibinə son dərəcə zəhərli maddə - nikotin daxildir. Göstərilir ki, nikotin tütün tüstüsünün əsas tərkib hissəsi olub, ən qüvvətli bitki zəhərlərindən biridir. Müəllim fəsilənin xüsusiyyətlərini öyrədərkən tütün bitkisinin şəkli, herbarisi, yaxud təbii olaraq bitkinin özünü nümayiş etdirməklə şagirdlərə lazımi məlumatı verir. Tütün və siqaretə dair bilikləri bir-biri ilə əlaqələndirir, siqaretin sağlamlığa vurduğu ciddi zərərləri izah etmək imkanı qazanır. O, ilk növbədə tütün bitkisindən hazırlanan siqaretin tüstüsü ilə bir neçə təcrübənin aparılmasını şagirdlərinə həvalə edir. Təmiz şüşə üzərinə siqaret tüstüsü verməklə hisin əmələ gəldiyini nümayiş etdirir. Göstərir ki, siqaret çəkilməsi ilə orqanizmə daxil olan tüstü də ağciyərlərdə belə hisin yığılmasına səbəb olur və tədricən tənəffüsü çətinləşdirir. Banka içərisində çiy ət üzərinə verilmiş siqaret tüstüsünün yandırıcı, çürüdücü təsirini göstərir. Bankaya salınmış canlı cücüyə siqaret tüstüsünün təsirini də şagirdlər müşahidə edir və görürlər ki, tüstü

çoxaldıqca heyvan narahat olur və nəhayət, ölür. Sağlam bitki yarpağına, gövdə, kök, çiçək, meyvə və toxumuna siqaret tüstüsünün mənfi təsirini göstərən təcrübələrin aparılması və nəticələrin sinfə gətirilməsi şagirdlərə tapşırılır. Belə təcrübələr şagirdlərin siqaret tüstüsünün sağlamlıq üçün zərərli olduğuna inamını artırır.

"İnsan" kursunun (IX sinif) tədrisində əsas vəzifə şagirdləri orqanizmin həyat prosesləri və quruluşu haqqında elmi biliklərlə silahlandırmaq və davranışın sanitar-gigiyena normalarını öyrətməklə siqaret çəkməyin insan orqanizminə, xüsusilə böyüməkdə, inkişaf etməkdə olan orqanizmə zərərli təsirinin fizioloji izahını verməkdən ibarətdir. Kursun tədrisində müəllim hər bir orqanın quruluşunu, funksiyasını, fiziologiyasını izah edərkən onun normal fəaliyyətini pozan amilləri də göstərməlidir. Belə amillərdən biri olan siqaretin orqanizmə zərəri aydınlaşdırılır. Bu işə şagirdlər də cəlb olunur, onlara siqaretin müxtəlif orqanlara zərərinə dair materiallar hazırlayıb yoldaşları qarşısında çıxış etmək tapşırılır.

Cinsiyyət tərbiyəsinə aid xüsusi söhbətlər aparan zaman siqaret çəkməyin kişi və qadın orqanizminin reproduktiv orqanlarına zərərli təsirinə, ananın siqaret çəkməsinin, onun uşaqlarının həyat qabiliyyətinə və sağlamlıq vəziyyətinə təhlükə yaratdığı xüsusi qeyd edilir.

Bütün bunlarla şagirdlərə siqaretin sağlamlığa mənfi təsirini sübut edən müəllim şagirdlərin bir hissəsinə ev tapşırığı kimi siqaretin faydasına dair məlumat və prezentasiya hazırlamağı, nəticələri təqdim etməyi tapşırır. İkinci qrupa siqaretin sağlamlığa, insanın ayrı-ayrı orqanlarına: dişlərə, mədəyə, ağciyərlərə, qaraciyərə, sinir sisteminə, ürəyə, böyrəklərə vurduğu zərərə dair məlumat toplamaqla prezentasiya hazırlayıb təqdim etməyi tapşırır.

Sonra şagird qruplarının liderləri tədqiqatlarının nəticələri təqdim edilir və müzakirə aparılır. Beləliklə də, sağlamlığa ciddi zərər vuran siqaretlə mübarizə aparmaq, ona "yox" demək yollarını şagirdlər müstəqil olaraq öyrənmiş olurlar. Hər bir qrupun çıxışı, təqdimatı qiymətləndirilir, faydalı təkliflər bəyənilir. Müəllim onların müəyyən etdiyi səmərəli yolları aydınlaşdırır və şagirdlərinə belə faydalı işdə fəallıq göstərməyi tövsiyə edir. Şagirdlərə siqaret əleyhinə reklamlar, tövsiyələr, bukletlər hazırlamaqda, onları əhali arasında yaymaqla təbliğat işlərinə qoşulmaqda köməklik göstərir.

X-XI siniflərdə ümumi biologiya kursunun tədrisində siqaret çəkməyin zərəri haqqında şagirdlərə daha əsaslı biliklər verilir. Tütün tüstüsünün kimyəvi tərkibi, orqanizmə, ayrı-ayrı orqan və sistemlərə patoloji təsiri şagirdlərə daha ətraflı izah edilir.

Tədqiqatın nəticələrindən aydın oldu ki, biologiya dərslərində müntəzəm verilən tibbi biliklər təlimin keyfiyyətini yüksəltməklə, şagirdləri zərərli vərdişlərdən uzaqlaşdırmaqla yanaşı, onların sağlam, cəmiyyətə yararlı vətəndaşlar kimi inkişafına müsbət təsir edir. Ali məktəblərin tədris planlarına əsasən tibbi biliklərin əsaslarının öyrədilməsi bu işə çox müsbət təsir göstərir.

Son vaxtlar siqaretin zərərsizləşdirilməsi sahəsində müxtəlif tədbirlər görülür. Bu problem bütün dünyanın diqqət mərkəzindədir. Bu tədbirlərdən biri də elektron siqaretlərdir. Əlbəttə, elektron siqaretlər adiləri kimi zərərli deyil, amma yenə də onları çox vaxt ideallaşdırırlar. Çoxları düşünür ki, belə siqaretlərin tərkibində nikotin yoxdur, lakin əslində, bu, belə deyil. Elektron siqaretlərdə xüsusi kapsullar vardır ki, maye nikotin qazabənzər maddəyə çevrilərək ağciyərlərə düşür. Amma, məlumdur ki, ağciyərlər hər hansı bir tüstünün udulması üçün nəzərdə tutulmayıb. Belə ki, nəfəs alarkən o, bronxların daralmasına səbəb olur – bu, orqanizmin qoruyucu refleksidir və onun mütəmadi olaraq təkrarlanması sağlamlıq üçün zərərlidir. Düzdür,

siqaret çəkənlər üçün elektron siqaretlər adi siqaretlərdən daha yaxşıdır, çünki tərkibində qətran yoxdur. Amma burada siqaret çəkməyənlər üçün zərərli psixoloji təsirlər yenə də qalmaqdadır. Hər şeydən əvvəl, elektron siqaretlər adi siqaretlərdən heç də geri qalmayaraq gənclərdə siqaret çəkmək dəbini yaradır və onları bu təhlükəli vərdişə alüdə olmağa həvəsləndirir. Təhlükə ondan ibarətdir ki, onlar tamamilə zərərsiz görünür və onları çəkməyə başlayaraq insanlar sonralar adi siqaretlərə keçə bilərlər. Ona görə də, heç bir zahiri aldanış tərbiyə prosesində rəğbətlə qarşılanmamalıdır. Siqaretə "yox" demək bütün tərbiyə sisteminin diqqətindən yayınmamalıdır. Tibbi biliklər burada da hamının köməyinə gəlməlidir. Müəllim praktiki işlərə daha çox söykənməlidir.

Yaxşı haldır ki, radio və televiziya verlişlərində, mətbuatda məqalələr çap olunur, siqaretin zərərinə dair çox geniş və məzmunlu verilişlər hazırlanıb, təqdim olunur. Lakin bunlar kifayət qədər təsirli olmur. Bəzən bunlara ötəri fikirlər kimi yanaşılır. Ona görə də, təhsil ocaqlarında, ictimai yerlərdə siqaretə dair təsiredici təbliğatlar aparılmalı, müəllimlərin, mühazirəçilərin siqaretə dair sözləri, tövsiyələri daha elmi və inandırıcı olmalıdır. Gənclərin siqaretdən uzaqlaşması üçün hər cür pedaqoji-psixoloji yanaşmalara əl atılmalıdır.

*Rəyçi: prof. H.İsayev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əliyev S., Hacıyeva H., Mikayılzadə N. Tibbi biliklərin əsasları. Ali məkləblər üçün dərslik. Bakı:ATU, 2004.

2. Hacıyeva H. Ümumtəhsil məktəblərində biologiya fənninin tədrisində tibbi biliklərin öyrədilməsi üzrə işin sistemi. Monoqrafiya. Bakı: Ünsiyyət, 2007.

3. Зайко Н. Патологическая физиология. Москва, 2004.

**Х. Гаджиева,**
**А.Джафарова**

**Роль медицинских знаний в воспитании здорового поколения**

**Резюме**

В статье говорится о значении привития медицинских знаний в здоровье учеников общеобразовательной школы. Подчеркиваются возможности привития медицинских знаний при преподавании каждого предмета, в том числе в деле обучения способам предотвращения от вредных привычек. В статье показывается, что возможности разъяснения отрицательного влияния курения, широко распространенного среди населения, особенно среди молодежи, занимают широкое место в содержании биологических дисциплин. Также разъясняются эффективные пути решения проблемы в преподавании биологии. В статье даны полезные рекомендации о вреде курения здоровью молодого поколения и о защите от этой вредной привычки.

**H.Hajiyeva,**
**A.Jafarova**

**The role of medical knowledge in rearing of healthy generation**

**Summary**

The article deals with the significance of giving medical knowledge in the health of general education school pupils. It is noted that in the teaching of each subject there are opportunities to learn medical knowledge as well as the ways of protection from harmful habits that are the medical and social problem. It is showed that the opportunities to explain negative effects of smoking on health that widely spread among the people, particularly adolescents are given in detail in the theme of biological subjects. Efficient ways of problem solution in the teaching of biology are shown. Useful recommendations are given on the harm of smoking on health of young generation and protection against it.

**_Kurikulum_**

# FİZİKİ TƏRBİYƏ FƏNNİNDƏ MƏZMUN DƏYİŞİKLİYİ

**Orxan Soltanov**
***Bədən Tərbiyəsi və İdman Akademiyasının bədən tərbiyəsi və nəzəriyyəsi metodikası kafedrasının müəllimi***

***Açar sözlər:*** *hərəki qabiliyyətlər, hərəki normativlər, məntiqi təfəkkür.*
***Ключевые слова:*** *физические способности, физические нормативы, логическое мышление.*
***Key words:*** *motor skills, physical standards, logical thinking.*

Fiziki tərbiyə fənninin tədrisinin səmərəli təşkili, ona müasir tələblər baxımından yanaşılması öz ifadəsini məzmunda da tapmışdır. Aydındır ki, bu sahədə mövcud olan nəzəri və praktik məsələləri həyata keçirmədən fənnin əhəmiyyətinə, onun mahiyyətinə, insanın fiziki cəhətdən ahəngdar inkişafına nail olmaq qeyri-mümkündür.

Ümumtəhsil məktəblərində kurikulumun əsas tələblərinə uyğun olaraq ibtidai siniflərdən başlayaraq fiziki tərbiyə fənninin tədrisi zamanı şagirdlərin potensial imkanları nəzərə alınmalı, onların yaradıcı təxəyyülünə və təfəkkürünə lazımınca istinad edilməlidir. Bu baxımdan, uşaqlara təkcə biliklər vermək deyil, həm də şagirdlərin fiziki cəhətdən harmonik inkişafının təmin edilməsinə, onların vətənin müdafiəsinə, şəxsi həyat, professional peşə fəaliyyəti üçün hazırlıqlı və hərəki fəaliyyət mədəniyyətinə malik tərbiyə edilməsinə fikir verilməlidir. Ənənəvi təhsil dövründə informasiya təminatı və nəzəri biliklər müəllim tərəfindən aparılırdı, bacarıq və vərdişlər müəllimin tədrisi metodikasına əsaslanırdı. Hərəki qabiliyyətlərin inkişafı, mənəvi iradi xüsusiyyətlərin tədrisi prosesi dərsdə nəzərdə tutulmurdu. Çox zaman müəllimlər tərəfindən uşaqların yaş imkanlarının, maraqlarının, ətraf aləm haqqında təsəvvürlərinin zənginləşdirilməsi unudulur və onların biliklərinin konkret təcrübi fəaliyyətlə əlaqələndirmək arzuları nəzərə alınmırdı.

Təhsil Nazirliyi tərəfindən hazırlanmış, təhsilin 2003-2013-cü illəri əhatə edən inkişaf strategiyasına əsasən ümumi təhsilin məzmunu ilə bağlı, təhsilin keyfiyyəti və real tələbatlara uyğunluğu komponenti üzrə kurikulum islahatı lahiyəsi həyata keçirilir. Burada fiziki tərbiyə fənn kurikulumu üzrə dörd məzmun xətti verilmişdir:

- İnformasiya təminatı, nəzəri biliklər
- Hərəki bacarıq və vərdişlər
- Hərəki qabiliyyətlər
- Şəxsiyyətin mənəvi iradi xüsusiyyətlərinin formalaşdırılması.

Burada məzmun materialları bacarıqlar formasında ifadə edilmiş və nəticəyönümlü xarakterə malikdir. Bu zaman fiziki tərbiyə fənninin təlimi prosesində şagirdlərin idraki, emosional, xüsusən də psixomotor fəaliyyətləri diqqət mərkəzində saxlanılmışdır.

Ənənəvi dərslərdən fərqli olaraq müasir kurikulumlara əsaslanan ibtidai siniflərdə fiziki tərbiyə dərslərinin tətbiqi, informasiya təminatı və nəzəri biliklər, bacarıq və vərdişlər əvvəlcədən müəyyənləşdirilmiş standartlar əsasında aparılır ki, tədris prosesində şagirdlərin fiziki tərbiyə üzrə hansı kompetensiyalara malik olmaları nəzərə alınmışdır. Mənəvi iradi xüsusiyyətlər şagirdlərin dərs prosesində ünsiyyət qurması, əməkdaşlıq

etməsi, iradi xüsusiyyətlərin formalaşdırılması kimi məsələlər dərsin məzmununa daxil edilmiş standartlarda əks olunmuşdur.

Təlimin məqsədinə müvafiq olaraq fiziki tərbiyə dərsləri fərdi, frontal və qrup şəklində həyata keçirilir.

Bu zaman ciddi reqlamlaşdırılmış, hissə-hissə öyrətmə, oyun, yarış, nəzarət, söz, əyani təlim üsullarından istifadə olunur. Dərsin istiqamətindən və təlimin vəzifələrindən asılı olaraq dərs giriş, hazırlayıcı, əsas və təkmilləşmə, kombinələşmiş, nəzarət istiqamətli olmalıdır. Fiziki tərbiyə fənninin tədrisi zamanı müəllim hərəki bacarıqların və vərdişlərin formalaşmasına, hərəki qabiliyyətlərin inkişafına istiqamətlənmiş təlim üsulları ilə yanaşı, həm də idraki və emosional bacarıqların formalaşmasına xidmət göstərən metodlardan da istifadə etməlidir. Bunun əsasını isə məzmun xətləri üzrə müəyyənləşdirilmiş standartlar təşkil edir. Təlim prosesi idraki, emosional və psixomotor bacarıqların inkişafını təmin edən ayrı-ayrı metodlardan dərsin məqsədinə müvafiq istifadə etməklə həyata keçirilir.

Şagird fəaliyyətinin təşkili üç formada həyata keçirilir: kollektiv, qrup və fərdi.

Kollektiv – şagirdlərin fəaliyyətinin təşkilinin bu formasından ümumi sinfin eyni bir hərəkəti və ya tapşırığı yerinə yetirdiyi halda istifadə olunur.

Qrup – sinif şagirdlərinin bir neçə qrupa bölünərək fərqli tapşırıqları yerinə yetirdiyi halda tətbiq olunur.

Fərdi – hər bir şagirdə öz hərəki potensialını nümayiş etdirmək, ümumi kollektivdə hərəkət və fəaliyyəti ilə özünü təzahür etdirmək imkanı verir.

Fiziki tərbiyə dərsləri və idman məşğələləri xüsusən ibtidai siniflərdə bir-birinə oxşar, yorucu, gərgin deyil, şagirdlər üçün fəal istirahət zəminində təşkil olunmalıdır. Həmin məqsədlə hər bir dərsin məzmununa şagirdlərin fiziki tərbiyə üzrə bacarıq və vərdişlərinin metodik tələblərə uyğunluğunun yoxlanılması, dərs prosesində yol verilmiş nöqsanların aradan qaldırılması və yerinə yetirilən hərəkət texnikasının müşahidə olunması vacib şərtlərdəndir. Belə dərslər nəticə etibarilə şagirdlərlə aparılan tədris prosesinin əsasını təşkil edəcək, fəal istirahət üçün şərait yaradacaq, onlarda hərəki qabiliyyətlərinin inkişafına, müşahidəçilik, tədqiqatçılıq, uzaqgörənlik qabiliyyətinin artırılmasına və təfəkkürlərinin inkişaf etdirilməsinə şərait yaradacaqdır.

*Rəyçi: dos. D.Quliyev*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikası Ümumi Təhsilin Milli Kurikulumu. Bakı, 2006.

2. Фокин Г.Ю. “Уроки физкультуры в начальной школе”. М.: Школьная пресса, 2003.

3. Quliyev B., Acalov E., Nəsrullayev M. Ümumtəhsil məktəblərində bədən tərbiyəsi tədrisinin təkmilləşdirilməsi yolları. Bakı, 1982.

4. Kərimov Y. İbtidai təlim, problemlər, vəzifələr. Bakı, 2000.

**О.Султанов**

**Тематические изменения в предмете физического воспитания**

**Резюме**

В статье рассказывается, об эффективном организации в начальных классах уроков по физическому воспитанию на основе современных курикулумов в отличии от традиционных.

**O.Sultanov**

**Content changes in physical education**

**Summary**

In this article traditional physical education lesson is opposed to the modern curriculum based physical education lesson in primary classes.

# MÜƏLLİM HAZIRLIĞINDA MİLLİ DƏYƏRLƏRİN ROLU

**Şahismayıl İsmayılov**
***tarix üzrə fəlsəfə doktoru***

**Gülnarə Qurbanova**
***Azərbaycan Müəllimlər İnstitutu Mingəçevir filialının müəllimi***

***Açar sözlər:*** *milli dəyər, mənəvi dəyər, maddi dəyər, təhsil, məktəb.*
***Ключевые слова:*** *национальные ценности, моральные ценности, материальные ценности, образование, школа.*
***Key words:*** *national values, moral values, material values, education, school.*

Hər bir xalqın tarixən yaranıb formalaşmış milli dəyərləri vardır. Bu milli dəyərlər hər bir xalqda özünəməxsus olur. Milli dəyərlər vahid coğrafi ərazidə yaşayan və bu ərazini özünə Vətən bilən insanların birgə fəaliyyəti ilə yaranıb, nəsildən-nəsillərə ötürülən dəyərli bir xəzinədir. Bu dəyərlər vahid coğrafi ərazidə formalaşsa da, onun məzmunu mütəmadi olaraq dünyada baş verən hadisələrlə sıx əlaqədə olmuş, təbii fəlakətlər, tarixi şəxsiyyətlər, amansız müharibələr, hegemonluq edən dinlər, cəmiyyətdə baş verən ictimai-iqtisadi dəyişikliklər fonunda yeniləşmişdir. Xalqın yaşadığı ərazinin strateji mövqeyi və bu strateji mövqeyin əhəmiyyəti, bu ərazinin təbii sərvətləri də milli dəyərlərin məzmununa ciddi şəkildə təsir göstərmişdir.

Bəllidir ki, milli dəyərlər həmişə milli mənəviyyatla bağlı olduğundan bir-biri ilə qovuşmuş, müxtəlif zaman kəsiklərində sərhədləri yaxınlaşmışdır. Milli dəyərlər daima inkişaf edən tarixi bir prosesdir. Digər elmlərə aid tədqiqatlarda bunların vəhdətinin nəzərə alınmaması bir o qədər də mənfi nəticələr verməmişdir. Ancaq müəllim hazırlığından, tərbiyə prosesindən, bir sözlə, pedaqoji elmlərdən söhbət gedəndə milli dəyərlərə birtərəfli yanaşmaq düzgün sayılmaz. Mənəvi dəyərlərlə maddi dəyərlərin milli dəyərlər baxımından vəhdətdə tədqiq olunması, həmçinin onların müəllim hazırlığında yerinin vəhdət şəklində nəzərdən keçirilməsi daha səmərəli nəticələr əldə etmək baxımından olduqca əhəmiyyətlidir. Birlik halda götürülən dəyərlər xalqın, həmçinin formalaşan gəncliyin dünyaya inteqrasiya prosesində düzgün mövqe tutmasında önəmli rol oynayır. Maddi və mənəvi dəyərlərin vəhdəti olan milli dəyərlər yalnız tərbiyə ilə bağlı tədqiqatların, o cümlədən pedaqoji prosesin obyekti kimi qiymətləndirilib araşdırıla bilməz, bu, həmçinin dövlətin inkişaf ideologiyasının əsası kimi nəzərdən keçirilməlidir.

Milli dəyərlərin yaranması və inkişafı daimi, əbədi bir prosesdir. Amma onun nəticəsi milli dəyərə çevrilmə zamanı vaxt anlamında ya qısa, ya da uzun bir müddətdə baş verə bilər. Milli dəyərlərin həm maddi, həm maddi olmayan mənəvi cəhətləri özündə birləşdirməsi, onlar arasındakı əlaqənin, birliyin

gücünü göstərən faktdır. Bu əlamət həm qısa müddətdə, həm də uzun müddətdə formalaşan milli dəyərlərə eyni dərəcədə aiddir. Məhz bu xüsusiyyət milli dəyərləri dövlətçilik ənənələrinin formalaşmasının, milli ideologiyanın yaranmasının əsasına gətirir. Bunlar da, həmçinin bir-biri ilə sıx bağlıdır və təbii ki, vəhdət şəklində inkişaf edir. Cəmiyyətin formalaşması bu vəhdətin necə nəzərə alınmasından ciddi şəkildə asılıdır. Bütün bunlar müəllim hazırlığında milli dəyərlərin yerini düzgün müəyyənləşdirməyin həllini vacib bir problem kimi qarşıya qoyur. Deməli, müəllim hazırlığında milli dəyərlərin yerinin müəyyənləşdirilməsi üzrə iş də digər komponentlərdən təcrid olunmuş şəkildə öyrənilə bilməz. Müəllim hazırlığında bu iki vəzifənin həyata keçirilməsi əsas məqsəd olduğu üçün milli dəyərlərə məhəbbət tərbiyəsi üzrə iş aparılması zəruri tələbata çevrilir.

Əgər müəllim özü Vətəni sevir, amma bu hissi şagirdlərinə aşılamağa səy etmirsə, o müəllimin fəaliyyətindən müsbət nəticə gözləməyə dəyməz. Bu fikri eyni ilə milli dəyərlərə aid etsək, ikinci vəzifənin qloballığı göz qabağında canlanar. Bugünkü məktəblinin, cəmiyyətin sabahkı həyatının bütün sahələrinə ya müsbət, ya da mənfi nüfuz edəcəyini nəzərə alsaq, məlum olur ki, bu nüfuzun faydalılığında müəllimlərin, gələcək pedaqoqların çox böyük rolu olacaq.

Vahid Vətən anlayışı milli dəyərlər anlayışından ayrılmazdır. Professor N. Şəmsizadə yazır: “Müasir ideologiya sivil ictimai sistemlərə qovuşmaq, onlarla birgə yaşayışa nail olmaq üçün özgünlüklə bərabər talebirgəlik əlamətlərini özündə ehtiva etməlidir”. İstər müasir, istərsə də mənəvi olan milli dəyərlər yarananda, formalaşma prosesində bəşəriliyi öz məzmununda əks etdirir. Adətən, milli dəyərlər bəşəri dəyərlərlə üst-üstə düşür, onların oxşar cəhətləri fərqli cəhətlərindən çox olur. Oxşar cəhətlərin çox, fərqli cəhətlərin az olması milli dəyərin qiymətini, əbədiliyini şərtləndirən önəmli amillərdən biridir.

Aydın məsələdir ki, maddi və mənəvi dəyər anlayışlarının mahiyyətinin açılması, onların qarşılıqlı əlaqəsinin şərh olunması həm nəzəri, həm də praktik cəhətdən olduqca faydalıdır; müəllim hazırlığında məsələnin kökünün bu müstəvidə aydınlaşdırılması gələcək pedaqoji fəaliyyətin səmərəli qurulmasına kömək edə bilər.

Professor Nurəddin Kazımov “Mərhələli tərbiyə nəzəriyyəsi” adlı əsərində tərbiyənin mahiyyəti ilə bağlı şərhlərdə milli dəyərlər məfhumuna da aydınlıq gətirir. O yazır: “Sual olunur: tərbiyə zamanı adamlara, o cümlədən gənc nəslə aşılanan nələrdir? Yığcam şəkildə desək: mənəvi dəyərlərdir”. Göründüyü kimi, görkəmli alim, haqlı olaraq, mənəvi dəyərləri tərbiyədə aşılanması nəzərdə tutulan keyfiyyətlərə aid edir. Bunun özü də müəllim hazırlığında mənəvi dəyərlər üzrə işin yerini düzgün müəyyənləşdirməyin çox vacib olduğunu göstərir. Daha sonra, aydın olur ki, müəllim hazırlığında təkcə milli dəyərlərin yerini müəyyənləşdirmək yetərli deyil. Həmin dəyərlərin gələcək şagirdlərə də aşılanması yolları müəllim olacaq tələbələrə öyrədilməlidir.

Mənəvi dəyərlər deyəndə nəyin nəzərdə tutulduğunu izah edən N.Kazımov mənəvi dəyərlərin özlərinin də iki qrupa ayrıldığını göstərir. Doğrudur, müəllif yazır ki, bu bölgü şərtidir. Müəllifin düzgün olaraq göstərdiyi kimi, mənəvi dəyərlərin bir qismini milli dəyərlər təşkil edir: “... mənəvi dəyərləri şərti olaraq iki qrupa ayırırıq: milli-mənəvi dəyərlər və ümumbəşəri mənəvi dəyərlər”. Müəllif böyüklərə, valideynlərə hörməti, uşaqlara qayğını, ailəcanlılığı, xalqın adət-ənənələrini yaşatmağı, qonaqpərvərliyi, halallığı və s. milli dəyərlərə aid edir.

Milli-mənəvi dəyərlərlə milli-maddi dəyərlərin qarşılıqlı əlaqəsində onların hansının əvvəl, hansının sonra yaranması ilə bağlı birmənalı fikir söyləmək də çətindir. Hörmət və məhəbbətə layiq tarixi şəxsiyyət-

lərin həyatları, keçdikləri yol, onlara ucaldılan abidələr, məzarlarının üstündə sonralar ziyarətgaha çevrilən türbələrin inşa edilməsi deyilənlərə sübutdur. Söylənilən fikirləri milli dəyərlərin milli-mənəvi və milli-maddi dəyərlər vəhdətində necə formalaşdığını misallar əsasında izah edək. Bildiyimiz kimi, tarixi şəxsiyyətlər, xalqının tarixində silinməz izlər qoymuş adamlar əslində konkret bir xalqın milli dəyərlərinə daxildir. Bu cəhətdən ümummilli liderimiz mərhum Heydər Əliyevin həyatını parlaq nümunə kimi göstərmək olar. Heydər Əliyev həm milli-mənəvi, həm də milli-maddi dəyərlərimizin daha da inkişaf etməsinə əvəzsiz töhfələr vermişdir. Milli birliyin, milli ideologiyanın formalaşdırılması, dövlətçiliyin möhkəmləndirilməsi, Azərbaycançılıq ideologiyasının yaradılması, bir sıra maddi mədəniyyət abidələrinin inşası və s. çoxlu sayda faktlar içərisindən seçilmiş nümunələrin yalnız bir qismidir. Milli liderin vəfatından sonra şərəfinə ucaldılan abidələr, onun məzarının ümumxalq ziyarətgahına çevrilməsi söylənilən fikirlərin doğruluğunu bir daha təsdiqləyir: milli-mənəvi dəyərlərlə maddi dəyərlər vəhdətdə formalaşır, biri digərinin inkişafına təkan verir, ona əsas olur.

Vətənimizin azadlığı, müstəqilliyi və onun torpaqlarının iyrənc düşmən tapdağından xilas edilməsi yolunda şəhidlik zirvəsinə ucalmış qəhrəman övladlarımızın nümunəsi də milli-maddi və mənəvi dəyərlərin vəhdətini açıq şəkildə göstərir: onların əməlləri mənəvi dəyərlərin parlaq nümunəsidirsə, şərəflərinə salınmış xiyabanlar, ucaldılmış abidələr maddi dəyərlərə gözəl misaldır.

Qeyd etmək lazımdır ki, Azərbaycan xalqının ən mühüm milli xüsusiyyətlərindən biri onun yaxşılığı heç vaxt yaddan çıxara bilməməsidir. Bu isə yeni ziyarətgahların yaranmasına səbəb olur. Yuxarıda ümummilli liderimiz Heydər Əliyevin nümunəsində bunu şərh etmişdik. Lakin qeyd etmək lazımdır ki, bu nümunə yeganə deyil. Şəhidlərimizin, böyük ziyalılarımızın, görkəmli elm adamlarımızın, yazıçılarımızın timsalında formalaşan, mənəvi dəyərlərimizə çevrilən nümunələrin necə yaranması ilə bağlı həm tarixi keçmişimizlə, həm də müasir həyatımızla bağlı istənilən qədər faktlar mövcuddur. Əsas məsələ onların gücündən, təsirindən müəllim hazırlığında istifadənin sistemini və təcrübəsini yaratmaqdır.

Belə faktların sayını Azərbaycanın inkişafında, mədəniyyətinin formalaşmasında, müstəqilliyinin əldə edilməsində, elminin dünyada tanınmasında müstəsna xidmətləri olmuş şəxsiyyətlərin timsalında daha da artırmaq olar. Hər bir fakt danılmaz şəkildə sübut edəcək ki, milli-mənəvi və milli-maddi dəyərlər ayrılmaz olduğu kimi, onların təsirini, gənclərin tərbiyəsində rolunu, o cümlədən müəllim kadrların hazırlanmasında mövqeyini də dialektikada götürmək vacibdir.

Bu dialektika praktikada özünü qabarıq göstərdiyindən, nəzəriyyədə, elmi araşdırmalarda da həmin xüsusiyyət yaddan çıxmamalıdır. Müəllim kadrlarının hazırlığında haqqında danışılan xüsusiyyət bir neçə istiqamətdə nəzərə alınmalıdır. Onlar hansılardır? Təcrübə və təhlil edilmiş çoxsaylı faktlar göstərir ki, həmin istiqamətləri aşağıdakı kimi qruplaşdırmaq elmi cəhətdən, müəllim kadrlarının hazırlanması baxımından faydalıdır.1. Milli dəyərlər, milli-mənəvi dəyərlər və milli-maddi dəyərlər anlayışlarının öyrədilməsi üzrə aparılan işlərdə; 2. Milli dəyərlərin (milli-mənəvi və milli – maddi dəyərlərin vəhdətində) xalqın a) əxlaqi dəyərlərinin ; b) dövlətçiliyinin; c) adət-ənənələrinin; ç) dilinin; d) həm maddi, həm mənəvi mədəniyyətinin və s. yaranıb formalaşmasında rolunun aydınlaşdırılması ilə əlaqədar fəaliyyətdə; 3. Gələcək müəllimlərin milli dəyərlərimizi dərindən bilmələrinin son dərəcə vacib olmasının aydınlaşdırılmasında; 4. Sabahın müəllimlərinə gələcək şagirdləri ilə aparacaqları

tərbiyə işlərində (həm təlim prosesində, həm də təlimdənkənar vaxtlarda) milli dəyərlərdən istifadənin öyrədilməsi üzrə işlərdə.

Azərbaycanın dünyaya açıq olması, ona qovuşması təhsil işindən, o cümlədən müəllim hazırlığından da yan keçə bilməz. Təhsil sahəsində həyata keçirilən islahatların mühüm tələblərindən biri məhz öyrənənin, tələbənin pedaqoji prosesin mərkəzinə gətirilməsi, onun obyektiv fikirlərinin maksimum nəzərə alınmasıdır. Müasir dövr mühüm bir vəzifə kimi qarşıya qoyur ki, pedaqoji prosesin təşkilatçıları tələbəni passiv dinləyici, öyüd və nəsihətləri sözsüz qəbul edən insan kimi təsəvvür etmək düşüncəsindən uzaqlaşsınlar. Yalnız bu cür olduqda tələbəni, sabahın müəllimini həyata daha yaxşı hazırlamaq mümkün olar. Bu isə tələbələrin sabah əmək fəaliyyətinə başlayandan sonra dərs deyəcəyi, tərbiyə edəcəkləri şagirdlərə də məhz belə yanaşacaqlarına zəmanət deməkdir.

Bütün bunlar bizə anlayışın formalaşdırılmasında zəruri olan bir sıra nəticələrə gəlməyə əsas verdi. Anlayış hər hansı məfhumun əlamətlərinin tapılması prosesindən ayrılmazdır. Əlamətlər isə əsas və əsas olmayan, mahiyyətin açılmasında bir o qədər də önəmli yer tutmayanlar olmaqla bir-birlərindən fərqlənirlər. Beləliklə, tarixən konkret bir ərazidə, dövlətdə yaşamış, buranı özünə Vətən bilmiş millətin keçdiyi həyat yolu, müxtəlif yaş dövrlərində olan insanların tərbiyə vasitəsinə çevrilən həm mənəvi-əxlaqi baxışlar sistemi, həm də maddi abidələr, milli dəyərlər hesab edilir.

*Rəyçi: prof. İ.Cəbrayılov*

**İstifadə edilmiş ədəbiyyat**

1. Kazımov N. Mərhələli tərbiyə nəzəriyyəsi. Bakı, 2007.

2. Şəmsizadə N. Azərbaycan ideologiyası. Bakı, 1996.

3. Qasımov L., Mahmudova R. Pedaqogika. Bakı, 2003.

**Ш.Исмаилов,**
**Г.Гурбанова**

**Сущность понятия национальных ценностей и значимость её в подготовке педагогических кадров**
**Резюме**

Национальные ценности - это обширное понятие. Это понятие до сих пор не изучено полностью. Национальные ценности объединяют в себе моральные и материальные ценности. Каждый из них влияет на подготовку педагогических кадров. Поэтому при подготовке педагогических кадров нужно учитывать сущность национальных ценностей.

**Sh.Ismayilov,**
**G.Qurbanova**

**The role of national values in teacher training**
**Summary**

In the article, the authors express an opinion that, national values are extensive concepts and these concepts haven’t been completely studied, yet. It is noted that, national values including moral and material values and each of them affects the training of pedagogical staff. The authors come to a conclusion that, it is necessary to consider national values in training of the pedagogical staff.

# MÜƏLLİM HAZIRLIĞINDA İLKİN MƏRHƏLƏ

**Pərişan Həsənova**
***pedaqogika üzrə fəlsəfə doktoru***

***Açar sözlər:*** *pedaqoji təcrübə, pedaqoji səriştəlilik, pedaqoji təfəkkür, mənəvi dəyərlər, ümumtəhsil məktəbi.*

***Ключевые слова:*** *педагогическая практика, педагогическая компетенция , педагогическое мышление, моральные ценности, общеобразовательные школы.*

***Key words:*** *pedagogical practice, pedagogical competence, pedagogical thinking, moral values, secondary school.*

Müəllim kadrlarının hazırlanmasının həlledici mərhələsinə ali pedaqoji məktəblərdə təhsilalan gələcək müəllimlərlə bakalavriat səviyyəsində aparılan pedaqoji təcrübənin təşkili də daxildir. Heç kəs inkar etmir ki, keyfiyyətli təhsilin taleyi, ilk növbədə, müəllimlə bağlıdır. Öz fənnini uşaqlara sevdirmək üçün müəllimin ustalığı vacib şərtlərdəndir. Bu keyfiyyətlərin təməli isə ali məktəbdə qoyulur.

Təhsil prosesində öyrəndiklərini təcrübədə reallaşdırıb pedaqoji prosesə uğurla tətbiq edə bilmək müəllimin hərtərəfli peşə hazırlığından xəbər verir. Bu hazırlığa müəllim pedaqoji təcrübə dövründə yiyələnir. Pedaqoji təcrübə innovativ təlim metodlarını tətbiq edən, təhsilin məzmununun səmərəli mənimsənilməsini təmin edən səriştəli təhsilverənin hazırlanmasında əvəzolunmaz vasitədir.

Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 29 oktyabr tarixli Sərəncamı ilə təsdiq edilmiş "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda qeyd olunduğu kimi, təhsilin başlıca vəzifələrindən biri milli-mənəvi və ümumbəşəri dəyərləri qoruyan və inkişaf etdirən, geniş dünyagörüşünə malik olan, təşəbbüsləri və yenilikləri qiymətləndirməyi bacaran, nəzəri və praktiki biliklərə yiyələnən, müasir təfəkkürlü və rəqabət qabiliyyətli kadrlar hazırlamaqdır.

Direktiv sənədlərdə aydın deyilir ki, təhsilalanlar biliyini daim artırmalı və dərinləşdirməli, praktik bacarıq və peşə-ixtisas hazırlığını təkmilləşdirməli və dərinləşdirməli, ümumi mədəni səviyyəni yüksəltməlidir. Hazırda qarşıya qoyulan mühüm vəzifə yüksəkixtisaslı, milli-bəşəri dəyərlərə sahib olan vətəndaş hazırlanmasına diqqətin artırılmasıdır.

Təhsil Qanununda deyildiyi kimi, təhsilin bütün səviyyəsində təlim və tərbiyə prosesinin səmərəliliyi pedaqoji kadrların elmi səviyyəsindən, pedaqoji ustalığından, pedaqoji işə praktik hazırlığından çox asılıdır. Deməli, təhsilalanların pedaqoji prosesə bələdliliyinin əsası pedaqoji təcrübədə qoyulur. Pedaqoji təcrübə ali məktəbin tədris planında özünəməxsus yeri olan bir mərhələdir.

Respublikamızda pedaqoji kadrların hazırlığı sahəsində aparılan son tədqiqatlar göstərir ki, ali məktəblərdə pedaqoji təcrübənin öyrənilməsindən çox psixoloji, pedaqoji və metodoloji nəzəriyyələrin öyrənilməsinə üstünlük verilir. Ali pedaqoji təhsil müəssisələrində təhsil alan tələbələrin ümumtəhsil

məktəblərində təcrübə keçməsinə və ya praktik müəllimlərin sinifdə tədqiqat xarakterli işlər görməsinə lazımi səviyyədə əhəmiyyət verilmir. Halbuki pedaqogikanı, psixologiyanı mükəmməl bilən tələbə pedaqoji prosesin birbaşa iştirakçısı olmasa, o, bu prosesin səmərəli təşkil edilməsi haqqında lazımi təsəvvür və biliyə malik ola bilməz, düşdüyü şəraitdə məqsədəmüvafiq qərar qəbul etməyi bacara bilməz, mövcud uyğunsuzluqları görə və bu uyğunsuzluqların aradan qaldırılmasına səy etsə də, nail ola bilməz. Pedaqoji praktika dövründə tələbələr hər bir dərsin təlim, tərbiyə və inkişafedici məqsədlərini başa düşməli, yeni kurikulumların tətbiqindən xəbərdar olmalıdır. Tələbə onu bilməlidir ki, müasir təlimin təşkili formasından yaradıcılıqla istifadə olunmalıdır, yeni kurikulumlar ənənəvi kurikulumlardan fərqli olaraq nəticəyönümlüdür. Elə ilk dərslərdən hiss etməlidir ki, yeni kurikulumların tətbiqi təlimdə yeni strategiyalardan, yeni yanaşmalardan, şagird fəaliyyəti və nailiyyətlərinin yeni qiymətləndirmə qaydalarından ustalıqla istifadə etmək bugünkü müəllim üçün çox zəruridir. Müəllim dərs prosesində təlim materialını mənimsəməyə nail olmalıdır.

Deməli, pedaqoji praktika müddətində tələbələr pedaqoji və elmi ədəbiyyatdan bəhrələnməyin yollarını da öyrənməlidirlər. Belə olduqda, onlar dərk edirlər ki, bakalavriat dövründə dərin bilik almaq hər bir gənc müəllimin baş ucalığıdır.

Onlar proqram materiallarının perspektiv və cari planlaşdırılmasına dair ilk vərdişləri də elə bu müddətdə qazanmalıdırlar.

Pedaqoji təcrübə mərhələsində müəllim hüquqi status və peşə hazırlığı qazanır. Onlarda öz peşəsinə məsuliyyət hissi yaradır.

Müasir təhsil proqramının tələbləri baxımından təhsilin məzmununda edilən dəyişikliklər də pedaqoji təcrübədə tələbələrə geniş şərh edilməlidir. Müasir təlim pedaqoji təcrübəyə hazırlığın və həyata keçməsinin standart sisteminə yeni tələblər səviyyəsində baxılmasını tələb edir. Artıq müəyyən edilmişdir ki, təcrübəçi tələbənin pedaqoji biliyə daha dərindən malik olması və peşə səriştəliliyinə yiyələnməsi üçün müəllim aşağıdakı xüsusiyyətləri diqqətdən qaçırmamalıdır:

- pedaqoji prosesin səmərəli təşkil olunması haqqında biliyə malik olmalı və bu sahədə məqsədəmüvafiq qərarlar qəbul etməyi bacarmalı;
- mövcud olan uyğunsuzluqları görməli və onların aradan qaldırılmasına nail olmağı öyrənməli;
- tədris prosesində biliyin nəticələrini dəyərləndirməli və müvafiq qərarları qəbul edə bilməli;
- təhsil sahəsində baş verən dəyişikliklərin tətbiqini bacarmalı və yeniliklər haqqında ətraflı məlumata malik olmalı (tətbiqi həyata keçirmək üçün lazımi bacarıq və vərdişlərə yiyələnməli);
- pedaqoji prosesdə müəllim-şagird, müəllim-ailə münasibətlərini hüquqi, mənəvi və pedaqoji dəyərlər baxımından tənzimləməyi bacarmalıdır.

Yuxarıda göstərilən tələbləri nəzərə alsaq, belə qənaətə gəlmək olar ki, indi pedaqoji təcrübəyə tədris prosesində əldə olunmuş nəzəri biliklərin təcrübədə tətbiqi kimi baxmaq kifayət deyildir. Müasir tələblərə əsaslanan pedaqoji prosesi idarə edəcək təcrübəçi tələbə həm də tədqiqatçılıq qabiliyyətinə malik olmalıdır. Tələbədə pedaqoji fəaliyyətə yaradıcı və tədqiqatçılıq münasibəti onlarda öz fəaliyyətlərinin nəticəsini təhlil etmək vərdişi aşılayır, özünütəhsil tələbatını formalaşdırmağa zəmin yaradır. Həmçinin pedaqoji təcrübə zamanı qabaqcıl müəllimlərlə görüşmək, söhbət aparmaq, pedaqoji prosesin bu və ya digər problemlərinin müzakirəsində iştirak etmək, pedaqoji şura, metodbirləşmə iclaslarında iştirak etmək peşə məsuliyyətinin inkişafına da kömək etmiş olar.

Uzun illər müəllim kadrları hazırlayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin pedaqoji təcrübənin təşkili ilə bağlı elmi əsaslara söykənən zəngin ənənələri vardır. Son illərdə universitetin müxtəlif kafedraları pedaqoji təcrübənin təşkili və keçirilməsi ilə bağlı pedaqoji və psixolojiyönümlü metodik vəsait proqramları hazırlamışdır. Universitet təcrübə yeri kimi öz işini müasir təlim texnologiyaları əsasında quran tam orta məktəbləri və liseyləri seçir. Burada təcrübəçi tələbə keçəcəyi sınaq dərsi üçün istifadə edəcəyi didaktik material və əyani vəsaiti, texniki vəsait, mətn, slayd, müstəqil iş üçün tapşırıqları yoldaşları ilə birlikdə seçir, metodist və təcrübə rəhbərindən bəzi tövsiyələr alır. Dərsə hazırlaşarkən tələbənin təlim metodlarını özü seçməsi, didaktik materialları özü hazırlaması onun işə marağını artırır.

Əgər ümumnəzəri və intellektual hazırlıq tələbələrin bir ziyalı kimi formalaşmasına zəmin yaradırsa, ixtisas və peşə hazırlığı onların bir müəllim kimi hazırlanmasına səbəb olur. Gələcək müəllimlər məhz pedaqoji təcrübə dövründə ilk dəfə olaraq siniflə, şagirdlə qarşılıqlı ünsiyyətə başlayır və müəllim fəaliyyətinin bilavasitə iştirakçısına çevrilir.

Göründüyü kimi, pedaqoji təcrübənin səmərəliliyi başlıca olaraq onun nəzəri cəhətdən düzgün əsaslandırılması, öyrədici və tərbiyəedici xarakteri, onun həllinə kompleks yanaşmaq, sistemlilik və ardıcıllığa riayət edilməsindən çox asılıdır.

*Rəyçi: pedaqogika üzrə fəlsəfə doktoru E.Məmmədova*

**İstifadə edilmiş ədəbiyyat**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası.// Azərbaycan məktəbi, 2013, № 5.

2. Ağayev Ə., Həsənov A. Pedaqogika (dərslik). Bakı, 2007.

3. Pedaqoji təcrübənin təşkili və keçirilməsinə dair metodiki göstəriş. Bakı,1990.

4. Quliyev E., Dadaşlı Y. Pedaqoji təcrübə dövründə tələbənin psixologiya üzrə görəcəyi işlərin məzmunu (Metodik vəsait). Bakı, 2011.

5. Baxşalıyev A., Eldarov N. Pedaqoji təcrübə (Metodik vəsait). Bakı, 2012.

6. Bakalavriat səviyyəsi üzrə tələbələrin pedaqoji təcrübəsinin proqramı. ADPU-nun nəşri. Bakı, 2012.

7. Əhmədov H., Məmmədova E. Müəllim hazırlığında ilkin mərhələ.// Azərbaycan məktəbi, 2013, №3.

**П.Гасанова**

**Перевичный этап в подготовке учителя**

**Резюме**

Современное образование опирается на жизненные умения учащихся. Поэтому студент, который в будущем будет учителем, не должен довольствоваться теоретическими знаниями и быть пассивным наблюдателем педагогического процесса. В статье предлагаются новые подходы к педагогической практике, которая играет важнейшую роль в подготовке учительских кадров, обладающих новым педагогическим мышлением и профессиональной компетентностью.

**P.Hasanova**

**Important stage in teacher training**

**Summary**

In this article, the author mainly discusses about developing students’ skills. New approaches on teacher preparation, enhancing pedagogical thinking, and competences are also clarified in this article.

# О ФАКТОРАХ, ВЛИЯЮЩИХ НА ВЫБОР УПОТРЕБЛЕНИЕ СЛОВ

**Нармина Фаталиева**
***педагог кафедры английского языка и литературы, диссертант Университета Хазар***

***Açar sözlər :*** *sinonimlər, sinonimlərin seçimi, linqvistik faktorlar, qeyri-linqvistik faktorlar, sosial sinif, gender, yaş faktoru, evfemizm.*

***Ключевые слова:*** *синонимы, выбор синонимов, лингвистические факторы, экстра лингвистические факторы, социальный класс, пол, возрастной фактор, эвфемизм.*

***Key words:*** *synonyms, choice of synonyms, linguistic factors, extra linguistic factors, social class, gender, factor of age, euphemism.*

В процессе речи люди разговаривая друг с другом на едином языке прекрасно понимают друг друга. Однако никто из нас не использует одинаковые слова для передачи одной и той же информации. Всякий говорящий, всякий носитель языка ведет себя по отношению к общеязыковому фонду избирательно. При передачи информации говорящий стремится выбрать слово, которое наилучшим образом выразил бы его языковую интенцию. Л. Дангли отмечает, что "у любого языка есть одно из важнейших свойств, которое заключается в вариативности (вариантности) его лексико-семантических средств, в существовании лексических единиц, называющих один и тот же денотат, но отличающихся самыми разнообразными и порой чрезвычайно тонкими оценочными и стилистическими оттенками. Это универсальное свойство языков лежит и в основе межъязыковой синонимии" [4, стр.2].

Решить проблему выбора, само по себе, является нелегкой задачей. В нашем распоряжении может быть большое количество близких по значению слов для выбора, однако количество возможных контекстов значительно меньше. Даже если мы будем утверждать, что, например, слова "foliage" и "leaves" являются синонимами, то это вовсе не означает, что мы с легкостью можем применить слово "leaves" во всех предложениях вместо "foliage"[15, стр. 5]. Это говорит о существовании разной контекстной употребительности синонимов. Однако, контекст не единственный критерий, который влияет на употребление слов. Выбор разных людей различных синонимов для передачи одной и той же мысли продиктован многими другими социальными и психологическими факторами.

Итак, способность языка "вооружить" своих пользователей всевозможными альтернативными средствами выразить одну и ту же мысль через различные единицы является одним из его важнейших свойств. Этот факт относится к стилистической вариации в общем, и в частности, к синонимии постольку поскольку разговор идет о выборе между лексемами [19, стр. 78].

Наша задача в данной статье будет вовсе не попытка доказать существование в языке подлинных синонимов или же отрицать это. Отнюдь, если бы мы согласились, что абсолютные синонимы существуют в языке и употребляются совершенно одинаково, то браться за изучение “выбора” синонимов, а также рассмотрение различных факторов, влияющий на этот выбор, было бы просто бессмысленным.

Каждый раз, осуществляя свой коммуникативный замысел, носитель языка решает проблему “выбора”языковых средств. Суть проблемы выбора состоит в осуществлении определенного коммуникативного намерения и замысла с помощью соответствующей когнитивно-функциональной модели [9, стр.2]. Е.С. Яковлева полагает, что наш выбор слов зависит от того, “с какой системой (моделью времени, пространства и восприятия) говорящий соотносит предмет описания” [8, стр. 4]. Далее она отводит внимание типам знания говорящего, считая, что говорящий “ помимо унаследованного опыта (в виде которого он “приобрел свою картину мира”) обладает и опытом личным, конкретным, индивидуальным, связанным с познанием окружающего мира, неуклонным расширением границ освоенного “пространства вещей” [8, стр. 5].Отметим, что слово “выбор” – это обозначение предельно широкой деятельностной категории. При изучении функционирования языка его исследователи и представители смежных научных дисциплин постоянно имеют дело с языковым (речевым, текстовым) выбором. [7, стр. 245].

Каковы же факторы, влияющие на наш выбор слов и какими же именно особенностями обусловлены данные факторы? Почему одни носители языка, для обозначения слова “девушка” используют слово “girl”, а другие отдают предпочтение слову “maiden” ?

Лингвистической науке известно очень много теоретических исследований, проведенных с целью выявить предпочтения личности в выборе слов. Так в результате выбора конкретных единиц мы приходим к определенному речевому высказыванию. Начнем с того, что близость значения вербальных единиц в сознании индивида детерминируется определенными параметрами порядка, которые отражают возраст, индивидуальное восприятие мира индивидом, его опыт, знания, психо-эмоцианальное состояние. Далее, так как язык является социальным феноменом вполне ясно, что общество само также имеет влияние на язык. Языки содержат много уровней внутренней вариации, каждая из которых связанна с такими факторами как возраст, месторасположение, социально-экономический статус, групповая идентификация и другие. Как утверждает Труджил, “язык играет важную роль в передаче информации о говорящем, то есть о его происхождении и социальном статусе” [16, стр. 76]. Экстралингвистические факторы могут стать потенциальными факторами для установления синонимичных отношений между словами различных этимологий [3, стр. 8]. Обладание таким знанием о различиях между синонимами является основным инструментом для правильного и быстрого выбора между ними.

Так, пол говорящих будет играть определяющую роль в том, каким набором слов будет руководствоваться отправитель для передачи своей идеи. Набор слов для передачи одной и той же мысли осуществляется представителями женского и мужского пола осуществляется в связи с их своеобразными предпочтениями. По мнению Рональда Увардхафа одним из важных топиков в социолингвистике является изучение связи, если такая

существует, между структурами, лексиконами, и методами использования конкретных языков и социальные роли мужчин и женщин, использующие данные языки [14, стр. 315].

Конечно использование языка не заучивается нами механически в зависимости от половой принадлежности. Тут вмешивается широкий набор "половых" значений, которые мужчины и женщины осваивают в процессе жизни и применяют в комплексной форме.

В ходе некоторых исследований было обнаружено, что женщины более склонны к строгому соблюдению языковых норм, чем мужчины. Лакофф считает, что женщины часто любят повторять такие слова как "adorable", "charming", "divine", "lovely", and "sweet", нежели мужчины [14, стр. 318].Также они более склонны выражать свои эмоциональные переживания через слова такие как "fantastic", "so good", "such fun", "adorable", "lovely", "divine", etc.

Считается, также что женщины более склонны к выбору более "престижных", лишенных грубости. Занимаясь изучением женской речи О. Джесперсен отмечает, что женщины тщательно подбирая лексические единицы, делают акцент на выборе тех синонимов, которые более отвечают по своему содержанию требованиям вежливости. Он выявляет основные особенности женского речевого поведения и утверждает, что явление эвфемии связано в основном с лингвистическими предпочтениями женщин. Об этом он пишет своей работе, "такие эвфемистические замены для слова "hell" как "the other place", "a very hot or a very uncomfortable place" придуманы с основном женщинами" [14, стр. 48].

Напомним, что эвфемизмами называются слова, употребляющиеся говорящим для замены неприличных слов более мягкими и вежливыми. Считается, что это тенденция женщин выбирать из синонимического ряда более мягкое слово, во-первых, связано с их естественной потребностью передавать своим детям высшую речевую культуру; девочек всегда приучают к скромности, вежливости, мягкости в речи. Во-вторых, лингвисты считают, что женщины менее уверены в себе и в своем социальном положении и стремятся "обозначать свой статус языковыми средствами" [14, стр. 48]. Например, Лакофф говорит, что отвечая на вопрос утверждением, иногда женщины вместо того, чтобы пользоваться нисходящим тоном, что требуется фонетикой английского языка, используют восходящий тон, что является манифестацией их недостаточной уверенности в себе.

Однако, мы не согласны с тем, что женщины всегда употребляют эвфемизмы с целью повышения общественного мнения о них. Очень часто эвфемизмы настолько приедаются в языке , что мы механически используем их в коммуникации с другими людьми с целью казаться более вежливым или не обидеть адресата. Также такого рода эвфемизмы не всегда с уверенностью вносятся в новые эвфемистические словари. Следовательно, мы можем предположить, что женщины выбирают эвфемизмы среди других синонимов, скорее всего, потому что они более мягче выражают их мысли, нежели резкие и прямые выражения, которые нехарактерны для их общения. Наше предположение также поддерживает эвфемистические замены данные единицы употребляются скорее по привычке, чем в силу ярко выраженной интенции замены [11, стр. 3].

Одним из определяющих критериев языковых предпочтений говорящих является фактор возраста. Считается, что у

различных возрастных категорий склонности выбора лингвистических элементов различны. Как утверждает Холмс, " вокабуляр и словесный выбор всегда находятся под влиянием возраста говорящего, так как особенности речи также изменяются с возрастом"[13, стр. 11]. С возрастом в силу изменения "рангов когнитивных категорий", у говорящего в лексиконе развивается значение используемых слов. Также сущность развития значений слов заключается "в расширении объема и изменении качества конкретизаторов, изменений образов сознания в них, отражающих личный опыт носителей языка, и дефиниционных стратегий"[10, стр. 7].

Однако, несмотря на ряд исследований проведенных с целью выявления возрастных предпочтений говорящих, в действительности, они не могут отразить со всей точностью, как выбор людей меняется с их возрастом [12, стр. 556] .Однако в ходе таких экспериментов было выяснено, что с увеличивающимся возрастом люди начинают употреблять все меньше: негативные эмоциональные слова, глаголы в прошедшем времени, первое лицо единственного числа и т.п. и наоборот, они становятся позитивно настроены , предпочитают более позитивные эмоциональные слова и имеют тенденцию говорить в будущем времени. Более молодому человеку требуется больше социального опыта для обозначения более обширной, сложно оформленной области значения , особенно в случае если он имеет дело с абстрактными словами. "Чем абстрактнее семантика слова, тем больше социального опыта и рефлексии требуется индивиду" [10, стр. 7]. В ходе анализа текстов сочинений, написанных 10-11 и классниками было выявлено , что пишущие более склонны к эмоционально оценочным описанием событий, при этом игнорируется предметное содержание текста. Это свидетельствует о том, что "рефлексивный компонент языкового сознания" у молодых говорящих развит в слабой форме, так как тексты насыщены повышенной эмоциональностью и лишены необходимой логической организации. Употребление табуированных слов и сленгов также, например, более свойственно подростковому или.

Следовательно, с накоплением языкового опыта и соответственно с возрастом, говорящий начинает классифицировать слова и "образуют в вербальной сфере классы, сформированные по разным основаниям: логическому, эмоциональному, мнемическому, практическому опыту, языковым установлениям. Круг явлений, связанных по мнемическому основанию, может быть неограниченно широк. В него входят словесные связи, соответствующие пережитым ситуациям, заученные на память тексты, разного рода словесные клише" [6, стр. 5].

Наше географическое положение также является фактором, который влияет на наш выбор заменных слов. Носители одного и того же языка используют совершенно разные лексические единицы для обозначения одного и того же понятия. Тут мы имеем дело с диалектами, словами типичными для определенного географического региона. Диалект относится к разновидности языка, который отличается от самого языка своеобразным произношением, грамматикой, лексикой. Ясно, что часть населения, которая потеряла непосредственный контакт с другой частью территории и людьми, проживающими, например, через реку или гору, будет использовать в своей речи слова, незнакомые для всего населения. В реальности, все мы говорим на диалектной речи в той или иной степени. Диалекты

проявляют себя на разных уровнях языка. Например, английский язык подразделяется на обширные диалекты, такие как британский английский, американский английский и австралийский английский. Приведем следующий пример из разновидностей английского языка “take a decision” и “make a decision”, соответственно синонимы из американского английского и британского английского. Американский английский диалект, в свою очередь, делится на северный и южный американский диалекты. Говорить, что одни диалекты лучше других будет неправильно, так как каждый из них обладает своеобразной лингвистической системой, правила которой отвечают всем коммуникативным требованиям своих пользователей. Если говорящий во время беседы будет использовать синонимы диалекта, который является для его собеседника неприемлемыми в данной обстановке, то его можно воспринять, во-первых, как личность, относящийся к другому социальному статусу, или как иностранца. В первом случае мы имеем дело с социальным диалектом, указывающий на социальный статус говорящего, а во втором с региональным диалектом, который является показателем места его происхождения.

Выбор языковых средств также может быть главным показателем его социального класса. Считается что, чем выше социальный класс говорящего, чем больше он образован, тем шире его возможности делать выбор языковых средств. Рассматривая зависимость выбора слов и выражений от социального класса HH пишет, “ хотя эта зависимость опосредована культурой, имеет свои особенности в различное историческое время, тем не менее, принадлежность к конкретному социальному классу влияет на мышление и поведение людей, в том числе речевое” [2, стр. 42]. Под социальным классом также подразумевается профессия, образование и доход говорящих, от которых значительно зависит выбор слов и выражений. В зависимости от этого язык также условно делится на престижным и менее престижный. Конфликт, возникший в 1204 году между англичанами и французами привел к тому, что статус французского языка, на котором говорила большая часть англичан после орманнского захвата, сильно упал. В результате, высший класс вновь стал использовать английские слова, а низкие классы все еще продолжали говорить на французском.

Однако, в современном английском языке англичане под “социальном классом” подразумевают социальное положение, занимаемое в обществе и экономическую обеспеченность людей. Мнения лингвистов об определении социального класса также расходятся. С одной стороны, понятие класс предполагает материальное неравенство в социальном и экономическом положениях. А с другой стороны, она дает этому понятию иную характеристику, связывая его с “с настоящими и возможными социальными и политическими факторами”. Примером зависимости употребления языковых средств от социального класса могут служить изменения в общественно-политической жизни и их отражение в языке [2, стр. 42].

Фокс отмечает, “социальный класс может быть мгновенно разгадан, так только говорящий начинает говорить” [17, стр. 15-16]. В действительности, каждый англичанин осознает эти классовые разделения, но в то же время очень деликатно относятся к этому подразделению. Фокс далее определяет “класс” тем, что люди кушают, пьют, как они одеваются, где одеваются, как разговаривают и т.д. Фокс концентрирует внимание на таких

факторах, как образ жизни и поведение. Например, Кромптон относит это понятие к материальному неравенству в социальном и экономическом уровнях, образу жизни, престижу, статусу и культуре [18, стр. 16].

Выше перечисленные факторы показывают как различительные признаки каждого из заменных слов и их различная контекстную употребительность регулирует наш выбор синонимов. Синонимический ряд позволяет найти словесное выражение для каждого понятия во всем разнообразии его возможных оттенков [1, стр. 14]. Поэтому так важно понимать различия внутри каждого синонимического ряда, так как синонимический ряд постоянно на протяжении всего с-уществования подвергается эволюции.

Итак, синонимы настолько связаны с нашей повседневной жизнью, что в них отражается все социальные и индивидуальные изменения нашего общества. Этим самым синонимы помогают нам создать яркий образ нашей современной жизни. Любая трансформация в социальных устройствах приводит к соответствующим изменениям в языке и оказывает воздействие на то, как мы используем его средства.

Из нашего исследования стало известно, что выбор заменных слов обоснован рядом определенных прагматических потребностей. Мы можем разделить факторы выбора лингвистических единиц на 2 категории. Факторы, которые связаны с самим пользователем (сюда входит возраст, пол, идиосинкратические предпочтения говорящего, его географическое положение и социальный статус), а также факторы, связанные с ситуацией коммуникации (разговорный и письменная речь, участие в дискурсе, отношение и уровень формальности, область дискурса, например, техническая и политическая).

Однако важно отметить, что перечисленные социальные факторы не достаточно четко проясняют причину выбора адекватных средств в конкретной ситуации. “Любое событие, в том числе и речевой акт, всегда происходит в каком-либо времени и пространстве” [5, стр.3]. Мы не можем исключить ситуативный сознательный выбор лексических единиц, обусловленных когнитивными причинами. Пожалуй, именно такой комплексный подход может помочь лучше разобраться в проблеме выбора синонимических слов в английском языке.

*Рецензент: доц. А.Исмаилова*

**Список литературы**

1. Корсакова Ю. С. Синонимия – Универсальное языковое явление. Филологическме науки. Вопросы теории и практики. Тамбов: Грамота, 2010.

2. Потапова Н. М. Влияние социальных факторов на употребление эвфемизма. Язык, сознание, коммуникация. М.: МАКС Пресс, 2009.

3. Danglli, Leonard. Origin of Synonyms and their Acquisition as Vocabulary, LCPJ Publishing, Volume 3/2, 2010.

4. Королева Н. В., Артамонова Е.В. Проблема синонимии как одна из важных проблем лексикологии. Вестник КАСУ №2, 2009.

5. Арсланова Е.Р.Когнитология как новая парадигма 21 века. Челябинск: Челяб. Гос. Ун-т,2006.

6. Ушакова Т.Н. Структуры языка и организация речевого процесса. Сб. “Язык, сознание, культура”, 2005.

7. Виноградов С.Н. К вопросу о предмете языкознания (“Лингвистика Структуры” и “Лингвистика выбора”). Филология. Искусствоведение. Вестник

Нижегородского Госуниверситета им. Н.И.Лобачевского, №3, 2009.

8. Лебедева С.В. Средства описания близости значения слов. Изд-во Курского Государственного Университета.

9. Киселёва С.В. К вопросу о Синонимии. НИУ ВШЭ филиал Санкт-Петербурга. Россия.

10. Языковое бытие человека и этноса: психолингвистический и когнитивный аспекты. Материалы IV Международных Березинских чтений. Вып. 14. – М.: ИНИОН РАН, МГЛУ, 2008.

11. Кудряшова А.П. К вопросу о связи Синонимии и Эвфемии. Саратовский Государственный Социально-экономический Университет.

12. JamesW. Pennebaker,Matthias R. Mehl and Kate G. NiederhofferстрPsychological Aspects of natural language use: Our Words our Selves. Annu. Rev. Psychol. University of Texas at Austin, 2003.

13. Marttinen, Meri. U or non-U?: A Study on Social Factors and word choices in Contemporary British English., Bachelor's thesis, University Jyvaskyla, 2010.

14. Wardhaugh, Ronald. An Introduction to Sociolinguistics. Blackwell Publishing, 2006.

15. Levin Beth. Re-thinking synonymy: semantic sameness and similarity in languages and their description. Stanford University. Helsinki, 2010.

16. Zainab A. A. The Difficulties of Using Synonymous Verbs by EFL Learners, University of Baghdad, 2005.

17. Fox, K. Watching the English: The hidden rules of the English Behavior. London: Hodder and Stoughton, 2004.

18. Crompton, R. Class and Stratifications. Cambridge: Polity Press, 2008.

**N.Fətəliyeva**

**Sinonimlərin seçiminə təsir edən faktorlar haqqında**

**Xülasə**

Sinonimlər probleminə həsr olunmuş çoxsaylı əsərlərin mövcudluğuna baxmayaraq bir sıra qeyri-müəyyən suallar ilə dolu olan ənənəvi baxış daha dəqiq aydınlaşdırma tələb edir. Əsas məqsədlərimizdən biri sinonim seçiminin müxtəlif insanların dünyagörüşünü necə əks etdiyini öyrənməkdir. Məqalədə belə bir fərziyyə irəli sürülür ki, seçimin səbəblərini daha dərin anlamaq üçün sosial və situativ meyarlarlф birlikdə, düşüncə, yaddaş, diqqət və digər daxili proseslər də nəzərdən keçirilməlidir.

**N.Fətəliyeva**

**About factors influencing the choice of synonyms**

**Summary**

The article is devoted to the problem of synonyms which is still important. In modern linguistics there is an increasing need to observe the relationship between linguistic and extra linguistic factors in order to get a deeper understanding of language factors. Today cognitive approach is nearly placed in the centre of every linguistic problem. One of the main objectives is to figure out selection of synonym units which reflects peoples' perception through the world. It is also noted that for a better understanding the determination of synonym together with social and contextual criteria, some internal process such as thinking, memory, attention, inner speech are very important.

***Metodika, qabaqcıl təcrübə***

# XARİCİ DİLİN TƏDRİSİ METODİKASININ BƏZİ İSTİQAMƏTLƏRİ

**Aygün İsmayılova**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti***

***Açar sözlər:*** *Almaniya, inteqrasiya, bilik, dil, tədris, metodika, Milli Kurikulum.*
***Ключевые слова:*** *Германия, интеграция, знание, язык, обучение, методика, Национальный Курикулум.*
***Key words:*** *Germany, integration, knowledge, language, teaching, methodology, National Curriculum.*

Hazırda cəmiyyətimizin bütün sahələrində baş verən dinamik proseslər insan fəaliyyəti və onun yaradıcılığının inkişafı problemini ön plana çıxarır.

“Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası”nda (Milli Kurikulumda) uşaqların və gənclərin fəaliyyətinin formalaşdırılması və təmin olunması, onların bir subyekt kimi inkişafı üçün lazımi şəraitin yaradılması vacib faktor kimi gözdən keçirilir.

“Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulum)”nda təhsilin forma və metodları demokratik və humanist prinsiplərə əsaslanır.

Azərbaycan xalqının ümummilli lideri Heydər Əliyev çıxışlarının birində demişdir: “Bu gün bizim təhsilimizin məqsədi uşaqlara və gənc nəslə bilik vermək, onları gələcəyə hazırlamaqdır. Lakin bununla bərabər ən başlıca məqsəd Azərbaycan cəmiyyətinin layiqli üzvünü, Azərbaycan vətəndaşını formalaşdırmaqdır”.

Bu baxımdan, köləlik zəncirini qırıb ataraq müstəqillik qazanmış respublikamızda həyatın bütün sahələrini əhatə edən və elmi-metodik cəhətdən əsaslandırılmış Konsepsiyaya (Milli Kurikuluma) ehtiyac olduğu kimi, xarici dillər sahəsində də xalqımızın gələcək inkişafına yönələn geniş fəaliyyət proqramını işləyib hazırlamağa böyük zərurət yaranmışdır. Biz bilirik ki, müasir dövrdə dünya səviyyəsinə layiq, hərtərəfli inkişaf etmiş kadrları xarici dili bilmədən təsəvvür etmək mümkün deyildir.

Xarici dil konsepsiyası məzmunca respublikamızda xarici dillərin tədrisi, tədqiqi və tətbiqi siyasətindən, bu siyasətin həyata keçməsi üçün fəaliyyət proqramından və nəhayət, bu proqramın maliyyələşdirilməsindən ibarətdir. Əlbəttə, xarici dil konsepsiyası qarşıya qoyduğumuz məqsəddən çox asılıdır. Xalqların müasir dünya sivilizasiyasına qoşulması üçün bütün dünyada bir dilin ünsiyyət vasitəsinə çevrilməsi ehtimalını gündən-günə artırır. Bu isə o qədər də düzgün fikir deyil, çünki Avropa birliyinə daxil olan dövlətlərin heç biri bu və ya digər xalqın dilinə üstünlük verilməsi tərəfdarı deyil. Buna sübut olaraq 1954-cü ildə imzalanmış Avropa mədəniyyət konsepsiyasını, habelə 1975-ci il Helsinki Konfransının yekun aktını göstərmək olar. Həmin sənədlər ona imza atan bütün dövlətlərin dilində tərtib olunmuşdur. Bu, o deməkdir ki, ən yüksək səviyyədə dillərdən heç birinin hegemonluğuna və dominantlığına yer verilmir. Buna rəğ-

mən biz tam şəkildə dərk etməliyik ki, respublikamızda xarici dil konsepsiyası istər ölkə daxilində, istərsə də onun hüdudlarından kənarda xalqımızın dünyanın elmi-texniki, ədəbi-mədəni, sosial-iqtisadi və s. irsinə yiyələnmək, bu yolla da müasir sivilizasiyanın öncül cərgələrinə çıxmaq məqsədini qarşıya qoymalıdır. Belə ki, xarici dil anlayışı real kontekstə uyğun dəqiqləşdirilməlidir. Yalnız bundan sonra dil öyrənmədə kəmiyyət və keyfiyyət (dərslərin intensivliyi və məzmunu) məsələlərindən danışmaq olar.

Bu baxımdan xarici dil milli və bəşəri dəyərlərlə paylaşmaq, vətəndaş cəmiyyətinin formalaşmasında və inkişafında rol oynayacaq müstəqil bir şəxsi tərbiyə etməyə xidmət edir.

İndiki dövrdə dil öyrənmənin metodikası çoxsaylı və müxtəlifdir. Dil öyrənmədə qarşıya qoyulan məqsəd əsas rol oynayır. Eyni zamanda dillərin öyrənilməsində proporsiya gözlənilməlidir.

Dil siyasətində fikrimizcə almanların təcrübəsindən faydalanmaq olar.

Almaniyada xarici dil konsepsiyası dillərin aşağıdakı bölgüsünü əsas götürür:

1. Davranış dili;
2. Fundamental dil;
3. Ünsiyyət dili;
4. Araşdırma-açma dili.

1. Davranış dili ibtidai məktəbdən və ya məktəbəqədər yaşlarından adamların birgə davranışında və həyatında yarı kortəbii, yarı idarə olunan formada ikidilli ünsiyyətə olan tələbatı ödəmək üçün istifadə olunan ortaq işlək dildir. Milli azlıqlardan olanlar öz dilləri ilə bərabər Azərbaycan türkcəsini də öyrənirlər, çünki sonralar onlar ölkəmizin ictimai-iqtisadi və mədəni həyatında birgə çalışdıqları vaxt bu dilə ehtiyac duyurlar. Almaniyada çalışan iki milyona yaxın türkün alman həyat tərzinə qoşulması üçün ilk dövrlər onları küçədə, məktəbdə, yolda, mağazada və işdə anlamaq üçün, insanlarla ünsiyyət yarada bilmələri üçün lazımi qədər dilə yiyələnmələri vacibdir. Davranış dili bilinqval tədris sistemi olmaqla xarici dildən daha çox ikinci dil kimi xarakterizə oluna bilər.

2. Xarici dil 2-ci sinifdən əsaslı şəkildə öyrənildiyindən ona fundamental dil kimi yanaşmaq olar. Adətən bu dil yüksək elmi-mədəni səviyyəyə çatmış xalqın dili olur ki, bu da ölkəmizdə tədris olunan alman, ingilis, fransız və s. dillərdir.

3. Aydındır ki, indiki şəraitdə bir xarici dili bilmək azdır, ona görə də ikinci bir dili öyrənmək zərurəti yaranır. Bu zaman ünsiyyət dilinə böyük ehtiyac və həvəs yaranır. Bu da onu göstərir ki, beynəlxalq aləmdə fəaliyyət göstərən hər bir insan istənilən şəraitdə ünsiyyətə girə bilər.

4. Nəhayət, dünya xalqlarının mədəniyyətinə və irsinə yiyələnmək, yaxın və uzaq qonşuların tarixi inkişaf prosesi ilə yaxından tanış olmaq üçün istifadə olunan dili də öyrənmək lazımdır. Bu, keçmişin dərin qatlarında və çağdaş dövrümüzün dünya üzərində səpələnib qalmış dəyərlərini araşdırmaq, öyrənmək və açmaq üçün istifadə olunan bir dildir. Ona görə də buna açma və ya araşdırma dili deyirlər. Zaman baxımından bu qədim türk, yunan, çin və latın dilləri, məkan baxımından isə yapon, hind, malaziya və digər dünya dilləri ola bilər. Açma və ya araşdırma dilini ali təhsil ocaqlarının yuxarı kurslarında müəyyənləşdirmək olar.

Bu baxımdan xarici dil yeniyetmələrə və gənclərə elə istiqamətdə keçirilməlidir ki, onlar müasir həyatda özlərinə yol tapa bilsinlər.

Xarici dilin tədrisi məqsədli xarakter daşıyır. Yəni şagird və ya tələbəni baza biliyi ilə təmin etmək, ona müasir həyatda özünə yol tapa bilmək üçün imkan yaratmaq lazımdır. Xüsusilə də, bu mərhələnin sonunda yeniyetmələr və gənclər bacarmalıdırlar:

I. Gündəlik məişətdə iki xarici dildə şifahi və yazılı kommunikasiya;

II. Bu və ya digər istiqamətdə biliyin səviyyəsinin müstəqil şəkildə yüksəldilməsi (dinləmək, danışmaq, oxumaq, yazmaq, mədəniyyət);

III. Fərqli mədəni və ya sosial mədəni kontekstlərdə inteqrasiya.

Baza pilləsində tədrisin əsas məsələsi: yeniyetmələr və gənclərin vacib qərar qəbul etməsində və istiqamət seçməkdə (aktiv həyata qoşulmaq, peşəkar təhsil almaq, təhsili davam etdirmək) onları təlimatlandırmaqdır. Bunu təmin etmək üçün təhsil metodikasında yeniyetmələrin və gənclərin potensialının xüsusiyyətlərini üzə çıxaran strategiyalar tətbiq edilməlidir.

Yeniyetmələr və gənclər hansı peşəkar fəaliyyət sahələrini seçmələrinə baxmayaraq, xarici dil onlara həm biliklərinin zənginləşdirilməsi və eləcə də təcrübənin bölüşdürülməsi vasitəsi kimi lazım olacaqdır. Belə ki, xarici dilin tədrisinin məqsədi gəncləri elə bir biliklə təmin etməkdir ki, onlara iki və ya daha artıq xarici dildə danışmaq imkanı yarada bilsin.

Xarici dilin tədrisi zamanı gənclər xarici aləmə daxil olmağı, həyatın fərqli qaydalarını, ənənələrini aşkar etməyi, fərqli dəyərləri, mentallıqları anlamağı bacarmalıdırlar. Belə ki, uğurlu kommunikasiya yalnız nitq-vərdiş bacarıqlarından deyil, eləcə də fərqli mədəni mövzuların anlaşılması və onlara hörmətlə yanaşma bacarığından da asılıdır. Məhz bu bacarıqların və yanaşmaların formalaşmasına “mədəniyyətlərarası dialoq” istiqaməti xidmət edir. Gənclərin diqqəti xarici mədəniyyətin xüsusiyyətlərinə yönəlir. Gənclərə imkan verilir ki, öz yanaşmalarını ifadə etsinlər, öz mədəni təcrübələri və ətraf mühitə olan reaksiyalarını mükəmməl şəkildə bildirsinlər. Bu da gənclərə imkan verəcək ki, onlar özlərinə və başqalarına qarşı daha tolerant yanaşsınlar.

*Rəyçi: ADPU-nun xarici dillər kafedrasının baş müəllimi Ş.Vəliyeva*

**İstifadə edilmiş ədəbiyyat**

1. Dilçilik ensiklopediyası. 2-ci cild. Bakı, 2008.

2. Гандилова М. Методика работы над лексикой в условиях трилингвизма (английский язык).//Azərbaycan məktəbi, 2013, № 3.

3. İsmayılova A. Xarici dillərin tədrisində interaktiv metodlar.//Azərbaycan məktəbi, 2012, № 6.

**А.Исмаилова**

**О методы преподавания иностранного языка**

**Резюме**

В статье речь идёт о направлениях методики преподавания иностранного языка. Преподавание иностранного языка должно проводиться в таком направлении, чтобы подростки и молодежь обеспечивались базовыми знаниями, создавалась возможность для них приобретения собственного пути в современной жизни.

**A.Ismayilova**

**Methodology of foreign language teaching**

**Summary**

The article is about the methodology of teaching foreign languages. According to the article, the methodology of teaching foreign languages should be conducted in such a way that teenagers and the young learners are provided with basic knowledge, which gives the young learners a chance to relate to themselves, and the others around them, tolerantly.

# TƏDRİS PROSESİNDƏ ŞAGİRD İNTELLEKTİNƏ TƏSİR ETMƏK İMKANLARI

**Şəlalə Nəbiyeva**
***Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti***

***Açar sözlər:*** *Ana dili, kurikulum, intellekt, müasir təhsil, təhsilin strategiyası.*
***Ключевые слова:*** *Родной язык, Курикулум, интеллект, современное образование, Стратегия Образования.*
***Key words:*** *mother tongue, curiculum, intellect, modern education, education strategy.*

XXI yüzillik UNESCO tərəfindən elm və təhsil əsri adlandırılmışdır. Bu sahədəki uğurlar, ilk növbədə, gənclərin intellektual potensialının inkişaf etdirilməsi ilə bağlıdır. Məktəblərimizdə son vaxtlarda şagirdlərin intellektual potensialının inkişafı istiqamətində aparılan işlərin araşdırılması və tətbiqi sahəsində az iş görülməmişdir. Müasir dövrdə insanın fərdi inkişafına, bəşəriyyətin son nəticədə tərəqqisinə xidmət edən elmlə təhsilə əsaslanan inkişaf modeli dünyada qəbul edilən modeldir.

Bu baxımdan şagirdin intellektualına təsir edən amillərdən biri də folklor nümunələridir. Şagird təfəkkürünə təsir etməkdə folklor nümunələri əhəmiyyətli rol oynayır.

Bu nümunələrdə qoyulan suallar, söz yox ki, intellektə ünvanlanır. Şagird həmin suallarla təfəkkürünü məşq etdirir və o bu suallara istənilən situasiyalarda müraciət edir. Müəllim "Ana dili" dərslərində "Uşaq nəyi bilir?"sualına cavab axtarmaqdansa, "Uşaq biliklərə yiyələnərkən başını necə işlədir? Məntiqi varmı? Təfəkkürünü inkişaf etdirmək üçün ona hansı qayğını göstərmək lazımdır?" tipli suallarının ətrafında düşünməlidir.

Alimlər göstərir ki, Albert Eynşteyn məktəbdə çoxundan pis oxuyurmuş. O, hətta fizika və riyaziyyatdan 2 alırmış. Amma sonda XX əsrin ən böyük alimi oldu. Belə çıxır ki, gələcək alimin təfəkkür qabiliyyəti o zaman müəllimlərin diqqətindən yayınıb. Onlar şagirdlərini mövcud məlumatları nə qədər bilməsi ilə qiymətləndiriblər.

Hər bir uşaq istedaddır. Lakin onların hərəsində bir cəhət daha üstündür. Müəllim və ibtidai məktəblər üçün dərslik yazan alimlər insan intellektinin bütün cəhətlərini hərəkətə gətirməyi bacaran tapşırıqlar hazırlamaqda da bu məqsədi güdürlər. Əlbəttə, mövcud dərsliklərdə diqqətimizi cəlb edən belə nümunələr az deyillər.

Şagirdlərə aşılanmalıdır ki, bu tapşırığı oxuyan uşaq əvvəlcə əsərdəki cümlələri məntiqi ardıcıllıqla düzməyə səy göstərsin, həmin cəhət onun məntiqi bacarığına, başqa sözlə intellektinə təsir etmək gücündə olsun. Tapşırıqlarda şagird, həmçinin problem, problemi yaradan səbəb, problemin aradan qaldırılması yolu kimi məsələlərlə üzləşir. Bu, bir tərəfdən oyun xarakterli olduğu üçün cəlbedicidir. Digər tərəfdən problemin həll olunması yolları barədə düşünən uşağın ağlına, zəkasına təsir göstərir.

Ana dilinin öyrənilməsi prosesində məktəbəqədər yaşlı uşaqların intellekt qabiliyyətlərinin inkişaf etdirilməsi müstəqil bir problem kimi diqqəti cəlb edir. Bütün anla-

yışların əsası körpəlikdən qoyulur. Deməli, müxtəlif vərdişlərin, bacarıqların və intellektin də əsası məhz bu dövrdən başlanır.

İntellektin inkişafı uşaq anadan olduğu gündən başlayır. Bu proses valideynin, tərbiyəçinin, müəllimin nəzarəti altında olur. Apardığımız çoxsaylı sorğuların nəticəsi kimi onu göstərə bilərik ki, aşağı yaş qruplarında intellektin inkişaf etdirilməsi üçün şagirdlərdə bəzi qabiliyyətlər nəzarətdə saxlanmalıdır: diqqət, yaddaş, şüurluluq, nitq inkişafı, ətraf aləmlə tanışlıq.

İbtidai məktəbin müxtəlif siniflərində bu parametrlərə yanaşma müxtəlifdir.

Şagird intellektini inkişaf etdirmək üçün müəllim uşaqlar üçün yaranan incəsənət nümunələrinin də köməyindən istifadə etməlidir. Məsələn, “Cücələrim” mahnısının dünya uşaqlarının dilində yayılmasının əsas sirri bu nəğmədəki “C” səslərinin dəfələrlə təkrar olunmasıdır. Uşaq “cip, cip, cip” deyərkən cücələrin səsini təkrar etməklə ritmik bir musiqini eşidir. Həmin musiqi bəstəkar musiqisinin içində yaşayan poeziyanın ritmidir.

Yanıltmac xarakterli şeirlərin uşaqlar tərəfindən maraqla oxunması, səslərin yaratdığı ritmik alletrasiyadadır. Uşaq bağçalarında sadə sözlərdən ibarət olan yanıltmaclardan və bu tipli şeir parçalarından ibarət yarışlar keçirilməsi olduqca əhəmiyyətlidir. Belə əsərlərdə bəzən bir, bəzən də bir neçə səsin müəyyən qaydada düzülməsi qanunu var. Uşaq həmin şeirləri deyərkən diqqətcil olur ki, səslərin yeri səhv düşməsin, məna pozulmasın. Bu isə özlüyündə düşüncənin, diqqətin əsasını qoyur.

Uşaq intellektinin möhkəm bünövrəsi üçün balacanın ilkin inkişaf dövründə müstəqil düşüncəyə malik olmasının qayğısına qalmaq lazım gəlir. Açıq Cəmiyyət İnstitutunun elmi əməkdaşı Liz Loran Avropalı təhsil işçiləri ilə müzakirələr zamanı demişdir: “Çox vacibdir ki, uşaqlar öz inkişafları dövründə fərdi azadlığı hiss etsinlər. Bütün uşaqlar müstəqil nəticə çıxarmalı və müstəqil qərarlar qəbul etməyi bacarmalıdırlar.”

Müstəqil düşüncəyə malik olmaq üçün isə intellektin möhkəm bünövrəyə əsaslanması vacibdir. Uşaqların ibtidai məktəbə keçməyə hazır olduqlarına əmin olmaq məqsədi ilə böyükyaşlı və inkişaf səviyyəsi yüksək olan qruplarda ana dili ilə bağlı oyunlar tətbiq etmək məqsədəuyğundur. Şərti olaraq “söz oyunları” adlanan məşğələlərdə hərflərdən sözlər düzəltmək verilir. Belə sözlər daha çox göz qabağında olan əşyalara aid ola bilər. Belə sözlər həmçinin bağça yoldaşları, valideynlərinin adları da ola bilər. Məşğələni elə təşkil etmək lazımdır ki, oyun xarakteri daşısın. Məşhur nağıl qəhrəmanlarının adlarını, onların əsas xarakterik xüsusiyyətlərini əks etdirən sözləri də yazmaq maraqlı olar.

“Beşyaşlıların təfəkkür xüsusiyyətləri olduqca mürəkkəbdir. Onlar bəzən çətin tapşırıqları müvəffəqiyyətlə həll etdikləri halda, sadə hərəkətlərin icrasına tərəddüdlə yanaşırlar. Bu, onların əqli imkanlarının mütəhərrikliyi, situativliyi, fərdiliyi ilə izah olunur. Beşyaşlıların tədqiqedici fəaliyyəti də bir sıra xüsusiyyətləri ilə seçilir.

4-6 yaş mərhələsində onlar təsviretmə fəaliyyəti zamanı heç bir məna kəsb etməyən, qarışıq, məntiqsiz, əlaqəsiz, anlaşılmaz, bir sözlə, cızma-qara təsiri bağışlayan əl işlərindən sadə məzmunlu, süjetli təsvirlər yaratmağa qədər inkişaf edirlər” (3, səh.146-147).

Uşaq bağçalarında riyazi vərdişlərə marağı nəzərə alaraq hərflərin boyunu, enini (məsələn, böyük U, balaca u, və ya “M” “İ”dən enlidir, yaxud “I” “P”dan arıqdır) hərflərin müqayisəsi adlanan bu oyunda həm də bənzətmə qabiliyyətləri də inkişaf edə bilər. Məsələn, “M” hərfi qurbağaya, “S” ilana, “O” təkərə və s. bənzədilməklə uşaqda ətraf aləmə nəzər salarkən gördükləri əşyaların fiqurlarını yadda saxlamağa kömək edir.

Bağçalar üzərində müxtəlif hərflər və xalq nağıllarının şəkilləri olan kubiklərlə

zəngin olmalıdır. Tərbiyəçi saitlərin haqqında ilkin təsəvvür yaratmaqdan ötrü müxtəlif heyvanların çıxardıqları səslərdən ibarət oyunlar da təşkil edə bilər. Məsələn, canavar "U u u u", ceyran "Üüüü" deyə səs çıxarır. Bir səsdən ibarət olan bu çığırtıları yuxarı yaş qruplarında daha mürəkkəbləri ilə əvəz etmək olar. Əlbəttə, bu məşğələlər sadədən mürəkkəbə keçməklə ardıcıl aparılmalıdır. Iki səsli məşğələlər: camışın "mooo", pişiyin "myau", çətin məşğələlər; ulağın "ia ia", lap çətin məşğələlər; bildirçinin "bıpbılıt, bıpbılıt" səslərinin yamsılaması ola bilər. Məşğələlər prosesində saitlərin xüsusi bir avazla uzadılması vərdişi aşılanmalıdır. Bu vərdiş məktəbdə sait səslərin asanlıqla qavranılmasına, sözlərin sətirdən-sətrə keçirilməsini öyrənməsinə xidmət göstərəcəkdir.

Samit səslərini də oyun prosesində uşaqlara anlatmaq mümkündür. Meşə, dəniz və s səslərin təqlidi yolu ilə "Xoşşş", "Xışşş", Traktor "Trrr", Saat "Din-dan", Dalğa səsi "Dam-dum" kimi səslərin təqlidi ilə oyunlar təşkil etmək samitlərin anlaşılmasına xidmət göstərə bilər.

Oyun prosesində öz hərəkətləri ilə hərflərin xarici görünüşünü göstərmək üçün uşaqlara meydan vermək zəruridir. Onlar bu yolla həm hərfləri yadda saxlayır, həm də fiziki imkanlarını inkişaf etdirirlər. Bu prosesdə ehtiyacı olanlara köməklik göstərmək lazımdır. Qoy hər bir uşaq nümayiş etdirmək istədiyi hərfi müəllimin köməkliyi ilə göstərsin. Bu onun sonrakı inkişafına müsbət təsir göstərəcəkdir.

Uşaqlarda intellekt qabiliyyətlərinin əsasını bağçaların məktəbə hazırlıq qruplarından və ya 5-6 yaşlarından başlamaq lazımdır. Hamıya məlumdur ki, XXI əsr Azərbaycan təhsil sistemi üçün də kompyuter əsridir. Elmin müasir inkişafı göstərir ki, az vaxtdan sonra "şüurlu" kompyuterlər meydana gələcəkdir. Artıq onların ilkin elementləri Amerika elmində görünməkdədir. İnsanın görəcəyi bütün işlərin hamısını yüksək səviyyədə yerinə yetirməyi bacaran robotların istehsalata buraxılması göstərir ki, elmin bu nailiyyətləri tezliklə bütün dünyanı bürüyəcəkdir. Deməli, bu gün həmin robotlarla və komyuterlərlə rəftar edə biləcək insanların formalaşdırılması qarşımızda dayanan əsas vəzifələrdən biridir. Həmin vəzifələri yerinə yetirmək üçün uşaq bağçalarının son qruplarından və ibtidai siniflərindən başlamaq zəruriyyəti meydana çıxmışdır. Bu isə şagirdlərin müstəqil təfəkkürlərinin inkişaf etdirilməsi vəzifəsidir və əsrin aktual problemlərindən biridir.

Təlim işi üçün təfəkkür müstəqilliyi çox böyük əhəmiyyət kəsb edir. Şagirdlərdə müstəqil təfəkkür qabiliyyətlərinin inkişaf etdirilməsinə uşaqların çox erkən yaşlarından başlamaq lazımdır. Dünya alimləri dəfələrlə sübut etmişlər ki, uşaqlara bilikləri hazır şəkildə vermək kifayət etmir. Onların bilik öyrənmək bacarığını inkişaf etdirmək lazımdır. Müəllimin köməyi olmadan şagird yalnız kitabdan deyil, həm də onu əhatə edən mühitdən faydalı biliklər almaq bacarığına yiyələnməlidir. Yalnız belə olduqda bütün ömrü boyu öyrənməyə cəhd edər. Pedaqoqlar göstərir ki, uşaqların özləri müstəqil surətdə çalışmalı, düşünməli və tapmalıdır. Bu prosesdə müəllim ona yalnız rəhbərlik etməlidir. Təlim prosesində şagirdlər yeni bilik və vərdişlər əldə edir. Bu bacarıqların şüurlu surətdə dərk edilməsində təfəkkür müstəqilliyi mühüm rol oynayır. Səbail rayonundakı 134 nömrəli tam orta məktəbin müəllimi Xavər Əlizadə "Düşün, tap" adlı kitabında təfəkkür müstəqilliyinin aşağıdakı xüsusiyyətlərini izah edir.

a) başqasının köməyi olmadan qarşıya sual, problem, məsələ qoymasında;

b) qarşıya qoyduğu məqsədə çatmaq, suala cavab vermək, məsələ və ya problemi həll etmək üçün kənar göstəriş olmadan, vasitə, cavab, yol tapmasında və müəyyən nəticəyə gəlməsində;

c) bu və ya digər cisim və hadisəni törədən səbəblər haqqında müəyyən mülahizələr

yürütməsində;

ç) əldə etdiyi bilikləri, mənimsəmiş olduğu qanun və qaydaları başqa idrak obyektlərinə tətbiq etməsində ifadə olunur" (2, səh.5).

Şagirdlərin fənn üzrə bilik və bacarıqlara yiyələnməsində maraqlar yaradılmasının mühüm əhəmiyyəti vardır. Hələ bağça yaşlarında ikən uşaqların ana dilinə marağını artırmaq üçün müxtəlif oyunlardan və idraki əhəmiyyətə malik olan tapmacalardan istifadə etmək zəruridir. Uşaqlar dili öyrənmək üçün əvvəl təbiəti öyrənməlidir. Təbiətdə müxtəlif əşyaların adlarını, müxtəlif rənglərin ifadə etdiyi mənalarını başa düşməlidirlər. Bu sahədə son illərdə çıxan bir sıra kitablar xüsusi əhəmiyyət kəsb edir. Məsələn, 5-7 yaşlı uşaqlar üçün "şəkilli bilməcələr" (tərtibçisi Ü.Gülməmmədova) adlı kitabça maraqlıdır. Bu kitabçada həmin yaşda olan uşaqlar üçün şəkillər vasitəsilə rəngləmələr, labirintlər, fərqləndirmələr, birləşdirmələr və s. kimi uşaq idrakına təsir edəcək şəkillər, rebuslar verilmişdir. Kitabçada "Qırıq xətləri birləşdirərək 1 rəqəminin yazılması", "Hörümçəyə yuvasına gedib çatmağa kömək et", daha az fiqur olan dəstləri rənglə və s kimi maraqlı, uşaqları düşündürən bilməcələr verilmişdir. Kitabın əvvəlində müəllif qeyd edir ki, bu kitabça bizim balaca balalara töhfəmizdir. Çalışdıq, şəkillərin dili ilə onlar üçün riyaziyyat aləminə, məntiq dünyasına bir cığır açaq. Boyaları seçməkdə onlara sərbəstlik verdik, hər bir şəkli rəngləyərkən təxəyüllərinin gücünə arxalansınlar.

Göründüyü kimi, tədris prosesində şagird intellektinə təsir etməyin yolları çoxdur və müəllimdən onlardan səmərəli istifadə etmək tələb olunur.

*Rəyçilər: Dos. P.Paşayeva və dos. K.Bəşirov.*

**İstifadə edilmiş ədəbiyyat**

1. Əlizadə Ə., Əlizadə H. Pedaqoji psixologiya. II kitab. Bakı, 2010.
2. Əlizadə X. Ibtidai siniflər üçün riyaziyyatdan əyləncəli çalışmalar. Bakı, 2009.
3. "Kurikulum" jurnalı. N4, 2008.

**Ш.Набиева**

**Возможности влияния на интеллекта ученика в процессе обучения**

**Резюме**

В статье затрагивается одна из поставленных современным педагогическим сообществом проблем – проблема влияния фольклорных образцов на интеллект ученика в учебном процессе. Автор рассказывает о роли предмета "Родной язык" в развитии мышления ученика. Для того, чтобы доказать свои мысли, автор ссылается на мысли и азербайджанских, и русских ученых. По автору, с помощью учебных образцов нового типа, можно развивать интеллектуальные способности ученика.

**Sh.Nabiyeva**

**Opportunities of affecting students' intellect while teaching**

**Summary**

In the article, the author speaks about how to affect students' intellect, during the teaching process, and of its importance. It is noted that, the skill of asking question is important, so if a student has the skill of asking special questions, rather than yes/no questions, it means the student has the ability of thinking. Interesting questions and exercises introduced in the article influence the thinking ability of students. Pictures and diagrams complete the whole thought of the article.

# MUSİQİ DƏRSİNDƏ İKT-DƏN İSTİFADƏ

**Xatirə Cananova**
***Bakı şəhəri, 208 nömrəli tam orta məktəbin ali kateqoriyalı müəllimi***

Xalqın gələcəyi olan gənc nəslin hərtərəfli inkişafı, milli adət-ənənələrə uyğun tərbiyəsi, milli və dünya incəsənətinin nümunəvi parlaq səhifələri ilə tanış olub mənimsəməsi ümumtəhsil məktəblərində tədris fənlərindən biri olan musiqidən mühüm dərəcədə asılıdır. Son illər təhsilimizdə baş verən ürəkaçan yeniliklər öz nəticəsini verməkdədir. Xüsusilə İKT-nin tətbiqi təhsilimizin keyfiyyətinə, eyni zamanda tələb olunan bacarıqlı və bilikli insanların nailiyyətlər qazanmasına təsir edir. Hal-hazırda dövrümüz təhsilin informasiyalaşdırılması dövrüdür. Bu şəraitdə yaşayıb yaradan insan həyatı boyu keyfiyyətli nəticələr əldə edir. Hazırda cəmiyyətin əsas inkişaf istiqaməti kimi kompyuterləşdirmə və informasiyalaşdırmanı qeyd etmək olar. İKT cəmiyyətimizin inkişafına, həmçinin iqtisadiyyatın bütün sahələrinə dayanmadan müsbət təsirini göstərir. İnformasiya-kommunikasiya texnologiyaları, demək olar ki, hazırda geniş vüsət alıb, istər hökumət, istərsə də qeyri-hökumət təşkilatlarında, o cümlədən məktəblərimizdə tətbiq olunur. Təhsil, elmi-mədəni sahələr, iqtisadiyyatda və s. İKT ilə geniş əhatə olunması bizə məlumdur. Artıq, demək olar ki, bütün cəmiyyətimiz üçün qəbul olunub ki, informasiya ilə vaxtında və dəqiq təmin olunmaq istəyiriksə İKT-nin nə qədər zəruri olduğunu qəbul etməliyik. Bu amilləri biz sinifdə də əsas tutmalıyıq.

Dövlətimizin xüsusi qayğısı nəticəsində bir neçə il öncə məktəblərin kompyuterləşdirilməsi ilə əlaqədar proqramlar təsdiq edilmişdir. Həmin proqramların müsbət cəhətləri bu gün məktəblərimizdə öz əksini tapır. Dərslərimizin fəal təlim metodları ilə qurulması, şagirdlərin tədqiqatçılıq aparması çox uğurlu haldır.

Kompyuterli musiqi dərslərini həyata keçirmək üçün müəllim-şagird, şagird-şagird formasında elə ardıcıl və uyğun şəkildə iş təşkil olunmalıdır ki, müəllim qarşıya qoyduğu məqsədə nail ola bilsin. Bütün bunlar üçün isə ilk növbədə uyğun mühitin yaradılması tələb olunur. Bu mühitin yaradılması üçün bir sıra vacib şərtlər var.

1. Müəllim müvafiq bilik və bacarıqlara malik yaradıcı olmalıdır.

2. İKT ilə təchiz olunmuş kabinet olmalıdır.

3. Şagirdlərin texnologiyalardan istifadə bacarığı olmalıdır.

4. Eyni zamanda müəllimin də İKT-dən istifadə bacarığının olması vacibdir.

Bütün bunlar təşkil olunduqdan sonra müasir tələblərə cavab verən (innovativ) dərsi qurmaq mümkündür. Onu da qeyd edirəm ki, musiqi dərsini İKT əsasında qurmaq həm maraqlı, həm də səmərəlidir. Belə ki, şagirdlər belə dərslərə həvəslə hazırlaşır, həm də həmin mövzular yaddaşda yaxşı qalır. Çünki belə dərslər audio-vizual şəkildə çatdırılır. Təcrübəmdən bilirəm ki, İKT ilə qurulan dərsin hazırlanmasında ən zəif oxuyan şagird belə fəal iştirak edir. Adətən kompyuterdən, fotoaparatdan, video və DVD-dən, internetdən müəyyən qədər dəcəl, dərsə məsuliyyəti olmayan şagirdlər daha

yaxşı istifadə edir. Belə şagirdlərlə daha savadlı şagirdlərin işi birləşəndə mükəmməl bir iş yaranır.

İKT-nin təlim prosesində musiqi dərsinin əyaniliyi qat-qat artıb. Musiqi dərslərində istifadə üçün zəngin resurslar vardır. Bu resurslar dərsdə istənilən musiqi nömrəsinə qulaq asmağı, istənilən ifaçı, bəstəkar haqqında kifayət qədər məlumat verməyi asanlaşdırır. Ona görə də mən dərslərimdə musiqiyə dair resurslardan geniş istifadə edirəm. Son vaxtlar isə dərslərimi təqdimatlar üzərində qurmağa üstünlük verirəm. Belə təqdimatlar üçün lazım olan slaydları keçilən mövzu üzrə həm özüm hazırlayır, həm də şagirdlərə hazırlatdırıram. Təqdimat dərslərində mövzular şagirdlər tərəfindən daha asan qavranılır. Ümumiyyətlə, qeyd edim ki, Milli Kurikulumun tətbiqindən sonra musiqi dərslərinə diqqət artıb. Yeni dərsliklər, iş dəftərləri çap olunub, müəllimlər üçün maraqlı treninqlər təşkil edilir. Bütün bunlar biz müəllimlərə dərsi daha dolğun, daha rəngarəng və maraqlı qurmağa kömək edir.

Məktəbimizdə hər cür texniki avadanlıqlar, o cümlədən F-no, sintizator və digər Azərbaycan xalq çalğı alətləri ilə təchiz olunmuş geniş musiqi otağı vardır. Otaqda yaxşı tərtibat işi aparılmış, divardan Azərbaycan və xarici bəstəkarların şəkilləri asılmışdır. Qeyd etmək istərdim ki, məktəbdə musiqi ilə bağlı sinifdən kənar tədbirlərin keçirilməsinə də xüsusi diqqət yetirirəm. Tez-tez müxtəlif tamaşalar, konsertlər təşkil edirəm. Bütün bunlar şagirdlərin musiqi dərslərində aldıqları bilik, bacarıq və vərdişlərini daha da genişləndirir. Müasir dərs və onun təşkili müəllimin metodik yaradıcılığından çox asılıdır. Müəllimlik bir sənət kimi hər bir dərsin yeni əsər yazmaq səviyyəsində qurulmasını tələb edir. Ənənəvi təlimdən yeni fəal təlimə keçid müəllimdən öz üzərində ciddi işləməyi, hər bir dərsə yeni yazılacaq əsərin yazılmasına qədər hazırlaşmağı vacib sayır. Təhsilin məzmunu, təşkili və qiymətləndirilməsi ilə bağlı bütün məsələləri özündə əks etdirən konseptual sənəd kimi kurikulum şəxsiyyətyönümlülük, şagirdyönümlülük prinsiplərinə əsaslanaraq şagirdlərdə yaradıcı təfəkkürün və bacarıqlarının inkişafına böyük diqqət yetirir.

Musiqi dərsində kurikulumun tələblərinə ciddi əməl edilməli, məzmun standartları, təlim məqsədləri, dərsin forma və üsulları düzgün müəyyənləşdirilməlidir. Biz müəllimlər təlimin təşkilinə verilən tələbləri əsas tutaraq sonda nəticəyönümlü təlimə nail ola bilərik.

Beləliklə, kompyuter təlim vasitələrindən biri olmaqla mahiyyətcə müəllim və şagirdlərin çox yaxın köməkçisi rolunu oynayır. O müəllim üçün avtomatlaşdırılmış sinif jurnalıdır, aparılan sorğunun nəticəsini işləyən vasitədir, istənilən mövzuya hazırlaşmaq üçün köməkçi vasitədir.

Qeyd etməliyəm ki, İKT üzrə kadrların hazırlanması üçün Təhsil Nazirliyi və İnteraktiv Təlim Texnologiyası “Smart Tecnoloqiyes” xətti üzrə “MİMİO” kursundan keçməyim bu işdə çox kömək edir.

Dərslərimizin fəal təlim metodları ilə qurulması, şagirdlərin tədqiqatçılıq aparması çox uğurlu haldır. Belə qənaətə gəlmək olar ki, müasir musiqi dərsi və onun təşkilinin səmərəliliyi müəllimin yaradıcılığından çox asılıdır.

Beləliklə, İKT vasitəsilə musiqi dərslərinin qurulması gənc nəsilin bilikli, savadlı olmasına, eyni zamanda vətənpərvərlik ruhunda tərbiyə olunmasına imkan yaradır. Bu da gənclərin gələcəkdə cəmiyyətdə özlərinin yerini tutmaları, eyni zamanda ölkəmizin ümumi inkişafına öz töhfəsini vermələri üçün zəmin yaradır.

*Rəyçi: prof. V.Xəlilov*

***Pedaqoji mülahizələr***

# ПЕДАГОГИЧЕСКАЯ СИМФОНИЯ Ш.А. АМОНАШВИЛИ

**Рза Халилов**
***Научный консультант Институт Проблем Образования Азербайджанской Республики, доктор философии***

***Açar sözlər:*** *humanist pedaqogika, humanistləşdirmə, əxlaq, etika, fəlsəfə, mənəviyyat, təhsil, tərbiyə.*
***Ключевые слова:*** *гуманная педагогика, гуманизация, мораль, нравственность, философия, духовность, образование, воспитание.*
***Key words:*** *humanist pedagogy, humanism, morality, ethics, philosophy, spirituality, education, upbringing.*

Сегодня, когда одной из главных задач является развитие личности, способной адаптироваться к быстро меняющемуся социуму сильно возрастает роль гуманного учителя, который взращивает в учениках духовность, благородство, великодушие. Именно с таким учителем произошла незабываемая встреча на 13-х Международных Педагогических Чтениях, проходивших в Тбилиси 21-23 марта сего года. Тринадцатые Международные Педагогические Чтения по Гуманной педагогике на тему "Учитель" проходили в Тбилисском государственном университете имени Иване Джавахишвили. Чтения проходили по предложению и под патронажем президента Грузии Георгия Парменовича Маргвелашвили. Они собрали более 700 участников из 18 стран: России, Грузии, Латвии, Литвы, Эстонии, Украины, Белоруссии, Азербайджана, Казахстана, Финляндии и др.

С приветственным словом к участникам Чтений выступили: президент Грузии Г.П. Маргвелашвили, министр образования и науки Грузии Тамар Саникидзе, поэтесса Марианна Озолиня, Рыцарь гуманной Педагогики (Зига, Латвия), В.Г. Александрова, доктор педагогических наук, профессор, главный научный сотрудник лаборатории гуманной педагогики Московского городского педагогического университета, Владимир Папава, доктор наук, профессор, ректор Тбилисского Государственного Университета им. Иване Джавахишвили, В.В. Рябов, президент ГОУ ВПО МГПУ, профессор, доктор исторических наук, член-корреспондент РАО, К.Т.Султанов, президент Дагестанского.

Республиканского центра гуманной педагогики (Дербент, Дагестан) и другие. Очень впечатляющим было открытие педагогических Чтений председателем Шалвой Александровичем Амонашвили, Почётным президентом МЦГП, академиком Российской Академии образования, дважды лауреатом премии Правительства РФ в области образования, почётным доктором Софийского университета имени Св. Климента Охридского, заслуженным профессором Московского городского педагогического университета. Имя

Шалвы Александровича Амонашвили - известного ученого, профессора, доктора психологии и педагогики знают далеко за пределами бывшего Советского Союза. В 60 - 70-х годах он возглавил массовый эксперимент в школах Грузии, который получил широкий отклик во всем мире как новое научное направление гуманно - личностного подхода к детям в образовательном процессе. В то время были написаны его книги "Здравствуйте, дети!", "Как живете, дети?", "Единство цели", объединенные позже в трилогию под названием "Педагогическая симфония". В настоящий момент он работает над изданием Антологии гуманной педагогики (вышло более 40 томов). В свои 83 года много ездит, проводит семинары по собственной системе "Школа жизни" во многих городах России, странах СНГ, в прибалтийских республиках, Болгарии, Чехии и Словакии. Только в России по этой системе действует 140 лабораторий.

Международная общественная организация "Международный Центр Гуманной Педагогики" создана в результате свободного волеизъявления граждан, объединившихся на основе общих интересов, независимо от их национальности, вероисповедания и социального положения, стремящихся проводить в жизнь идеи и принципы гуманно-личностного подхода к образовательному процессу. Деятельность Центра направлена на реализацию и широкую пропаганду разработок академика Ш. Амонашвили по гуманной педагогике, авторские основы которой базируются на творческом наследстве классиков мировой педагогики Г. Сковороды, Г. Пирогова, А. Макаренко, В. Сухомлинского, Л. Толстого, К. Ушинского, Я. Коменского, Д. Узнадзе, М. Монтессори, С. Гессена, И. Песталоцци и многих других светочей человечества.

Вопросы, связанные с новой концепцией образования, стали особенно актуальными в период глубокого кризиса, переживаемого обществом в последние десятилетия во всех областях жизни, когда вопрос воспитания будущего поколения стал одним из важнейших для дальнейшего развития и существования страны. Сегодня родители не знают, как воспитывать своих детей, а учителя нередко становятся в тупик, переставая понимать, чему и как можно учить школьников, когда жизнь успешно учит их совершенно иным и далеко не лучшим ценностям. Вместе с тем, многие и многие учителя хотели бы гуманизировать образование, перейти к более демократичным формам общения с детьми, внести человеческое измерение в педагогический процесс.

В связи с методологическим новаторством системы образования, хочется обратиться к гуманной педагогике, образовательная концепция которой построена на гармоничном и равноправном союзе и содружестве Учителя и Ученика, где Истина, Мудрость и Красота - есть естественное состояние души и сердца опытного наставника, и открытого для восприятия ребенка, потому что союз учителя и ученика – это присутствие духа сотворчества в познании универсальных законов бытия.

Ш. Амонашвили напоминает учителям, что процесс образования должен полностью быть пропитан возвышенными и утонченными образами, которые питают душу и сердце ребенка и ведут его к раскрытию и проявлению заключенного в нем самом собственного духовного образа. Образование не есть лепка человека с определенными качествами без участия самого человека, идущего по пути развития, взросления и свободы.

Образование есть процесс питания души и сердца ребенка всеми лучшими, (высшими, возвышающими, одухотворяющими) плодами человеческой культуры".Что же такое "гуманная педагогика?"

Гуманное педагогическое мышление таит в себе возможность для постоянного обновления жизни школы, для многогранной творческой деятельности учителя и учительских коллективов. Своими основными постулатами – верой в возможности ребенка, раскрытие его самобытной природы, уважение и утверждение его личности, направленность на служение добру и справедливости – гуманное педагогическое мышление зажигает искры для рождения новых педагогических систем в зависимости от конкретных исторических, социальных, национальных и экономических условий, способствует возникновению личного творческого педагогического опыта, «своих методов и форм."

Система гуманно-личностного подхода вдохновляет учителя на создание такого образовательного процесса, в котором Ребёнок в самой жизни научается менять, улучшать, совершенствовать условия этой жизни, повышать её качество, а не приспосабливаться к уже сложившимся условиям. Источником такого стремления должна стать высокая духовность.

О смысле и значении гуманной педагогики Ш.А. Амонашвили пишет: "Гуманная педагогическая мысль, испокон веков сопровождая человечество, напоминает о непреложности воспитания Души и Сердца, и через них раскрытия личности человека, его талантов, интеллекта, его неповторимости. Испокон веков призывает она к служению планетарной и космической эволюции, испокон веков ищет она свой момент истины. Для многих величайших мыслителей человечества, для многих учителей прошлого и сегодняшнего дня гуманное педагогическое мышление стало основой их мировоззрения и творчества. Вот почему Эпоха Сердца и Духовности, Взаимности и Любви, в которую вступает человечество, требует глубокого обновления всего образовательного процесса, основой которого является гуманное педагогическое мышление.

Изначальный смысл слова Воспитание, по всей вероятности, заключен в синкретности его составных. В качестве составных выступают "ось" и "питание": в-ос-питание; то есть "воспитание" объединяет в себе целостную идею о питании оси. О какой оси идет речь? Если исходить из того, что школа есть скалистая лестница для восхождения (опять: в-ос-хождение) души и духовности человека, то самое фундаментальное понятие педагогики – Воспитание – должно означать: питание духовной оси, питании души. То есть в школе через питание оси происходит восхождение, становление того самого главного в человеке, что и составляет всю суть его личности – души и духовности. Воспитание, питание духовной оси человека, находящегося на пути становления, должно опережать знания, оно как бы заготавливает ферменты очеловечивания и облагораживания знаний и тем самым просветляет ум.

Как можно осмыслить понятие Образование? Воспитание, как процесс питания духовной оси, требует своих питательных ферментов. Естественно, для питания духовной оси будут нужны не обычные, скажем, биологические вещества, а именно духовные ферменты. Такими могут стать образы любви, красоты, устремленности, доброты, преданности, творчества, мужества, мастерства, созидания, сочувствия, сорадости, сопере-

живания, благоразумия, нравственности; знания, озаренные сердцем и духом; стремление к благу с помощью знаний, стремление к углублению в знаниях; знания в виде высших законов природы, Вселенной, веществ, Гармонии; высшие творения разных искусств; образы человеческого общения; образы добромыслия, ясномыслия, благомыслия, ответственности за свои мысли; образы словесности и речи; образы расширенного сознания, образы целенаправленной деятельности; образы, рожденные в процессе саморазвития, самопознания, самосовершенствования; образы материального и духовного плана; образы, рожденные мировоззрением и верой, а носителем этих ценностей является опять-таки учитель; общаясь с детьми, он постоянно излучает высшие духовно-нравственные и познавательные образы.

Гуманно-личностный образовательный процесс принимает ребенка таким, какой он есть, напитывая созидательной, творческой любовью; ибо каждый предмет познается в полной мере только при любви, каждая трудность побеждается силой любви. Тем самым образовательный процесс создает лучшие условия для выявления его будущей личности, напутствуя на поиск своей миссии.

Гуманно-личностный образовательный процесс строится на целостности природной составляющей ребенка. С момента зачатия и сразу после рождения Природа в течении длительного времени продолжает свое становление в ребенке, очеловечивает и окультуривает себя в нем. Ребенок развивается по законам Природы, по ее календарному плану. Природа движется по пути обретения своей единственности и неповторимости в лице каждого данного ребенка, по пути обретения заданной ему формы и наращивания заданных ему ресурсов.

Авторитарность нынешней педагогики

Известный американский психолог Гарднер Мэрфи красноречиво выразил значимость изучения личности для нашей жизни: “Недостаток знания о людях – это не пустая, а главная угроза жизни”. Сегодня, как говорит Ш.А.Амонашвили, в учебных заведениях, да и не только, повсюду царит авторитарное педагогика. В истории энциклопедий впервые понятие «авторитарная педагогика” отразилось в “Новой российской энциклопедии” (т.II, М.2005). В ней читаем: “Авторитарная педагогика – педагогическая система, согласно которой образовательный и воспитательный процессы… строятся на беспрекословном подчинении учащихся авторитету учителя, воспитателя, родителей. Подавляя естественное стремление детей к самостоятельности, А.п. ограничивает их инициативу, препятствует развитию индивидуальных качеств личности и способности во взрослой жизни принимать ответственные решения… А.п. противостоят концепции естественного воспитания, свободного воспитания, демократической педагогики, педагогики сотрудничества и др.”.

Примечательно, что для авторитарно направленной педагогики одна из важнейших проблем – это дисциплина. Ученик обязан учиться, он обязан слушаться – вот предварительное условие такого обучения. Поэтому педагогический процесс уподоблялся диктанту. Детям диктуется не только текст для проверки знания правил грамматики, но и вся жизнь. Им диктуются знания, нравственность, оценки действительности, убеждения. Отчетность школы с помощью отметок, то есть цифровыми показателями так называемой академической успеваемости учеников, стала главной мерой при определении качества всей работы.

